***Azərbaycan Milli Elmlər Akademiyası Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 22 yanvar 2014-cü il tarixli 1 №-li iclasının qərarı ilə nəşr olunur.***

***Redaktorlar*:** **Nəsib GÖYÜŞOV**
*filologiya üzrə elmlər doktoru*

**Raqub KƏRİMOV**
*filologiya üzrə fəlsəfə doktoru*

**Möhsün Nağısoylu.** A.Bakıxanovun "Riyazül-qüds" əsəri. Bakı: "Elm və təhsil", 2014, 174 səh.

*Təkmilləşdirilmiş, əlavələr edilmiş ikinci nəşr.*

Kitab görkəmli maarifçi şair və yazıçı Abbasqulu ağa Bakıxanovun "Riyazül-qüds" əsərinə həsr olunmuş ilk müstəqil elmi araşdırmadır. Monoqrafiyada "Riyazül-qüds" klassik-sərbəst tərcümə nümunəsi kimi araşdırılır, əsərin dil-üslub və bədii xüsusiyyətləri tədqiq olunur.

**Abbasqulu Ağa Bakıxanovun 220 illik yubileyinin keçirilməsi haqqında**

## Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, milli ictimai fikrin, elmin və mədəniyyətin inkişafına dəyərli töhfələr vermiş Abbasqulu Ağa Bakıxanovun 220 illik yubileyinin keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram**:

1. Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi Azərbaycan Milli Elmlər Akademiyası və Azərbaycan Respublikasının Təhsil Nazirliyi ilə birlikdə, Azərbaycan Yazıçılar Birliyinin təkliflərini nəzərə almaqla, Abbasqulu Ağa Bakıxanovun 220 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev,**
**Azərbaycan Respublikasının Prezidenti**

**Bakı şəhəri, 12 fevral 2014-cü il.**

KİTABIN İÇİNDƏKİLƏR

## ÖN SÖZ

Hər hansı bir söz sənətkarının həyat və yaradıcılığı, dünyagörüşü haqqında tam və dolğun, düzgün və dəqiq nəticələr əldə etmək, qəti fikir söyləmək üçün onun qələmindən çıxan bütün əsərlər hərtərəfli şəkildə öyrənilməli, geniş təhlil süzgəcindən keçirilməlidir. Bu məsələdə həmin şair və yazıçının yaşadığı zaman və məkanın bütün incəlikləri, tələb və istəkləri göz önünə alınmalı, ən başlıcası isə obyektivlik, qərəzsizlik əsas götürülməlidir. Məlum olduğu kimi, Azərbaycan ədəbiyyatşünaslığında bu məsələdə son illərədək həm açıq-aşkar bir boşluq özünü göstərmiş, həm də dövrün məlum qadağa və əngəlləri üzündən müəyyən dərəcədə birtərəfliyə, qərəzçiliyə yol verilmişdir. Belə ki, ayrı-ayrı klassik şair və yazıçıların bəzi əsərləri, xüsusilə də dini mövzuda qələmə aldıqları kitabları dövrün ideoloji baxışları üzündən diqqətdən kənarda qalmış, daha doğrusu, nə araşdırılmış, nə də nəşr edilmişdir. Dahi söz ustadı Məhəmməd Füzulinin qüdrətli qələmindən çıxmış «Hədiqətüs-süəda» («Xoşbəxtlər bağı») əsərinin taleyi buna nümunə ola bilər. Məlum olduğu kimi, bu böyük söz sənətkarının sözügedən əsəri Azərbaycanda yalnız ölkəmiz müstəqillik qazanandan sonra, yəni 1993-cü ildə ilk dəfə tam şəkildə nəşr edilmiş (**29**), son illərdə isə haqqında iki monoqrafiya (**47**; **54**) yazılmışdır. XIX əsrin görkəmli Azərbaycan maarifçi yazıçısı, şairi və alimi, ensiklopedik zəka sahibi Abbasqulu ağa Bakıxanovun «Riyazül-qüds» («Cənnət bağları») əsərinə də indiyədək bu mövqedən yanaşılmış və o məhz sırf dini məzmun daşıdığına görə lazımı səviyyədə

araşdırılmamışdır və hələ də nəşrini gözləməkdədir.

«Riyazül-qüds» A.Bakıxanovun ana dilində qələmə aldığı ilk irihəcmli bədii əsərlərindən biridir. Əsasən, nəsrlə qələmə alınan əsərdə ərəb, fars və türk dillərində yazılmış nəzm parçaları da verilmişdir ki, onların da çoxu A.Bakıxanovun öz qələminin məhsulu, ilk qələm təcrübələridir. «Riyazül-qüds» ilk növbədə yüksək bədii-sənətkarlıq xüsusiyyətləri ilə seçilən bir əsər təsirini bağışlayır ki, bunu da şərtləndirən başlıca və əsas amillərdən biri onun nəsr hissəsinin klassik ənənəyə uyğun olaraq, qafiyəli nəsrlə - səclə qələmə alınmasıdır. Qafiyəli nəsrin müxtəlif növlərinə dərindən bələd olan A.Bakıxanov bu sahədə yüksək sənətkarlıq nümayiş etdirmişdir. Azərbaycan ədəbiyyatşünaslığında isə klassik bədii nəsrin poetik imkanları, bədii keyfiyyətləri, onun əsas səciyyəvi xüsusiyyətləri, o sıradan səclə bağlı sənətkarlıq məsələləri, onun incəlikləri nisbətən az öyrənilmişdir. Məhz bunu nəzərə alaraq, biz «Riyazül-qüds» haqqındakı bu ilk kitabda həmin məsələlərin işıqlandırılmasına xüsusi diqqət yetirməyi məqsədəuyğun saydıq.

«Riyazül-qüds» Yaxın və Orta Şərq xalqları ədəbiyyatında geniş yayılmış Kərbəla vaqiəsi mövzusunda qələmə alınmışdır. Məlum olduğu kimi, imam Hüseynin (ə.) Kərbəlada şəhid olmasına həsr olunan əsərlər müsəlman Şərqində bir ümumi ad altında - «məqtəl» kimi tanınır və «Riyazül-qüds» də XIX əsr Azərbaycan ədəbiyyatında yaranan ən uğurlu məqtəl kitablarından biri hesab edilə bilər. Azərbaycan ədəbiyyaşünaslığında isə şəhidlik mövzusunda qələmə alınmış əsərlərin ayrıca tədqiqinə yalnız son dövrlərdə başlanılmışdır. Bunu nəzərə alaraq, monoqrafiyada bu sahədə mövcud olan boşluğu müəyyən dərəcədə doldurmağa da cəhd göstərilmişdir.

«Riyazül-qüds»ün mövcud olan yeganə əlyazmasında A.Bakıxanovun özünün açıq-aşkar şəkildə bu əsərini tərcümə adlandırmasına baxmayaraq, indiyədək bu mühüm və

əhəmiyyətli fakta ya əhəmiyyət verilməmiş, ya da onun üstündən nədənsə yan keçilmişdir. Kitabda ilk dəfə olaraq bu məsələyə də aydınlıq gətirilir: «Riyazül-qüds»lə onun farsca orijinalı olan Məclisinin «Cəlaül-üyun» («Gözlərin parlaqlığı») əsərlərinin mətnləri müqayisəli şəkildə araşdırılır və A.Bakıxanovun bu əsərinin klassik tərcümə nümunəsi olması tutarlı dəlillərlə və elmi şəkildə əsaslandırılır.

«Riyazül-qüds» haqqında Azərbaycan ədəbiyyatşünaslığında indiyədək verilən qısa məlumatlarda əsərdə bir sıra kitabların, xüsusilə də Məclisinin adı çəkilən əsərinin və Məhəmməd Füzulinin «Hədiqətüs-süəda»sının təsiri olması xüsusi olaraq vurğulanır, ayrıca qeyd olunur. Bununla belə, bu təsirin konkret şəkildə mahiyyəti və xüsusiyyəti, təfərrüatları və incəlikləri, eləcə də onun nə səviyyədə, hansı dərəcədə olması, hansı səciyyə daşıması və s. kimi məsələlər indiyədək öyrənilməmiş, ayrıca olaraq işıqlandırılmamışdır. Kitabda bu məsələ də xüsusi olaraq araşdırılır və sözügedən əsərlər arasındakı səsləşmə məqamları, oxşar cəhətlər müəyyən edilir.

Nəhayət, kitabın ayrıca bir bölməsində «Riyazül-qüds»ün dil-üslub və bədii xüsusiyyətləri yığcam şəkildə araşdırılır.

A.Bakıxanovun həyatı və «Riyazül-qüds» istisna olmaqla, bədii yaradıcılığı mövcud ədəbiyyatda indiyədək kifayət qədər araşdırıldığı üçün (**12**, 102-136; **37**; 64; **76**, 3-8; **77**) biz tədqiqatımızda bu məsələlər üzərində, ümumiyyətlə, dayanmağı məqsədəuyğun saymadıq. Təkcə onu qeyd edək ki, son dövrdə işıq üzü görən "Azərbaycan ədəbiyyatı tarixi" kitabının dördüncü cildində verilmiş "Abbasqulu ağa Bakıxanov" oçerkində müəllifin həyatı və dünyagörüşü daha obyektiv şəkildə işıqlandırılmış və ədibin bütün yaradıcılığı boyu islamla, Şərq dini-fəlsəfi fikri və ədəbiyyatı ilə bağlı məsələlərə xüsusi diqqət yetirməsi vurğulanmışdır (**12**, 108-109).

# I FƏSİL
# «RİYAZÜL-QÜDS» KLASSİK MƏQTƏL NÜMUNƏSİ KİMİ

## *1.1. Kərbəla vaqiəsi və bu mövzuda yazılan əsərlər*

Abbasqulu ağa Bakıxanovun «Riyazül-qüds» əsəri müsəlman Şərqində daha çox Kərbəla vaqiəsi adı ilə tanınan tarixi bir qanlı hadisəyə, görünməmiş faciəyə həsr olunmuşdur. İlk öncə həmin hadisəyə və bu mövzuda yazılan məşhur əsərlərə qısa bir nəzər salmağı məqsədəuyğun sayırıq.

Sonuncu peyğəmbər həzrət Məhəmməd (s.) hicri tarixi ilə 9-cu (miladi 632-ci) ildə dünyasını dəyişdikdən dərhal sonra o həzrətin yaratdığı, özülünü qoyduğu müsəlman icmasında, xilafətdə müəyyən narazılıqlar və ziddiyyətlər ortaya çıxdı, bu da ilk növbədə xəlifəliyə seçim məsələsində açıq-aşkar və qabarıq şəkildə özünü göstərməyə başladı. Xilafətin yaranması və güclənməsində müəyyən xidmətləri olan bir sıra nüfuzlu din xadimləri və adi müsəlmanlar hesab edirdilər ki, həzrət Məhəmmədin (s.) əmisi oğlu, Əhli-beyt üzvü olan imam Əli (ə.) peyğəmbərin canişini olaraq xilafət kürsüsündə oturmağa daha layiqdir. Bununla belə, həmin vəzifəyə peyğəmbərin qayınatası, Rəşidiyyə xəlifələrindən birincisi - Əbu Bəkr bin Abdullah (ə.) layiq görüldü. 13/634-cü ildə Əbu Bəkrin (ə.) vəfatından sonra isə onun tövsiyəsi ilə Ömər bin Xəttab (ə.) xəlifə təyin olundu və on il xəlifəlik etdikdən sonra 24/644-cü ildə öldürüldü. Onun yerinə Bəni Ümeyyə qəbiləsindən olan Osman bin Əffan (ə.) xəlifə seçildi.

Bu hadisə ərəb qəbilələri arasında indiyədək mövcud olan, lakin açıq və qabarıq şəkildə özünü büruzə verməyən ziddiyyətləri daha da kəskinləşdirdi və nəticədə üçüncü xəlifə Osman bin Əffan (ə.) 35/656-cı ildə qətlə yetirildi. Bu hadisə müsəlman icması arasındakı çəkişmə və ixtilafları, ikitirəliyi daha da dərinləşdirdi.

Həmin il, yəni 35/656-cı ildə Əli bin Əbu Talib (ə.) dördüncü xəlifə seçildi. Suriya vəlisi Müaviyə bin Əbu Süfyan öz qayınatası Osmanın qətlində imam Əlinin (ə.) əli olduğunu iddia edərək onu xəlifə kimi tanımadı. İmam Əli (ə.) Müaviyəni özünə tabe etdirmək üçün böyük bir qoşunla Suriyaya doğru hərəkət etdi. 37/657-ci ildə imam Əlinin (ə.) qoşunu ilə Müaviyə tərəfdarları arasında məşhur Siffin döyüşü baş verdi. 100 gün davam edən bu döyüşdə Müaviyə tərəfdarları məğlub olacaqlarını görüb hiyləyə əl atdılar: nizələrinin uclarına Qur'an ayələrini taxaraq döyüşü dayandırmağa və barışıq qazanmağa nail oldular.

Siffin döyüşü zamanı imam Əlinin (ə.) barışıq üçün öz razılığını bildirməsi onun tərəfdarları olan bəzi adamlar arasında narazılığa gətirib çıxardı. Sonralar «xaricilər» adlanan bir dəstə sözügedən hadisəyə görə xəlifənin qoşununu tərk etdi və nəticədə imam Əlinin (ə.) öz tərəfdarları arasında ikitirəlik yarandı. Bu hadisənin bilavasitə nəticəsi olaraq 40/661-ci ildə imam Əli (ə.) «xaricilər»dən birinin əli ilə qətlə yetirildi. İmam Əlinin (ə.) şəhadətindən sonra onun böyük oğlu imam Həsən (ə.) bir müddət İraqda vali oldu, lakin çox keçmədi ki, vəzifəsindən kənarlaşdırıldı və 49/669-cu ildə Mədinədə zəhərləndirilərək öldürüldü.

İmam Əlinin (ə.) vəfatından sonra hakimiyyəti ələ keçirən Müaviyə bin Əbu Süfyanın (40/661-60/680) xəlifəliyi dövründə müsəlman icması arasındakı bir qədər əvvəl də mövcud olan çəkişmə və ixtilaflar daha da güclənməyə, dərinləşməyə başladı. Müaviyənin hələ sağlığında öz yerinə oğlu Yezidi vəliəhd təyin etməsi isə müsəlmanların böyük bir

hissəsinin açıq-aşkar hiddət və qəzəbinə, güclü narazılığına səbəb oldu. Müaviyə 60/680-ci ildə vəfat etdikdən sonra oğlu Yezid xəlifə kürsüsünü tutdu. İmam Əlinin (ə.) kiçik oğlu imam Hüseyn (ə.) isə onun xəlifəliyini qəbul etmədi. Bu xəbəri eşidən Kufə şəhərinin əhalisinin çoxu imam Hüseynə (ə.) məktub yazaraq bildirdi ki, onlar Yezidi deyil, imamı xəlifə kimi tanıyırlar. İmam Hüseyn (ə.) bu məsələyə tam aydınlıq gətirmək, onu dəqiqliklə öyrənmək məqsədilə əmisi oğlu Muslim bin Əqili Kufəyə göndərdi. Bu işdən xəbər tutan Yezid Bəsrə valisi Übeydullah bin Ziyadı Kufəyə vali təyin etdi və ona yerli camaatı öz tərəfinə çəkmək əmrini verdi. İbn Ziyad Kufə camaatını ələ almağa nail oldu və Muslim bin Əqili 60/680-ci ildə qətlə yetirtdi.

Bu hadisə baş verən zaman imam Hüseyn (ə.) kiçik dəstəsi ilə Kufəyə doğru hərəkətdə idi. Bu zaman o, Kufə yolunda ikən Muslim bin Əqilin şəhid olması xəbərini eşitdi. İmama (ə.) Kufəyə getməmək təklif olunsa da, o, qərarından dönmədi və 72 (bəzi qaynaqlarda 73) nəfərlik ən yaxın adamlarından ibarət olan kiçik bir dəstə ilə Kufəyə doğru hərəkətini davam etdirdi. Bu xəbəri eşidən Kufə valisi İbn Ziyad imamın (ə.) kiçik dəstəsinin qarşısını almaq üçün Ömər bin Sə'din başçılığı ilə 4000 nəfərlik bir qoşun yola saldı. Ömər bin Sə'd Kufə yaxınlığındakı Kərbəla düzündə imam Hüseynlə (ə.) görüşdü və ona İbn Ziyadı vali kimi tanımasını təklif etdi. İmam Hüseyn (ə.) onun bu təklifini qəbul etməyərək Şama və ya Məkkəyə getmək qərarında olduğunu bildirdi. Ömər bin Sə'd bu xəbəri İbn Ziyada çatdırdı və ondan imam Hüseynin (ə.) qətlə yetirilməsi əmrini aldı.

Beləliklə, hicri tarixi ilə 61-ci ilin məhərrəm ayının 10-da (miladi tarixi ilə 680-ci ilin sentyabr ayının 10-da) imam Hüseyn (ə.) və silahdaşları Kərbəla düzündə şəhid oldular. Peyğəmbərin (s.) nəvəsinin (ə.) və yaxın silahdaşlarının qeyri-bərabər döyüşdə amansızcasına qətlə yetirilməsi ilə yadda qalan bu hadisə islam tarixinə «Kərbəla vaqiəsi», «Kərbəla faciəsi» və ya

«Kərbəla müsibəti» kimi düşdü və böyük əks-səda doğurdu.

İslam aləmində görünməmiş bir müsibət, qanlı faciə kimi dəyərləndirilən Kərbəla vaqiəsi Yaxın və Orta Şərq xalqları ədəbiyyatında yeni bir ağrılı və qəmli, dərdli-kədərli mövzunun yaranmasına gətirib çıxardı və çox keçmədi ki, ərəb, fars və türk dillərində Kərbəla vaqiəsinə həsr olunmuş bir sıra əsərlər ortaya çıxdı.

Həm nəzmlə, həm də nəsrlə yazılan, bəzən isə nəsrlə nəzmin növbələşməsi şəklində qələmə alınan bu cür əsərlər, əsasən, «Məqtəl» və ya «Məqtəli-Hüseyn» adı ilə tanınır. Məsələn, dahi Azərbaycan şairi Məhəmməd Füzuli «Hədiqətüs-süəda» əsərinin dibaçəsində kitabını «məqtəli-türki» adlandırır (**29**, 25).

«Məqtəl» ərəb mənşəli sözdür: «qətl» sözü ilə eyniköklüdür və lüğəvi mənasına görə «qətl yeri» deməkdir. Ədəbiyyatşünaslıqda isə «məqtəl» termin səciyyəsi daşıyır və islamın ən böyük şəhidləri, xüsusilə də imam Hüseyn (ə.) haqqında yazılan əsərlər anlamında işlənir. Yeri gəlmişkən qeyd edək ki, Azərbaycan ədəbiyyatşünaslığında yalnız son zamanlar az-çox işlənməyə başlayan «məqtəl» termini bəzən yanlış olaraq janr növü kimi təqdim edilir (bax: **13; 47**, 22-28). Məsələnin mahiyyətinə vardıqda isə açıq-aşkar şəkildə aydın olur ki, «məqtəl» sözü bir termin olaraq janr yox, mövzu, məzmun anlamını daşıyır, çünki bütün məqtəl kitabları, əsasən, Kərbəla faciəsi mövzusundadır, janr baxımdan isə onlar fərqlənirlər. Məsələn, Füzulinin «Hədiqətüs-süəda»sı ilə Qumrinin «Kənzül-məsaib» kitabı məqtəl nümunəsi olsalar da, janr baxımından fərqlənirlər: birincisi povest və ya roman janrına aid edilir (bax: **54**, 65-67), digəri isə müxtəlif janrlarda yazılmış lirik şeirlərdən ibarətdir (bax: **36,** II, 311-326).

Məqtəl kitabları, bir qayda olaraq, təhkiyə üslubunda yazılır və epik səciyyə daşıyır. Belə əsərlərdə qəhrəmanın həyatının başlıca dönəmləri təsvir olunmaqla yanaşı, əsas hadisənin - faciənin tarixi kökləri və onun başlıca ideya-fəlsəfi

və ictimai-siyasi mahiyyəti də açıqlanır.

Məqtəl yazmaq ənənəsinin kökləri ərəb ədəbiyyatına gedib çıxır. İlk məqtəl kitablarından birini həzrət Əlinin (ə.) silahdaşlarından olmuş Əşbə bin Nəbatə hicri tarixi ilə birinci (miladi yeddinci) yüzillikdə hazırlamışdır (**103**, 1263). Əbu Mixnəf Lut bin Yəhyanın (öl. 157/774) yazdığı «**Kitabi-məqtəlül-Hüseyn**» əsəri də ilk məqtəl kitabı nümunələrindən sayılır. Bir neçə fərqli əlyazma variantı olan bu əsərin əsl orijinal nüsxəsi əldə yoxdur (**93**, XXIII). Tanınmış ərəb şairi, əhli-beyt aşiqi Debel Xüzai (148/765-246/860) də Kərbəla vaqiəsinə çoxlu şeir həsr etmişdir (**106**).

Qeyd edək ki, A.Bakıxanov «Riyazül-qüds»dəki bir epizodda Debel Xüzaidən bəhs etməklə yanaşı, bir neçə yerdə onun şeirlərindən nümunələr də vermişdir (**14**[*], 3b, 30a, 68a). M.Füzuli də «Hədiqətüs-süəda» əsərində bu şairin bir beytini vermişdir (**29**,308).

Əbülfərəc İsfahaninin (284/897-356/967) «**Məqatilüt-talibin**» və Əbu İshaq İsfərainin (öl. 418/1027) «**Nurül-əyn fi məşhədül-Hüseyn**» əsərləri də ərəb dilində yazılmış ən qədim məqtəl kitablarından sayılır (**94**, XXIV). Ərəb dilində yazılmış ən məşhur məqtəl kitablarından biri Hilləli Seyyid Rəziyəddinin (589/1193-644/1266) qələmindən çıxmışdır. «**Məsrəi-Tavusi**» adlanan bu əsəri Füzuli də «Hədiqətüs-süəda»nın müqəddiməsində mötəbər bir qaynaq kimi qeyd edir (**29**,26). «**Ləhuf**» adı ilə tanınan bu kitab bir neçə dəfə nəşr olunmuşdur (**28**, 607).

Fars dilində yazılan ən geniş yayılmış məqtəl kitabı isə Herat vaizi Hüseyn Vaiz Kaşifinin (öl. 910/1504-05) «**Rövzətüş-şühəda**» əsəridir. Füzuli «Hədiqətüs-süəda» əsərini Kaşifinin bu məşhur kitabından sərbəst - yaradıcı şəkildə tərcümə yolu ilə qələmə almışdır (bax: **47**; **54**). 902/1502-ci

[*] «Riyazül-qüds»dən verilən bütün nümunələr bu mənbədən götürülmüşdür. Bundan sonra yalnız nümunə verilən vərəq göstəriləcək.

ildə tamamlanmış «Rövzətüş-şühəda» yarandığı dövrdən başlayaraq görünməmiş sürətlə və geniş şəkildə yayılaraq təkcə XVI yüzillikdə iki dəfə osmanlıcaya (Gəlibolulu Caminin «Səadətnamə» tərcüməsi və Aşiq ibn Nəttainin «Rövzətüş-şühəda» tərcüməsi) və 945/1539-cu ildə Azərbaycan türkcəsinə (Məhəmməd Hüseyn bin Katib Nişatinin «Şühədanamə» tərcüməsi - bax: **56**) tərcümə edilir. Maraqlıdır ki, «Rövzətüş-şühəda» yazılandan sonra kitabın adında olan «rövzə» sözü (lüğəvi mənası «bağça» deməkdir) fars dilində «yas», «matəm», «təziyə saxlamaq» mənalarıda işlənməyə başlanır və bu dildə «rövzəxan» (mərsiyə oxuyan) sözü də ortaya çıxır. Onu da qeyd edək ki, «Rövzətüş-şühəda»nı Hüseyn Nidai Yəzdi Nişapuri 928/1521-22-ci ildə nəzmə çəkərək əsərini «**Seyfün-nübüvvə**» («Peyğəmbərlik qılıncı») adlandırmışdır. Bu əsər «Məşhədüş-şühəda» adı ilə də tanınır (**88**,1, 625-626).

Kərbəla faciəsi mövzusunda fars dilində çoxlu mərsiyə, növhə və sinəzənlər də yazılmışdır. Bu qəbildən olan ən məşhur əsər Möhtəşəm Kaşaninin (öl.996/1587) «**Dəvazdəh bənd**» («On iki bənd») adı ilə tanınan mərsiyələridir.

Fars dilində yazılan məşhur məqtəl kitablarından biri də Məhəmməd Bağır Məclisinin «Cəlaül-üyun» əsəridir ki, aşağıda onun haqqında daha geniş məlumat verəcəyik.

Kərbəla vaqiəsi mövzusunda türkcə yazılan ən qədim kitab isə Kastamonulu Şazinin 763/1361-ci ildə qələmə aldığı «**Dastani-məqtəli-Hüseyn**» məsnəvisi sayılır (**80**, XXVII). Qeyd edək ki, orta yüzilliklərdə, xüsusilə də XV-XVI əsrlərdə bu mövzuda türkcə yazılan əsərlərin çoxu Osmanlı müəlliflərinin qələmindən çıxmışdır. Görkəmli türk tədqiqatçısı, tanınmış füzulişünas alim Əbdülqadir Qaraxan Kərbəla vaqiəsi mövzusunda türk dilində qələmə alınan əsərlərə ayrıca bir tədqiqat həsr edərək onları geniş şəkildə araşdırmışdır (**95**). Füzulinin «Hədiqətüs-süəda» əsərinin

tənqidi mətnini hazırlamış türk alimi d-r Şəyma Güngör də türkcə yazılmış məqtəllər haqqında qısa məlumat vermişdir (**94**, XXVI-XXIX). Bu da maraqlıdır ki, türkcə yazılan məqtəl kitablarının çoxu nəzmlədir. Məsələn, Yəhya bin Bəxşinin 905/1499-cu ildə tamamladığı «**Məqtəli-Hüseyn**», Lameinin 940/1533-34-cü ildə qələmə aldığı eyni adlı əsərləri məsnəvi şəklindədir. Osmanlı müəlliflərinin Kərbəla vaqiəsi mövzusunda əsərləri göstərir ki, bu qanlı faciəni məzhəbindən asılı olmayaraq, bütün müsəlmanlar böyük ağrı və acı ilə anmış, ona sonsuz sayğı və ehtiramlarını bildirmişlər.

Azərbaycan türkcəsində qələmə alınan və bizə məlum olan ən qədim məqtəl kitabları isə yalnız tərcümə ədəbiyyatı nümunələridir və XVI yüzilliyə aiddir. Bu tərcümələr yuxarıda adını çəkdiyimiz Nişatinin «Şühəda-namə» tərcüməsi və Füzulinin «Hədiqətüs-süəda» əsəridir.

Kərbəla vaqiəsi mövzusu Azərbaycan ədəbiyyatında XIX yüzillikdə daha geniş yayılmağa başlayır ki, bunu da ölkənin iki yerə bölünməsi, xüsusilə də Şimali Azərbaycanın çar Rusiyası tərəfindən işğalından sonra yerli əhali arasında yaranan ümumi məyusluq və ümidsizliklə, küskünlük və bədbin əhvali-ruhiyyə ilə izah etmək olar.

Bu dövrdə Kərbəla müsibəti mövzusunda ən məşhur və təsirli əsər yazan şairlər Molla Hüseyn Dəxil Marağayi, Mirzə Məhəmməd Tağı Qumri və Əbülhəsən Raci sayılır. Məşhur ədəbiyyatşünas Firidun bəy Köçərlinin yazdığına görə, Dəxilin yazdığı əsərlərin çoxu Kərbəla faciəsinə həsr olunmuşdur. Həmin əsərlərin həm nəsrlə, həm də nəzmlə olduğunu qeyd edən F.Köçərli yazır: *«Dəxilin Füzuli kimi nəsr ilə yazmaqda dəxi ziyadə qabiliyyəti və məharəti kəlamından məlum oldu»* (**36**, II, 382). Bir sıra qaynaqlarda həmin əsərlərin altı və yeddi cildlik kitab şəklində olması qeyd olunsa da, onların dəqiq adı göstərilmir.

Qumrinin Kərbəla vaqiəsinə həsr etdiyi əsəri isə

«**Kənzül-məsaib**» adlanır. Qumri bu əsərində Kərbəla faciəsini nəzmlə qələmə almışdır.

Əbülhəsən Racinin də Kərbəla vaqiəsi mövzusunda yazdığı əsərləri nəzmlədir. XIX yüzilliyin şairlərindən Məhəmməd Əmin Dilsuz Təbrizi və Hacı Rza Sərraf Təbrizinin yaradıcılığında da Kərbəla faciəsinin nəzmlə təsviri əsas yer tutur (**34**, 106-111).

F.Köçərli XIX yüzillikdə Azərbaycan ədəbiyyatında imam Hüseyn (ə.) müsibətinə dair çoxlu növhə və mərsiyə yazılmasını yerli camaatın bu qəbildən olan əsərlərə daha çox rəğbət göstərməsi ilə izah edir (**36**, II, 326). Abbasqulu ağa Bakıxanovun gənclik illəri də belə bir mühitdə keçmişdir və heç şübhəsiz ki, «Riyazül-qüds»ün məhz həmin vaxtlar ortaya çıxmasında bu amilin mühüm rolu olmuşdur.

### *1.2. «Riyazül-qüds» haqqındakı məlumatlara baxış*

A.Bakıxanovun «Riyazül-qüds» əsəri dini məzmun daşıdığına görə indiyədək, demək olar ki, öyrənilməmişdir. Bununla belə, şair-yazıçının bədii irsi araşdırılarkən, təbii ki, onun bu əsərinə də toxunulmuş, haqqında qısaca da olsa, bilgilər verilmişdir. «Riyazül-qüds» haqqında ilk qısa məlumata Azərbaycanda elmi ədəbiyyatşünaslığın əsasını qoyan Firidun bəy Köçərlinin «**Azərbaycan ədəbiyyatı**» adlı məşhur kitabında rast gəlirik. F.Köçərli burada Abbasqulu ağa Bakıxanov Qüdsi haqqındakı dəyərli məlumatında sənətkarın əsərləri sırasında birinci olaraq «Riyazül-qüds»ün adını çəkir və onun türk dilində olduğunu göstərir. Görkəmli ədəbiyyatşünas alim həmçinin əsərin məzmunu ilə bağlı yazır: «*Bu kitabın mündəricatı əhli-beyti-rəsulüllah səlləllahü təala əleyhi və səlləmin vəqayei xüsusundadır*» (**36**,1, 293).

Cənubi Azərbaycanın görkəmli ədəbiyyatşünaslarından

Məhəmmədəli Tərbiyətin «**Danişməndani-Azərbaycan**» və Əziz Dövlətabadinin «**Qafqazın farsca yazan şairləri**» kitablarında da «Riyazül-qüds» haqqında verilən qısaca bilgilərdə əsərdə on dörd məsumun əhvalından bəhs edilməsi göstərilir (**70**, 72; **22**, 39).

Tanınmış ingilis alimi Ç.Storinin «**Fars ədəbiyyatı**» adlı məşhur tədqiqatında da Abbasqulu ağa Bakıxanov haqqındakı məlumatda «Riyazül-qüds»ün adı çəkilərək onun 14 müqəddəs şəxsiyyət haqqında yazılmış bir kitab olması göstərilir. Qeyd edək ki, bu kitabda «Riyazül-qüds» yanlış olaraq fars dilində yazılmış bir əsər kimi təqdim edilir (**88**, II, 1279).

«Riyazül-qüds» haqqında nisbətən daha geniş məlumatı isə ilk dəfə prof. Feyzulla Qasımzadə vermişdir. Görkəmli ədəbiyyatşünas 1956-cı ildə nəşr olunmuş «**Abbasqulu ağa Bakıxanov Qüdsi**» kitabında şair-yazıçının bədii yaradıcılığını təhlil edərkən «Riyazül-qüds»ün də adını çəkərək, kitabın yazılma tarixini (1820) göstərir və onun *«məhərrəmlik təziyədarlığı ilə əlaqədar yazılmış dini bir əsər»* olduğunu qeyd edir (**37**, 102). Burada həmçinin «Riyazül-qüds»ün *«Qubada təziyə məclisi tərtib edən şiə təziyədarlarının tapşırığı üzrə»* yazılması da göstərilir (**37**, 102). F.Qasımzadənin «Riyazül-qüds» haqqındakı ümumi səciyyə daşıyan qeydlərində bir ziddiyyətli məqam da diqqəti cəlb edir. Belə ki, o: *«Əsərini yazarkən şair **(A.Bakıxanov - M.N.)** XV əsrdə yaşamış Hüseyn Kaşifinin «Rövzətüş-şühəda», Füzulinin «Hədiqətüs-süəda», Məhəmmədbağır Məclisinin «Cəlaül-üyun» əsərlərindən istifadə etmişdir»* cümləsinin ardınca yazır: *«Müəllifin **(A.Bakıxanovun - M.N.)** öz qeydinə görə bu əsər «Cəlaül-üyun»dan tərcümə və iqtibasdır»* (**37**, 102). Göründüyü kimi, F.Qasımzadə əvvəlcə A.Bakıxanovun «Riyazül-qüds»də müxtəlif əsərlərdən istifadə etdiyini göstərir və onun orijinal əsər olmasına əsla şübhə ilə yanaşmır. Daha sonra isə o, kitabın özündə əsərin «tərcümə və iqtibas» adlarıdırıldığını qeyd edir. Bununla

belə, tədqiqatçı alim nədənsə A.Bakıxanovun bu qeydinə öz münasibətini bildirmir, daha doğrusu, onun üstündən yan keçir və əsər haqqındakı sonrakı qeydlərində bu kitabın *«mühafizəkar ədəbiyyata xidmət etdiyini»* vurğulamaqla kifayətlənir (**37**, 103-104).

F.Qasımzadənin «Riyazül-qüds» haqqındakı yuxarıdakı qeydlərinin çoxu eynilə Azərbaycan SSR Elmlər Akademiyasının 1960-cı ildə nəşr etdiyi «Azərbaycan ədəbiyyatı tarixi» kitabının II cildindəki «Abbasqulu ağa Bakıxanov» oçerkində də verilmişdir ki, onun da müəllifi elə görkəmli ədəbiyyatşünas alimin özüdür. Bununla belə, burada «Riyazül-qüds»ün A.Bakıxanovun özü tərəfindən «tərcümə və iqtibas» adlarıdırılması faktı qeyd olunmur (**11**, 75). Fikrimizcə, bu məsələni ilk növbədə «Riyazül-qüds» haqqında burada verilən məlumatın daha qısa həcmli olması ilə (cəmi bir abzasdır) izah etmək olar. Hər halda prof. F.Qasımzadə sözügedən kitabında «Riyazül-qüds»ün A.Bakıxanovun özü tərəfindən «tərcümə və iqtibas» adlandırılması faktını qeyd etsə də, ona qətiyyən əhəmiyyət verməmişdir ki, bunun da başlıca səbəbini tədqiqatçı alimin qarşısına belə bir məqsəd qoymamasında və əsər haqqındakı məlumatının ümumi və tanışlıq səciyyəsi daşımasında görmək mümkündür. Yeri gəlmişkən bu məsələ ilə bağlı bəri başdan onu da qeyd edək ki, aşağıda görəcəyimiz kimi, A.Bakıxanov «Riyazül-qüds»də öz əsərini «iqtibas» yox, «tərcümə» adlandırır. Təbii ki, «tərcümə» və «iqtibas» anlayışlarının bir-biri ilə müəyyən bağlılığı olsa da, onları tam eyniləşdirmək olmaz (bax: **77**; **82**; **83**). Hər halda fakt odur ki, F.Qasımzadə sözügedən kitabında ilk dəfə olaraq A.Bakıxanovun «Riyazül-qüds»dəki yuxarıdakı qeydinə diqqət yetirmiş, lakin nədənsə onu əhəmiyyətli və vacib saymayaraq, ümumiyyətlə və bu məsələ üzərində dayanmağı lazım bilməmişdir.

A.Bakıxanovun həyat və yaradıcılığını ətraflı araşdırmış Ənvər Əhmədov da «Riyazül-qüds»ün əlyazmasında müəllifin

bu əsərini «переложение» («çevirmə»; «uyğunlaşdırma») adlandırması faktını qeyd edir, lakin bunula belə ədibin kitaba bir sıra əlavələr etdiyini, ixtisara yol verdiyini vurğulayır (**77**, 76). «Riyazül-qüds»ün fəsilləri və əlyazması haqqında da qısaca məlumat verən Ə.Əhmədov əsərin A.Bakıxanovun həyatının Quba dövrünə aid olduğunu və onun yerli şiə təəssübkeşləri üçün yazıldığını da qeyd edir (**77**,76-77).

A.Bakıxanovun fars dilində yazdığı əsərlərini dilimizə çevirən və şair-yazıçının «Seçilmiş əsərləri» kitabını nəşr etdirən görkəmli ədəbiyyatşünas Məmmədağa Sultanov da həmin kitaba yazdığı ön sözdə sənətkarın digər əsərləri ilə yanaşı, «Riyazül-qüds» haqqında da qısa məlumat vermişdir. Əsərin «*əsasən mərsiyə xarakteri daşıdığını*» qeyd edən M.Sultanov kitabdakı lirik şeirlərin dinlə əlaqəsi olmadığını da vurğulayaraq yazır: *«Bu əsərdə (**«Riyazül-qüds»də - M.N**.) sənətkarlıqla qələmə alınmış şeir parçalarından aydın olur ki, A.Bakıxanov lap gənc yaşlarından ana dilində şeir yazmağa başlamış və bu şeirlərin bir qismini sonralar «Riyazül-qüds»ə daxil etmişdir»* (**15**, 6). Ədəbiyyatşünas alim həmçinin A.Bakıxanovun bu əsərində Vaiz Kaşifinin «Rövzətüş-şühəda», Məhəmməd Füzulinin «Hədiqətüs-süəda» və Məhəmməd Bağır Məclisinin «Cəlaül-üyun» əsərlərinin təsiri oluğunu da göstərir.

Göründüyü kimi, «Riyazül-qüds»də yuxarıda adları çəkilən üç əsərin təsiri olması məsələsində M.Sultanovla prof. F.Qasımzadənin fikirləri tam üst-üstə düşür. Bununla belə, M.Sultanov prof. F.Qasımzadədən fərqli olaraq, «Riyazül-qüds»də onun tərcümə olması ilə bağlı müəllif qeydinə ümumiyyətlə toxunmur. M.Sultanov təcrübəli əlyazmaşünas alimdir və təbii ki, «Riyazül-qüds»ün əlyazması ilə tanış olmamış deyilmiş. A.Bakıxanovun «Seçilnıiş əsərləri»nin sonuna M.Sultanovun bu kitabdan da bəzi şeir nümunələrini daxil etməsi bunu əyani şəkildə sübut edir. Bu baxımdan M.Sultanovun «Riyazül-qüds»də A.Bakıxanovun

onu tərcümə adlarıdırması ilə bağlı qeydlərini görməməsi və ya ona diqqət yetirməməsi, bizcə, inandırıcı və ağlabatan deyil. Belə olduqda bəs təcrübəli ədəbiyyatşünas, həm də görkəmli mütərcim bu məsələyə nə üçün öz münasibətini bildirməmişdir? Fikrimizcə, bu məsələnin iki səbəbi ola bilər. Birincisi, M.Sultanovun klassik Azərbaycan tərcümə nümunələri ilə bağlı məqalələri göstərir ki, ədəbiyyatşünas alim orta yüzilliklərdə dilimizə çevrilmiş əsərlərə sırf müasir tərcümə nəzəriyyəsinin tələbləri baxımından yanaşmış, klassik tərcümələrlə onların orijinalları arasında tam uyğunluq axtarmışdır (**68**, 182-190; **69**, 68-89). Məsələn, M.Sultanov Füzulinin «Hədiqətüs-süəda» əsərinə həsr etdiyi bir məqaləsində sözügedən əsəri tərcümə deyil, orijinal sayır və bu fikrinə başlıca dəlil-sübut kimi kitabdakı şeirlərin Füzuli qələminin məhsulu olduğunu göstərir (**68**, 182-190). Ədəbiyyatşünas alim həmçinin bu məsələdə «Hədiqətüs-süəda» ilə onun farsca orijinalı sayılan Kaşifinin «Rövzətüş-şühəda» əsərlərinin ad baxımından fərqli olmasını birincinin orijinallığına dəlil-sübutları sırasında qeyd edir (**68**, 182-190). Bu baxımdan «Riyazül-qüds» və «Cəlaül-üyun» da eyni vəziyyətdədir, yəni birinci əsərdə olan şeir parçalarının çoxu A.Bakıxanovun öz qələminin məhsuludur («Cəlaül-üyun»da, ümumiyyətlə, şeir nümunələri yoxdur) və bu iki əsərin adları arasında da heç bir uyğunluq görmək mümkün deyil. Bu mənada M.Sultanov, görünür, A.Bakıxanovun sözügedən məsələ ilə bağlı qeydini ciddi və əhəmiyyətli bir arqument kimi qəbul etməmişdir. İkincisi və ən başlıcası isə, M.Sultanov da prof. F.Qasımzadə kimi «Riyazül-qüds» haqqında sırf ümumi məlumat səciyyəsi daşıyan bilgilər verməklə kifayətlənmiş və əsəri təhlil etməyi qarşısına bir məqsəd olaraq qoymamışdır.

Ədəbiyyatşünas alim Hidayət Əfəndiyev də «**Azərbaycan bədii nəsrinin tarixindən**» kitabında «Riyazül-qüds»dən qısaca bəhs etmişdir (**23**, 83-85). H.Əfəndiyevin də bu əsər haqqındakı fikirləri ümumi səciyyə daşıyır və əsasən onun

mövzu və məzmununa, eləcə də dil-üslub xüsusiyyətlərinə aiddir. Tədqiqatçı alim «Riyazül-qüds»də Füzuli üslubu və dilinin dərin təsiri olduğunu qeyd edərək yazır ki, A.Bakıxanovun bu əsərini *«hətta Füzulinin «Hədiqətüs-süəda»sına nəzirə adlandırmaq olar».* (**23**, 84) Bununla belə, H.Əfəndiyev bu iki əsər arasındakı bağlılıq və yaxınlıqdan bəhs edərkən məzmunla yanaşı, onların nəsrlə nəzmin növbələşməsi şəklində qələmə alındığını qeyd etməklə kifayətlənir və bu məsələnin konkret cizgiləri üzərində dayanmır. H.Əfəndiyevin «Riyazül-qüds» haqqındakı fikirlərində dövrün tələbinə, ideoloji qəliblərə uyğun məqamlar, notlar da açıq-aşkar özünü göstərir. Məsələn, onun fıkrincə, A.Bakıxanov «Riyazül-qüds»də *«öz qarşısına yüksək ictimai ideya qoymamış, ancaq dini təbliğat qayəsini izləmişdir»* (**23**, 84).

Doktor Cavad Heyət də «**Azərbaycan ədəbiyyatına bir baxış**» kitabında Abbasqulu ağa Bakıxanov haqqındakı oçerkində müəllifin əsərləri sırasında «Riyazül-qüds»ün də adını çəkərək onu *«Füzulinin «Hədiqətüs-süəda»sına türkcə nəzirə»* adlandırır (**34**, 129).

Və nəhayət, bu yaxınlarda nəşr olunmuş **«Azərbaycan ədəbiyyatı tarixi»** kitabının IV cildindəki Abbasqulu ağa Bakıxanov haqqındakı oçerkdə müəllifin «Riyazül-qüds» əsərinə də müəyyən yer ayrılmışdır (**12**,109-111). Burada «Riyazül-qüds»ün yuxarıda adları çəkilən üç əsərin («Rövzətüş-şühəda», «Cəlaül-üyun», «Hədiqətüs-süəda») təsiri altında qələmə alındığı göstərilir (**12**,10) və kitabın məzmunu, quruluşu və dili ilə bağlı qısa bilgilər verilir, lakin onun tərcümə və ya iqtibas olması haqqında heç nə deyilmir. Təqdirəlayiq haldır ki, Nadir Məmmədovun müəllifi olduğu bu oçerkdə A.Bakıxanovun bütün həyatı boyu dinə möhkəm inam bəsləməsi, ömrünü bir dindar kimi başa vurması və bütün əsərlərində islamın yüksək mənəvi-əxlaqi ideyalarını ardıcıl surətdə təbliğ etməsi vurğulanır (**12**,114)

Türkiyədə nəşr olunan bəzi kitablarda da A.Bakıxanovun

«Riyazül-qüds» əsəri haqqında ümumi səciyyə daşıyan bioqrafik məlumatlar verilmişdir (**99**, 543-544).

Beləliklə, A.Bakıxanovun «Riyazül-qüds» əsəri haqqında Azərbaycan ədəbiyyatşünaslığında mövcud olan bilgi və fikirləri ümumiləşdirdikdə belə bir nəticəyə gəlmək olar ki, onlar sırf təqdimat və ümumi məlumat səciyyəsi daşımışdır. Təəccüblüdür ki, «Riyazül-qüds» haqqında məlumat verən tədqiqatçılardan heç biri (F.Qasımzadə istisnadır) indiyədək bu əsərin tərcümə səciyyəsi daşımasını qeyd etməmişdir. Fikrimizcə, bu məsələ, yuxarıda qeyd etdiyimiz kimi, ilk növbədə onunla bağlıdır ki, «Riyazül-qüds» dövrün ideologiyasından irəli gələn yasaq və qadağalara görə uzun müddət, ümumiyyətlə, müəyyən mənada «toxunulmaz» qalmış, konkret tədqiqat obyekti olmamışdır. Buna sübut olaraq təkcə belə bir faktı qeyd etmək kifayətdir ki, əsər haqqında yalnız son illərdə bu sətirlərin müəllifinin bir neçə məqaləsi nəşr olunmuşdur (**59**; **60**; **61**).

### *1.3. «Riyazül-qüds»ün əlyazması haqqında*

Abbasqulu ağa Bakıxanovun «Riyazül-qüds» əsərinin hələlik elm aləminə yalnız bir əlyazma nüsxəsi məlumdur ki, bu da Azərbaycan Milli Elmlər Akademiyasının Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda saxlanılır. D-140/7472 şifrli bu əlyazma 1258/1842-ci ildə, yəni əsər yazılandan 22 il sonra - A.Bakıxanovun sağlığında köçürülmüşdür. Əlyazmanm sonunda ənənəyə görə katibin adı qeyd olunmuşdur: Haqverdi bin Məşhədi Ocaqverdi Qarabaği (91a). Əlyazmanm harada köçürülməsi qeyd olunmasa da, katibin nisbəsinə (Qarabaği) əsasən onun Şimali Azərbaycanda, daha doğrusu, Qarabağ bölgəsində köçürülməsi qənaətinə gəlmək olar.

Əlyazmada əsas mətnin xətti incə kalliqrafik nəstəliqdir. Ərəbcə mətnlər nisbətən iri və gözəl nəsx xətti ilə köçürülmüşdür. Başlıqlar, eləcə də «nəzm», «şeir», «qitə» və s. bu kimi sözlər («binom»lar) qırmızı boya ilə yazılaraq seçdirilmişdir. Ərəb dilində olan söz, ifadə və cümlələrin isə yuxarısından qırmızı xətt çəkilmişdir. Mətn bütövlükdə haşiyəyə alınmışdır. Əlyazmanın həcmi 91 vərəq, ölçüsü 32x20 sm, kağızı Avropa istehsallı, krem rənglidir. Hər səhifədəki sətirlərin sayı 21, haşiyənin ölçüsü 24x13 sm-dir. Əlyazma qəhvəyi rəngli dəri cildə tutulmuşdur.

Prof. F.Qasımzadənin, eləcə də H.Əfəndiyev və Ə.Əhmədovun «Riyazül-qüds» haqqındakı qeydlərində də məhz bu əlyazmanın şifri göstərilir. M.Sultanov isə, təəssüf ki, «Riyazül-qüds»dən bəhs edərkən əsərin hansı əlyazma nüsxəsindən istifadə etdiyini göstərmir.

Beləliklə, aydın olur ki, «Riyazül-qüds»ün sözügedən Bakı nüsxəsindən başqa, digər əlyazması əldə yoxdur. Bununla belə, əsərin Bakı nüsxəsinin özü sübut edir ki, onun digər nüsxələri də vaxtilə olubmuş, çünki katib Haqverdi Qarabaği hazırladığı əlyazmanı, təbii ki, kitabın digər bir nüsxəsindən köçürmüşdür. A.Bakıxanovun bəzi əsərlərinin əlyazmalarının Sankt-Peterburq şəhərindəki mövcud əlyazma mərkəzlərində saxlanıldığını nəzərə alaraq, biz həmin şəhərdəki müvafiq kitabxanaların əlyazma kataloqlarını nəzərdən keçirdik, lakin «Riyazül-qüds»ün orada olması haqqında heç bir qeydə rast gəlmədik. İran əlyazma mərkəzlərinin kataloqlarına müraciətimiz də nəticəsiz qaldı. Bu məsələ ilə bağlı qeyd edək ki, ümumiyyətlə, Kərbəla vaqiəsi mövzusunda qələmə alınan əsərlər içərisində əlyazmaları ən çox yayılan M.Füzulinin «Hədiqətüs-süəda» əsəridir. Bu əsərin dünya əlyazma xəzinələrində 200-dən çox əlyazması mövcuddur. Eyni məzmunlu və eyni əsrdə qələmə alınmış Nişatinin «Şühədanamə» tərcüməsi isə yeganə əlyazması şəklində günümüzə qədər gəlib çatmışdır (Azərbaycan MEA M.Füzuli

adına Əlyazmalar İnstitutu: M-259). Fikrimizcə, bu məsələdə dahi Füzulinin bir şair olaraq özünün məşhurluğu və qüdrətli qələminin ecazkarlığı, bənzərsiz sehri mühüm rol oynamışdır. Düzdür, A.Bakıxanovun «Riyazül-qüds» əsəri də yüksək sənətkarlıq xüsusiyyətləri ilə seçilir, ancaq bununla belə, təbii ki, «Hədiqətüs-süəda» səviyyəsinə yüksələ bilmir.

«Riyazül-qüds»ün günümüzə qədər yalnız bir əlyazma nüsxəsi şəklində çatmasının bir neçə səbəbi ola bilər. Birincisi, «Riyazül-qüds» A.Bakıxanovun ilk əsərlərindən sayılır, şair onu 26 yaşında olarkən qələmə almışdır və bu vaxt o, hələ bir şair kimi püxtələşməmişdi, məşhur deyildi, az tanınırdı. İkincisi, «Riyazül-qüds»ün əsasını təşkil edən nəsr hissəsinin dili olduqca qəlizdir, adi Azərbaycan-türk oxucusu üçün çətin anlaşılan ərəb və fars sözləri, uzun silsiləli, “nəfəskəsici” (akad. T.Hacıyev) izafət tərkibləri ilə yüklənmişdir. Üçüncüsü isə, F.Köçərlinin yazdığı kimi, XIX əsrdə Azərbaycanda imam Hüseynin (ə.) Kərbəla müsibəti mövzusunda növhə və mərsiyələr daha geniş yayılmışdır (**36**, II, 326). «Riyazül-qüds»ün əsas hissəsi isə, qeyd olunduğu kimi, nəsrlədir. Bütün bunları nəzərə aldıqda A.Bakıxanovun «Riyazül-qüds» əsərinin əlyazmasının bu qədər az yayılmasını, daha doğrusu, hələlik yeganə əlyazma nüsxəsi şəklində olmasını təbii qəbul etmək lazım gəlir.

Əlyazmanın səciyyəvi **qrafik-orfoqrafik xüsusiyyətləri** sırasında başlıca olaraq aşağıdakıları qeyd etmək olar:

1. Yalnız türk dilləri üçün, o cümlədən Azərbaycan-türk dili üçün səciyyəvi olan və xüsusi fonetik-semantik funksiya daşıyan «sağır nun» (kar n) səsi əlyazmada yalnız **نك** nun+kaf diqrafı ilə ifadə olunmuşdur. Məlum olduğu kimi, bu səs yalnız söz ortasında və söz sonunda işlənir: **صنكر** *soŋra* (7b), **بنكزر** *bəŋzər* (11b), **كونكلى** *köŋli* (llb), **بنكا** *baŋa (30b),* **بنك** *biŋ* (63b), **قيزونك** *qızuŋ* (68b) və s.

Qeyd edək ki, orta yüzilliklərə aid Azərbaycan

əlyazmalarında, məsələn, «Şühədanamə» və «Şeyx Səfı təzkirəsi»ndə də «sağır nun» səsi ڭ diqrafı ilə ifadə olunmuşdur (bax: **2**, 161; **27**, 19-21; **55**, 64). Bu məsələ ilə bağlı prof. Samət Əlizadə yazır ki, ڭ *diqrafi Azərbaycan və Orta Asiya yazılarına nəstəliq xəttilə gəlmişdir* (**27**, 21). Yeri gəlmişkən qeyd edək ki, Azərbaycan ərazisində köçürülən türkcə mətnləri indiki Türkiyə məkanında yazıya alınan türkcə əlyazmalardan fərqləndirən başlıca qrafik əlamətlər sırasında iki məsələ mühüm yer tutur. Birincisi, Azərbaycan türkcəsində olan mətnlər əsasən nəstəliq xəttilə, osmanlıca mətnlər isə daha çox nəsx və təliq xətləri ilə yazılmışdır. İkinci fərq isə «sağır nun»un Azərbaycan mətnlərində ڭ diqrafı ilə (daha çox XVI əsrin başlanğıcında), osmanlıca yazılarda isə əsasən adi *«kaf»* hərfi ilə və ya üzərində üç nöqtə qoyulan «kaf»la ifadə olunmasıdır (bax: **3**, 57-60; **55***,* 64-65; **57**, 38-41).

2. Əlyazmada orta yüzilliklərə aid türk, xüsusilə də Azərbaycan-türk mətnlərinə aid bir sıra yazı xüsusiyyətlərinin təsiri qabarıq şəkildə özünü göstərir. Bu baxımdan birinci növbədə əski türkcə mətnlərin çoxu üçün səciyyəvi olan imla sabitsizliyini, daha doğrusu, eyni sözlərin müxtəlif qrafik variantlarda yazılışını (bax**: 40**, 21; **56**, 77-82; **85**, 36-39; **86**, 50) qeyd etmək olar. Bu xüsusiyyət, sözsüz ki, yalnız türk mənşəli sözlərin yazılışında özünü göstərir. Məsələn, XVI əsr Azərbaycan tərcümə abidəsi «Şühədanamə»nin yeganə avtoqraf nüsxəsində «*çox*» sözü dörd qrafik variantda, «*kimi*» sözü isə beş qrafık şəkildə yazılmışdır (bax: **56**, 78). Bu sözlərdən birincisinin müxtəlif qrafik variantları arasındakı fərq sonuncu samitin ifadəsindədir. Katib onu üç müxtəlif hərflə: [x] səsini bildirən خ *xe;* [q] və [k'] səslərini bildirən ق *qaf* (bax: **2**, 157-160) və [ğ] səsini bildirən غ *ğəyn* hərfi ilə yazmışdır. İkinci sözdəki ("kimi") qrafik variantdakı fərq isə ortadakı samitdədir: o, həm [m] səsini bildirən م *mim,* həm də [b] və [p] səslərini bildirən ب *be* və پ *pe* hərfləri ilə yazılmışdır.

Aydındır ki, yuxarıdakı sözlərin bu yazılışında həm müxtəlif türk dillərinə aid xüsusiyyətlər, həm də dialekt əlamətləri özünü göstərir. «Riyazül-qüds» əlyazmasında da bir sıra eyni sözlərin müxtəlif şəkildə yazılışı müşahidə olunur ki, fikrimizcə, bunun da başlıca səbəbini əski yazı ənənəsinin təsiri, qalığı kimi qəbul etmək olar. Məsələn, əlyazmada «dəxi» sözü eynilə «Şühədanamə»dəki kimi həm دخی , həm də داخی şəklində yazılmışdır (38a, 70b). Başqa bir nümunə: çağdaş ədəbi dilimizdəki «hansı» sual əvəzliyi, məlum olduğu kimi, dilimizin əski qatlarında, eləcə də orta yüzilliklərdə, əsasən *«qansı»* şəklində işlənmişdir. «Riyazül-qüds»də isə katib bu sözü iki qrafik variantda yazmışdır: خانسی - قانسی *qansı/hansı* (73b, 78a). Fikrimizcə, bu sözün birinci qrafik variantı əlyazmada əski yazı ənənəsinin «qalığı» kimi dəyərləndirilə bilər, çünki XIX yüzillikdə həmin sözün bu şəkildə tələffüz olunması inandırıcı görünmür. Sözün bu cür yazılışı, təbii ki, A.Bakıxanovun özünün yaradıcılığı, daha doğrusu, əsərdə Füzuli təsiri ilə də bağlı ola bilər. Qeyd edək ki, bu variantlardan birincisi (“qansı”) ikinci ilə müqayisədə əlyazmada az işlənmişdir. Ümumiyyətlə, əlyazmada eyni sözün müxtəlif şəkildə yazılması halları aşağıdakı hərf əvəzlənmələrinin nümunələrində özünü göstərir:

**A**. **خ - ق** Bu hərf əvəzlənməsi əlyazmada əsasən söz sonunda və ortasında müşahidə olunur: **قرخ - قرق** *qırq/qırx* (11b, 50b), **باخوب - باقوب** *baqub/baxub* (9a, 65b), **يوخويه - يوقويه** *yuquya/yuxuya* (34b, 76a), **اوخويوبسن - اوقويوب** *oquyub/oxuyubsan* (25a, 73b), **يوخدور- يوقدور** *yoqdur/yoxdur* (11b, 61a) və s. Eyni sözlərin həm **خ** *xe,* həm də **ق** *qaf* hərfi ilə yazılması bir sıra yazılı abidələrimizdə, o sıradan «Şühədanamə»də qeydə alınmışdır (39, 16; **40,**24; 56, 80; **92,** II, 418-419). Bu məsələ ilə bağlı qeyd edək ki, çağdaş ədəbi dilimizdə tərkibində [x] səsi olan bəzi sözlər əlyazmada **ق** *qaf* hərfi ilə ifadə olunmuşdur: **اوق** *oq* (silah növü-37b), **چوق** *çoq* (23b), **يوق** *yok* (8a), **چيقمق** *çıqmaq* (36a), **باقوب** *baqub* (9a), **بوراقسه** *buraqsa* (63b) və s.

Professor S.Əlizadənin fikrincə, ق *qaf* hərfi XVI əsrə aid Azərbaycan mətnlərində həm [q], həm də [x] samitlərini ifadə etmişdir. Buna sübut olaraq alim eyni sözlərin bəzən خ *xe* hərfi ilə yazılmasını göstərir (**27**, 19). Bu məsələni bir qədər ətraflı şəkildə araşdıran filologiya üzrə elmlər doktoru Məmməd Adilovun fikrincə isə, bu qəbildən olan türkcə sözlərdəki «qaf» hərfi orta yüzilliklərdə və sonralar [q] səsi ilə yanaşı, həm də kipləşən kar, dilarxası yumşaq damaq [k'] samitini ifadə etmişdir (**3**, 55). Biz də bu fikirdəyik və əvvəlki tədqiqatlarımızda tərkibində ق *qaf* hərfi olan bir sira sözlərin transfoneliterasiyasında buna əməl etmişik (bax: **56**, 80; **57**, 44). Bununla belə, fikrimizcə, bu məsələdə tədqiqat obyekti olan mətnin səciyyəvi cəhətləri, ayrı-ayrı nümunələri də nəzərə alınmalı, onlara fərdi yanaşılmalıdır. Aydınlıq üçün «Riyazül-qüds»də tərkibində «qaf» hərfi olan bir sözü nümunə olaraq veririk: **چاقوروب** (12a). Bu sözdəki «qaf» hərfini [q] və ya [k'] səsinin ifadəçisi kimi qəbul etdikdə onu *«çaqurub»* və ya *«çakurub»* kimi oxumalıyıq. Aydındır ki, verilən sözün XIX yüzillikdə bu cür şəkildə tələffüz edildiyinə inanmaq çətindir. Həmin sözdəki üçüncü hərfin əlyazmada başqa bir yerdə غ *ğəyn* hərfi ilə ifadə olunması da bu fikri təsdiqləyir: **چاغورسونلار** *çağursunlar* (11b). Eləcə də çağdaş ədəbi dilimizdəki «*yuxu*» sözü əlyazmada on dəfədən çox işlənmiş və خ *xe* hərfi ilə yazılmışdır: **يوخودن – يوخويه – يوخو** *yuxu, yuxuya, yuxudan* və s. (12b, 31b, 35a, 81a). Bu söz əlyazmada yalnız bir dəfə, o da, çox güman ki, əski yazı ənənəsinin təsiri ilə ق *qqf* hərfi ilə də yazılmışdır **يوقويه** *yuquya* (76a). Bizcə, bu faktı nəzərə alaraq, müəyyən bir ortaq məxrəcə gəlmək mümkündür, yəni sonuncu sözü də «*yuxuya*» kimi qəbul etmək düzgündür. Eləcə də yuxarıdakı sözü «*çağurub*» şəklində oxumaq məqsədəuyğundur. Əlbəttə, bununla biz heç də klassik mətnləri «müasirləşdirməyi» təklif etmir, əksinə, hər bir əlyazmaya və ondakı konkret faktlara diqqətlə yanaşmağın zəruriliyini vurğulamaq istəyirik.

**B. ب - م** Bu hərf əvəzlənməsi əlyazmada yalnız birinci şəxsin təkini bildirən şəxs əvəzliyinin nümunəsində müşahidə olunur: **بنم - منم** *bənəm/mənəm* (59b, 72b). Qeyd edək ki, əlyazmada bu əvəzlik əksər hallarda **بن** *bən* şəklində yazılmış, yalnız bircə yerdə şeir parçasında **منم** *mənəm* şəklində işlənmişdir. Bununla belə, Azərbaycanda XIX yüzillikdə, çox güman ki, «bən»lə müqayisədə «mən» variantı daha işlək olmuşdur. Bunu nəzərə alaraq, «Riyazül-qüds»də bu əvəzliyin *«bən»* şəklinə üstünlük verilməsini A.Bakıxanov yaradıcılığında klassik üslubun təsirinin nəticəsi kimi qəbul etmək lazım gəlir. Bu məsələdə katibin də rolunu inkar etmək olmaz, yəni, bəlkə də, o, əski yazı ənənəsinin (üzünü köçürdüyü daha qədim mətnlərin) təsiri ilə bu sözü daha çox *«bən»* şəklində yazmışdır. Orta yüzilliklərə aid bir sıra mətnlərdə də bu söz iki qrafik variantda yazılmışdır (**40**, 22; **78a**, 36; **92**, II, 409-410). XVI əsr əlyazması «Şühədanamə»də isə birinci şəxsin təkini bildirən əvəzlik yalnız **من** *mən* şəklində yazılmışdır. Yeri gəlmişkən qeyd edək ki, «Riyazül-qüds»də çağdaş ədəbi dilimizdəki «min» sayı yalnız **بنك** *biŋ,* şəklində yazılmışdır. Onu da əlavə edək ki, əlyazmada üçüncü şəxsin təkini bildirən əvəzlik əsasən «ol», nadir hallarda isə «o» şəklində işlənmişdir. Məlum olduğu kimi, qədim dilimizdə bu əvəzlik hallandıqda **آنى** *aŋı,* **آنكا** *aŋa,* **آننك** *anıŋ* və s. şəkillərdə işlənmişdir. «Riyazül-qüds»də isə bu əvəzlik müvafiq olaraq **اونى** *onı* (32b), **اونكا** *oŋa* (32a), **اوننك** *onıŋ* (31a) kimi yazılmışdır. Birinci şəxsin təkini bildirən əvəzlik isə əlyazmada yönlük halda yalnız **بنكا** *baŋa* (11b, 30b və s.) şəklində yazılmışdır. İkinci şəxsin təkini bildirən əvəzlik də yönlük halda oxşar şəkildədir: **سنكا** *saŋa* (64a).

**C. ت - د** Bu hərf əvəzlənməsi də əlyazmada yalnız bir sözdə müşahidə olunur: **دورت - دوردنجى** *dört/dördünci* (5a, 5b). Nümunədən göründüyü kimi, burada «dört» sayının kökündəki «te» hərfindən sonra sait səs işləndiyi üçün [t] səsi özünün cingiltili qarşılığına çevrilmiş və bu, yazıda da öz ifadəsini tapmışdır. Bu xüsusiyyət konkret olaraq **ت - د** hərf

əvəzlənməsi şəklində «Kitabi-Dədə Qorqud»da (**20**, 54-55) və «Şühədanamə»də də (**56**,79) qeydə alınmışdır. Maraqlıdır ki, «Şühədanamə»də bu hərf əvəzlənməsi bəzi ərəb mənşəli sözlərdə də özünü göstərir (**56**, 79).

**Ç. و- ى** Bu hərf əvəzlənməsini əlyazmada iki sözün nümunəsində müşahidə etmişik: **اوغلو - اوغلى** *oğlu/oğlı* (26a, 72b), **يارون - يارين** *yarun/yarın* (72b). Məlum olduğu kimi, bu sözlərdən birincisi türk mətnlərində daha çox **اوغلى** *oğlı* qrafik variantında, ikincisi isə, əksinə **يارين** *yarın* (sabah) şəklində işlənir. Əlyazmada *«gördüm»* sözündəki şühudi keçmiş zaman şəkilçisində də bu hərf əvəzlənməsi özünü göstərir: **كوردوم - كورديم** *gördüm/gördim* (71 b). Eyni vərəqdə (71 b) müxtəlif qrafik variantda olan bu sözü katib yenə də həmin vərəqdə **كوردم** *gördüm* şəklində yazmışdır. Bu hərf əvəzlənməsi «Şühədanamə»də də cəmi bir neçə sözün sonunda qeydə alınmışdır (**56**, 80).

3. Əlyazmada çağdaş ədəbi dilimizlə müqayisədə bəzi sözlərdə dodaqlanan saitləri ifadə edən hərflərə üstünlük verilməsi halları da diqqəti cəlb edir. Bu hal daha çox feillərdə, həm də əsasən müxtəlif feil şəkillərinin morfoloji göstəricilərinin qrafık ifadəsində özünü göstərir: **قالور** *qalur* (62b), **آيريلور** *ayrılur* (60a), **اوروب** *urub* (61a), **دوتوب** *dutub* (62b), **اكلدوب** *əglədüb* (21a), **كسيلسون** *kəsilsün* (57b), **كورمسون** *görməsün* (58a), **بوله جقدور** *bulacaqdur* (32b), **توكوله جقدور** *tökülәcəqdür* (32b), **أپاروروز** *aparuruz* (72b), **ويرميشوز** *vermişüz* (74b) və s. Bu hal bəzi feil köklərində, eləcə də digər nitq hissələrinə aid sözlərdə də müşahidə olunur. **تانورام** *tanuram* (65a), تاپشورديلار *tapşurdılar* (67b), **كتورمديم** *gətürmədim* (39a), **ياپوشد وم** *yapuşdum* (75a), **قارشوسونده** *qarşusunda* (74a), **آرتوقدور** *artuqdur* (74a), **دلونكى** *dilüŋi* (75b), **قيزونك** *qızuŋ* (68b), **آچوق** *açuq* (66b), **باغلو** *bağlu* (69b), **قانلو** *qanlu* (76a), **كندو** *kəndü* (58b) və s.

4. Orta əsrlərə aid bir sıra türk mətnlərində, o sıradan Azərbaycan ərazisində köçürülən əlyazmalarda ayrı-

ayrı eyni sözlərdə [s] səsinin ifadəsi üçün iki hərfdən س *sin* və ص *sad* hərflərindən istifadə olunmuşdur (**20**, 46; **40**, 34). Bu xüsusiyyət «Riyazül-qüds»də yalnız «*su*» sözündə özünü göstərir. Katib bu sözü hətta eyni vərəqdə iki şəkildə yazmışdır: صو – سو (40a). *«Sormaq»* («soruşmaq» mənasında), *«sonra», «sol», «sanmaq»* sözləri isə əlyazmada yalnız ص *sad* hərfi ilə yazılmışdır (70a, 70b, 71a və s.). Bu xüsusiyyət də əski yazı ənənəsinin *«qalığı»* kimi dəyərləndirilə bilər (bax: **56**, 81-83). Qeyd edək ki, görkəmli dilçi alimlərdən prof. Əbdüləzəl Dəmirçizadə «Kitabi-Dədə Qorqud»da türk mənşəli sözlərin bəzən س ilə, bəzən də ص ilə yazılmasının heç bir elmi əsası olmadığını göstərmişdir (**20**, 46). Prof. Hadı Mirzəzadə də bu məsələni katiblərin «şüursuz münasibəti» ilə izah etmişdir (**45**, 15). Prof. Samət Əlizadə isə hesab edir ki, orta əsr katibləri ərəb yazı qaydalarına əsasən bəzi türk sözlərini şüurlu surətdə *sad* hərfi ilə yazmışlar. Alim bu fıkrini onunla əsaslandırır ki, ərəb dilində söz kökləri خ ، ق ، ط ، ص hərfləri ilə başlanarsa, onlardan sonra yalnız qalın sait işlənməlidir (**27**, 16). Bu fikirlə müəyyən mənada razılaşmaq olar, belə ki, orta əsr katiblərinin *sad* hərfi ilə yazdıqları türk mənşəli sözlərin çoxu qalın saitlidir. Məsələn: *su, sol, sonra, sandı, sordı* və s. Maraqlıdır ki, XVI əsr Azərbaycan şairi-mütərcimi Həzininin ərəbcədən etdiyi «Hədisi-ərbəin» tərcüməsinin əlyazmasında katib qafiyə yerində işlənən «*sorıla*» və «*sürilə*» sözlərindən birincisini *sad,* ikincisini isə *sin* hərfilə yazmış və fikrimizcə bununla onların fərqli tələffüzünü, yəni birincidə qalın saitlərin, ikincidə isə incə saitlərin işləndiyini nəzərə çatdırmaq istəmişdir (bax: **55**, 68). Bununla belə, orta əsr katiblərinin çoxu, o sıradan «Şühədanamə»nin mütərcimi-katibi Məhəmməd Hüseyn Katib Nişati bu məsələdə tam sərbəstliyə yol vermiş, eyni sözləri gah *sin,* gah da *sad* hərfi ilə yazmışdır (bax: **56**, 81-83). Nişati hətta *hanğı* sözünü də həm ح *he,* həm də ه *ha* hərfi ilə yazmışdır: حانغى - هانغى (17b, 25b). Deməli, bu hal ötəri səciyyə daşımış və

orta əsr Azərbaycan-türk katibləri ərəb dilinin imla qaydalarına yalnız müəyyən hallarda və qismən əməl etmişlər.

5. Əlyazmada qoşa samitli (geminatlı) türk mənşəli sözlərin bəziləri təşdid işarəsi ilə yazılmış, bəzi sözlərdə isə bunun ifadəsi üçün həm iki hərfdən, həm də təşdiddən istifadə edilmişdir. Məsələn: **قوللّرى** *qolları* (68a), **اللّى** *əlli* (80b), **يساوللّر** *yasavullar* (71a), **اللّرى** *əlləri* (75b). Maraqlıdır ki, bu hal yalnız qoşa *ll* samitli sözlərdə özünü göstərir. «Kitabi-Dədə Qorqud»da və «Hədiqətüs-süəda»da da qoşa *ll* samitli *bəllü, əllər* sözlərinin yazılışında iki hərflə yanaşı, təşdiddən də istifadə edilmişdir (**78**, 50; **92**, I, 88a, 59a). «Şühədanamə»də isə bu və bu kimi sözlərin yazılışında ya iki hərfdən, ya da müvafiq hərfin üstündə qoyulan təşdiddən istifadə olunmuşdur (**56**, 89). «Riyazül-qüds»də qoşa samitli *yeddi, səkkiz, doqquz* sözlərinin yazılışında isə qoşa samiti bildirmək üçün yalnız təşdiddən istifadə edilmişdir (37b, 46a, 65b). Bu sözlər bəzən təşdidsiz də yazılmışdır (63b). Katib **كتدّى** *getdi* (32a) və **ايتديلر** *etdilər* (43b) sözlərində də *te* hərfinin üstündə təşdid işarəsi qoymuşdur. Bunu, yəqin ki, katibin mexaniki səhvi kimi qəbul etmək olar. Qoşasamitli ərəb sözlərində də katib əksər hallarda təşdiddən istifadə etmişdir. Məsələn: **امّا** *amma* (73 a), **متاثّر** *mütəəssir* (68a), **مطهّر** *mütəhhər (68b),* **تحسّر** *təhəssür* (68b), **تعدّى** *təəddi* (68b) və s. Yeri gəlmişkən qeyd edək ki, əlyazmanm katibi ərəb və fars mənşəli sözlərin yazılışında əsasən dəqiqliyə əməl etmiş və bu məsələdə heç bir sərbəstliyə yol verməmişdir. Əlyazmada yalnız bəzi hallarda ərəb mənşəli bir-iki sözün yazılışı ənənəvi qrafik variantından fərqlənir. Məsələn, *«zalım», «hərəkət»* sözlərini katib, bir qayda olaraq, **حركت , ظالم** kimi yazmışdır. Əlyazmada bu sözlərin fərqli qrafik variantına da rast gəlirik: **ظاليم** (73a), **حره كت** (71a). Katib bu sözlərdən birincisində [*i*] səsini, ikincisində isə [*ə*] səsini bildirmək üçün müvafiq olaraq **ي** *ya* və **ه** *ha* hərflərindən istifadə etmişdir. Katib bir yerdə isə ərəb mənşəli «*nəzarə*» (baxış, müşahidə) sözünü yönlük halda yazarkən sözün sonundakı **ه** *ha* hərfini buraxmışdır: **نظاريه**

*nəzarəyə* (69a). Bu hal «Şühədanamə»də də özünü göstərir. Belə ki, katib *nöqtə*, *ləhzə* kimi ərəb mənşəli sözləri hallandırdıqda sondakı *ha* hərfini buraxır: **نقطدن** *nöqtədən* (**75**, 66), **لحظده** *ləhzədə* (**75**, 67) və s. Orta əsrlərə aid digər Azərbaycan yazılı abidələrində də ərəb mənşəli bəzi sözlərin ənənəvi qrafikasından fərqli şəkildə yazılması halları müşahidə olunur. Məsələn, XV əsr Azərbaycan tərcümə abidəsi Şirazinin «Gülşəni-raz» tərcüməsinin Sankt-Peterburq əlyazmasının (XVI əsr) katibi ərəb mənşəli *«qüdrət», «vərəq»* sözlərində [*ə*] səsini bildirmək üçün həmin sözlərə **ه** *ha* hərfini də əlavə etmişdir: **وره غ , قدره ت** (5b, 9b). Katib ikinci sözün yazılışında isə **ق** *qaf* hərfi əvəzinə **غ** *ğəyn* hərfini işlətmişdir (bax: **57**, 38).

«Riyazül-qüds»ün əlyazmasının səciyyəvi qrafik-orfoqrafik əlamətləri ilə bağlı bu qısa qeydlərimizə yekun olaraq onu da əlavə edək ki, araşdırdığımız nüsxənin orta yüziliklərə aid mətnlərlə imla xüsusiyyətləri baxımından müqayisəli təhlili maraqlı nəticələr əldə etməyə imkan verir. Bu məsələ üzərindəki ötəri müşahidələrimiz belə bir qənaətə gəlməyə əsas verir ki, XIX yüzilliyə aid mətnlərlə orta əsrlərə aid əlyazmalarda orfoqrafiya məsələlərində elə bir ciddi fərq yoxdur. Bu fakt isə sübut edir ki, Azərbaycanda klassik ədəbiyyatda olduğu kimi, yazılı ədəbi dildə, eləcə də onun tərkib hissəsi olan orfoqrafiyada da əski ənənələrə bağlılıq və varislik məsələsi XIX yüzillikdə də möhkəm və güclü olmuş və əyani şəkildə özünü göstərmişdir.

### *1.4 “Riyazül-qüds”ün yazılma səbəbi və qaynaqları*

Müsəlman Şərqində klassik kitabyazma ənənəsinə uyğun olaraq, şair və yazıçılar qələmə aldıqları əsərin əvvəlindəki «dibaçə» adlanan giriş hissəsində, bəzən də ayrıca bir başlıq altında, bir qayda olaraq, onun yazılma səbəbini qeyd

edirlər. Məsələn, Füzuli «Hədiqətüs-süəda»nın dibaçəsində bu əsəri imam Hüseynə (ə.) matəm saxlayan türk həmvətənlərinin xahişi ilə qələmə aldığını xüsusi olaraq qeyd edir (bax: **29,** 25). Eləcə də dahi sənətkar «Hədisi-ərbəin» adlı tərcümə əsərinin dibaçəsində bu qırx mənzum hədisi camaatın faydası xatirinə ana dilinə çevirdiyini bildirir. Bəlli olduğu kimi, Füzulinin "Hədisi-ərbəin"i fars-tacik ədəbiyyatının görkəmli nümayəndəsi Əbdürrəhrnan Caminin (1414-1492) fars dilində yazdığı «Çehel hədis» əsərindən tərcümə olunmuşdur (bax: **46**; **55**, 28-30; **96**).

Klassik əsərlərin yazılma səbəbləri sırasında daha çox hökmdarların və ya hakimlərin sifarişi, eləcə də yaxın dostların xahişi də göstərilir. A.Bakıxanov da bu ənənəyə əməl edərək «Riyazül-qüds»ün dibaçə hissəsində əsərin yazılma səbəbini açıqlayır. Dibaçənin lap əvvəlində ənənəyə görə Allah-taalanı və sonuncu peyğəmbəri mədh edən A.Bakıxanov daha sonra oxucularına bu dünyanın müvəqqəti, keçici və fani olduğunu xatırladaraq onu insanlar üçün bir «*imtahan sərmənzili*» kimi dəyərləndirir və əsl mövzuya bir növ körpü salır. A.Bakıxanov daha sonra bəladan söz açaraq Allah-taalanın özünün sevimli bəndələrini (peyğəmbərləri) sınaqdan keçirmək üçün onlara müsibətlər göndərdiyini və bu baxımdan sonuncu peyğəmbərin çəkdiyi cəfaların daha çox və üstün olduğunu dilə gətirir və bilavasitə əsl mətləbə yaxınlaşır. İndiyədək dünyada baş verən bəlalar içərisində ən dəhşətlisinin Kərbəla vaqiəsi olduğunu qeyd edən A.Bakıxanov bu qanlı faciəni anmağın fəzilətlərini, faydalarını yüksək dəyərləndirərək yazır ki, «*bu diyarın əhli kim, Qübbə deməklə məşhur olan məmləkətdir*», əbədi səadət qazanmaq təmənnası ilə hər il matəm məclisi qurur və Kərbəla vaqiəsinin anma mərasimini keçirir. Həmin məclislərdə oxunmaq üçün türk dilində ən məşhur məqtəl kitabının *«Mövlana əfsəhül-mütəkəllimin Məhəmməd Füzuli Bağdadinin «Hədiqətüs-süəda»* əsəri olduğunu qeyd edən A.Bakıxanov bu kitabı «*bir məcmueyi-rəngin və güldəsteyi-nigarin*» kimi yüksək dəyərləndirir. Bununla

belə, o yazır ki, «*amma ixtilafi-rəvayət səbəbindən əksəri-əhli-dərk ona mütməin olmazlar*» (güvənməzlər, inanmazlar). Bu mövzuya həsr olunmuş kitabların çoxunun ərəb və fars dillərində yazıldıqlarını vurğulayan A.Bakıxanov qeyd edir ki, türk tayfasından olan insanlar həmin dilləri bilmədikləri üçün o kitabların ləzzətindən məhrum qalırlar.

Buna görə də ilham pərisi şairə üz tutaraq ondan xahiş edir ki, Kərbəla vaqiəsini və digər hadisələri daha mötəbər şəkildə qələmə alan Mövlana Məhəmməd Bağır ibn Məhəmməd Tağının (Məclisinin tam adı belədir) «Cəlaül-üyun» kitabını *«türki istilahına tərcümə qılub bir kitabi-müxtəsəri-müfid»* tərtib etsin. A.Bakıxanov bu işin *«füsəhayi-türk»* üçün faydalı olacağını və onun nəticəsi olaraq özünün *«əbədi dövlət»* qazanacağını da bildirir. Burada özünü **Abbasqulu bin Mirzə Məhəmməd xan** kimi təqdim edən Bakıxanov kitabın dibaçəsində həmçinin üzünü İlahiyə tutaraq, Yaradandan bu yolda ona kömək və yardım göstərməsini dilə gətirir:

*Ya Rəb, bu əmri baisi-təhsili-kam qıl,*
*Tövfiqini bənim ilə rəfiqi-müdam qıl.*
*Sərkeşi-səməndi-xaməmişkini ram edüb,*
*Teyyi-təriqi-mətləb içün tizkam qıl.* (4b)

Beləliklə, bu deyilənlərdən bir neçə mətləb aydın olur: birincisi, A.Bakıxanov «Riyazül-qüds»ü Qubada yaşayarkən ərsəyə gətirmişdir. İkincisi isə, o, «Riyazül-qüds»ü prof. F.Qasımzadənin yazdığı kimi, Qubada təziyə məclisi quranların tapşırığı ilə deyil, öz təşəbbüsü ilə, ümumiyyətlə, *«füsəhayi-türk»ün* istifadəsi üçün qələmə almışdır. Üçünsü isə, şairin özünün yazdığı kimi, bu kitabını o, Məhəmməd Bağır Məclisinin «Cəlaül-üyun» kitabından tərcümə yolu ilə müxtəsər şəkildə tərtib etmişdir. Yeri gəlmişkən qeyd edək ki, A.Bakıxanov «Cəlaül-üyun»dan danışarkən bu əsərdə *«bəzi rəvayətlərin ərəbdən farsiyə nəql»* olunduğunu da göstərir. A.Bakıxanov «Riyazül-qüds»ün dibaçəsində ərsəyə gətirdiyi kitabının adını da göstərir: *«Əzhar və rəvayih tək əlfaz və məani əxbari-qüdsiyyə ilə*

*müzəyyən olduğundan «Riyazül-qüds» deməklə mövsum etsələr, namünasib olmaz».* Müəllif burada qələmə aldığı kitabda sözlərin və mənaların ətirli gül-çiçəklər kimi müqəddəs xəbərlərə bənzədiyini nəzərə çatdırır, buna görə də onun «**Cənnət bağları**» («Riyazül-qüds»ün lüğəvi mənası belədir) adlarıdırılmasını məqsədəuyğun sayır. A.Bakıxanov aşağıdakı şeir parçasında isə əsərinin adı ilə yanaşı, onun yazıldığı tarixi də qeyd edir:

*Zəmini*[*] *-Kərbü bəla əhli-qüdüs qanından*
*Xəzandə güllər açüb, əltafi*[**] *-hədayiqdir.*
*Edər vəqayeyi-Kərbü bəlanı çü zahir*
*«Riyazi-qüds» demək bu kitabə layiqdir.*
*Riyazi-qüds kimi, filhəqiqə, bu gülşən*
*Lətayif ilə dolu məzhəri-həqayiqdir.*
*Dəxi bu vəchi-səbəbdir*[***] *ki, sali-tarixi*
*Hesabda «li Riyazül-qüdüs» mütabiqdir.*
*Olub tənasüb üzündən təxəllüsüm Qüdsi*
*Ki, cəm'i bir-birə bu rəmzlər*[****] *müvafiqdir.*[*****]
(5a)

A.Bakıxanov qitə şəklində yazdığı bu şeirinin dördüncü beytindəki *«li Riyazül-qüdüs»* ifadəsi ilə əbcəd hesabına uyğun olaraq kitabın 1236/1820-ci ildə tamamlandığını göstərir. Qeyd edək ki, bu fakta prof. F.Qasımzadə və M.Sultanov da diqqət yetirmişlər (**37**, 101; **15**, 6). Bununla belə, prof. F.Qasımzadə qitə şəklində olan bu şeir nümunəsinin ilk beytini buraxmış (görünür, bu məsələdə dövrün ideoloji qadağaları öz işini görmüşdür), M.Sultanov isə şairin «Seçilmiş əsərləri»nə yazdığı «Müqəddimə»də yalnız əbcəd hesabı ilə əsərin yazılma

---

[*] Əlyazmada: *zəminü*.
[**] Əlyazmada: *əltəf (?).*
[***] Prof.F.Qasımzadənin kitabında: *"vəchə səbəbdir".* (**37**, 101)
[****] Şairin *"Seçilmiş əsərləri"*ndə *"rəmz ilə"*. (15, 434)
[*****] Prof.F.Qasımzadənin kitabında bu misra belədir:
*Ki cəm'i bir yerə bu rəqəm müvafiqdir.* (37, 101)

tarixi qeyd edilən misranı göstərmiş, kitabın sonunda verdiyi «Riyazül-qüds»dən seçmə mənzum parçalarda isə onun yalnız son üç beytini transfoneliterasiya etmişdir (**15**,433-434).

A.Bakıxanov yuxarıdakı qitənin son beytində təxəllüsünün Qüdsi olduğunu da bildirir və təxəllüsünün əsərin adı ilə bağlılığına da işarə edir. Bununla belə, istər prof. F.Qasımzadə, istərsə də M.Sultanov xüsusi olaraq qeyd edirlər ki, A.Bakıxanov «Riyazül-qüds»dən əvvəl də bədii yaradıcılıqla məşğul olmuşdur (**37**,101; **15**, 6). «Riyazül-qüds»ün istər bədii sənətkarlıq xüsusiyyətləri ilə seçilən qafiyəli nəsrini, istərsə də nəsr arasında verilən bitkin şeir nümunələrini nəzərə alaraq, biz də bu fikrə qoşulur və hesab edirik ki, M.Sultanov: *«A.Bakıxanov lap gənc yaşlarından ana dilində şeir yazmağa başlamış və bu şeirlərin bir qismini sonradan «Riyazül-qüds»ə daxil etmişdir»* (**67**, 6) mülahizəsində tamamilə haqlıdır. Bunu nəzərə aldıqda A.Bakıxanov Qüdsi təxəllüsünü də, çox güman ki, «Riyazül-qüds»ü qələmə almazdan qabaq qəbul etmiş və ilk öncə lirik şeirlərində onu işlətmişdir. Bu məsələ ilə bağlı onu da qeyd edək ki, «Riyazül-qüds»ün dibaçəsində olan:

*Bəsteyi-dami-ələm, pamali-ənduhi-məlal,*
*Bülbüli-gülzari-matəm Qüdsiyi-şuridəhal* -

beyti (4a) müəllifin «Kitabi-Əsgəriyyə» adlı hekayəsində də eynilə vardır. Sadəcə olaraq "Kitabi-Əsgəriyyə"də ikinci beytdəki "*matəm*" sözü mövzuya uyğunlaşdırılaraq "*möhnət*" şəklində işlənmişdir (bax: **36**,1, 294; **15,** 121). Bu fakt isə belə bir qənaətə gəlməyə əsas verir ki, A.Bakıxanov, ümumiyyətlə, lirik şeirlərini müstəqil şəkildə yazdığı kimi, sonralar onları yeri gəldikcə ayrı-ayrı əsərlərinə də daxil etmişdir. Buna sübut olaraq qeyd edək ki, A.Bakıxanov *«Dil eşq yolunda zar olubdur»* misrası ilə başlayan doqquz beytlik məşhur qəzəlinin ilk beş beytini bir qədər dəyişdirilmiş şəkildə «Kitabi-Əsgəriyyə» hekayəsinə daxil etmişdir. Maraqlıdır ki, müəllif bu qəzəlin mətlə beytindəki Qüdsi sözünü (təxəllüsünü) «Kitabi-Əsgəriyyə»də baş qəhrəmanm adı ilə (Əsgərlə) əvəzləmişdir (bax: **15,** 126 və

242). Fikrimizcə, «Riyazül-qüds»də verilən aşağıdakı şeir parçası da həmin qəzəlin ilk üç beytinin bir qədər dəyişdirilmiş, fərqli variantıdır:

*Dil dərd ilə biqərar olubdur,*
*Ləb ah ilə pürşərar olubdur.*
*Qan rəngi dutub üzari-zərdim,*
*Həngami-xəzan bəhar olubdur.*
*Dövrani-fələk cəfalər eylər,*
*Can düşməni ruzigar olubdur*. (77a)

Müqayisə üçün şairin divanındakı həmin qəzəlin də ilk üç beytini veririk:

*Dil eşq yolunda zar olubdur,*
*Bir gül həvəsində xar olubdur.*
*Xunabə dönübdü rəngi-zərdim*
*Bu gülşən üçün bəhar olubdur.*
*Dövrani-fələk müxalif olmuş,*
*Can düşməni-ruzigar olubdur.* (**15**, 242)

Göründüyü kimi, qəzəlin son iki beyti ilə «Riyazül-qüds»dəki şeir parçasının müvafiq beytləri arasında açıq-aşkar bir yaxınlıq vardır. Bunlardan hansının birinci yazılmasını qəti söyləmək, təbii ki, çətindir və ayrıca araşdırma tələb edir.

Yeri gəlmişkən bu məsələ ilə bağlı daha bir maraqlı faktı nəzərə çatdırmaq istəyirik. A.Bakıxanovun «Riyazül-qüds» və «Kitabi-Əsgəriyyə» əsərlərininin mətnləri üzərində apardığımız müqayisə nəticəsində məlum oldu ki, birincidə olan üç şeir parçası eynilə müəllifin ikinci əsərində də vardır. Həmin şeir parçasından ikisi «Riyazül-qüds»də imam Hüseyn (ə.) haqqındakı beşinci babdadır. Onlardan birincisi imamın (ə.) qızı Səkinənin dilindəndir:

*Yetim olan kəsə, əlbəttə, qəmgüsar olmaz,*
*Zəlili-aləm olur, izzü etibar olmaz.*

*Bəlalər içrə qalur dərbədər, dəmi keçməz*
*Ki, bağrı qanə dönüb didə əşkbar olmaz.* (62b)

Bu şeir nümunəsi «Kitabi-Əsgəriyyə»də tam eyni şəkildə Əsgərin müəlliminin dilindən verilmişdir (bax:**15**, 131).

«Riyazül-qüds»dəki ikinci şeir nümunəsi imam Zeynəl-abidinin (ə.) dilindəndir:

*Büibül necə gülzar ətəgindən əlin üzməz,*
*Şivən dili-bimar ətəgindən əlin üzməz.*
*Qanilə boyar səfheyi-rüxsarimi gül-gül,*
*Dil dideyi-xunbar ətəgindən əlin üzməz.* (69a)

Bu nümunə «Kitabi-Əsgəriyyə»də Əsgərin dilindəndir və eynilə bu beytlərlə başlanır və daha üç beytlə davam etdirilir (bax: **15**, 127).

Üçüncü nümunə isə «Riyazül-qüds»ün «Xatimə» hissəsində olan aşağıdakı şeir parçasıdır:

*Əlhəmdü li vəhibül-ətiyyə,*
*Vəşşükr li xaliqül-bəriyyə...*
*Kim, xameyi-mişkbarim etmiş,*
*İzhari-məratibi-əliyyə.*
*Bir türfə kitab edüb mürəttəb,*
*Əhbab içün etmişəm hədiyyə.*
*Şayəd ki, vəsileyi-nicatım*
*Olsun bu ümuri-mə'nəviyyə.* (91 a)

Bu misraların da hamısı eynilə «Kitabi-Əsgəriyyə»nin sonunda verilmişdir (**15**, 132). Sadəcə olaraq, «Kitabi-Əsgəriyyə»də yuxarıdakı sonuncu beytdən əvvəl bu beyt də vardır:

*Tovfiqi-səadətilə olmuş,*
*İtmam: «Kitabi-Əsgəriyyə».* (**15**, 132)

Bu fakt A.Bakıxanovun öz qələmininn məhsulu olan eyni li-rik şeirlərindən müxtəlif əsərlərində istifadə etdiyini açıq-aşkar

şəkildə sübut edir. Qeyd edək ki, Yaxın Şərqin digər klassik sənətkarlarının əsərlərində də bu cür oxşar hallara rast gəlirik. Məsələn, məşhur İran şairi Sədi Şirazi (1209-1291) bir sıra lirik şeirlərini sonradan müəyyən düzəlişlərlə «Gülüstan» əsərinə daxil etmişdir (**76**, 18). Eləcə də M.Füzulinin «Hədiqətüs-süəda» əsərində olan şeir parçalarının bəziləri azacıq fərqli şəkildə şairin divanında da vardır (**26**, 80). Dahi sənətkar həmçinin «**Dər tərifi-Qazi Əlaəddin və viladəti-qaziyi-məzkur**» adlı nəsr əsərinə «Hədiqətüs-süəda» kitabında olan bəzi şeir parçalarını daxil etmişdir (**43**, 143).

Beləliklə, «Riyazül-qüds»ün dibaçəsi ilə ümumi tanışlıq göstərir ki, A.Bakıxanov tarix etibarilə ilkin hesab edilən bu əsərini Qubada yaşayarkən özünün şəxsi istəyi ilə türk soyundan olan həmvətənlərinin istifadəsi üçün qələmə almışdır.

A.Bakıxanov «Riyazül-qüds» üçün başlıca qaynaq olaraq Məclisinin fars dilində yazdığı «Cəlaül-üyun» kitabını seçmiş, daha doğrusu, irəlidə görəcəyimiz kimi ondan müəyyən hissələri sərbəst şəkildə tərcümə etmişdir. Bununla belə, «Riyazül-qüds»ün mətni üzərindəki müşahidələr göstərir ki, müəllif kitabda digər qaynaqlardan da, o sıradan dahi sələfi Füzulinin «Hədiqətüs-süəda» əsərindən də yeri gəldikcə uğurla bəhrələnmişdir. Buna sübut olaraq elə təkcə belə bir faktı qeyd etmək kifayətdir ki, Məclisinin kitabı yalnız nəsrlə olduğu halda, Füzulinin sözügedən əsəri isə nəsrlə nəzmin növbələşməsi şəklində qurulmuşdur. Deməli, A.Bakıxanov «Riyazül-qüds»dəki hadisələri və əsərin məzmununu əsasən «Cəlaül-üyun»dan, onun quruluşunu, formasını isə «Hədiqətüs-süəda»dan əxz etmiş - bir sözlə, yeri gəldikcə hər iki əsərdən yararlanmış və kitabına digər qaynaqlardan götürdüyü kiçik əlavələri də daxil etmişdir.

A.Bakıxanov istifadə etdiyi qaynaqlardan birinin «Rövzətül-vaizin» («Vaizlərin cənnət bağçası») əsəri olduğunu da göstərir. O, həzrət Fatimə (ə.) haqqında olan ikinci babın əvvəlində yazır: *«Rövzətül-vaizin»də və özgə kitablarda*

*məsturdur kim, həzrəti-Fatimə əleyhassəlamın zəmani-mərəzi qırq gün imtidad bulub...»* (1 Ib). Əsərin beşinci babının əvvəlində də o, imam Hüseyn (ə.) haqqında yazılan əsərlərin adını çəkir və bu sırada «Rövzətül-vaizin»i də qeyd edir: *«Ol cümlədəndir laleyi-xunini-cigəri-«Hədiqətüs-süəda» və güli-canpərvəri-«Rövzətüş-şühəda» və ətri-dilavizi-güli-reyhan və mənbəi-«Eynül-büka» və «Cəlaül-üyun»i-əhli-cəhan və pirayeyi-novbəhari-«Rövzətül-vaizin» və sultani-diyari-«Məqatilüt-talibin»*[*] *...»* (24a). A.Bakıxanovun burada adını çəkdiyi «Rövzətül-vaizin» Əbu Əli Məhəmməd Fəttal Nəysəburi əl-Farisinin (V/XI əsr) ərəb dilində yazdığı əsəridir (**88**, I, 618-619). XVI yüzillikdə yaşamış Əli bin Həsən Zəvəri onu fars dilinə tərcümə etmişdir. A.Bakıxanovun burada adını çəkdiyi «Eynül-büka» («Ağlar göz») əsəri isə Məhəmməd Tağı Bürucərdi Kaşaninin qələmindən çıxmışdır. Mənbələrdə bu əsərin yazılma tarixi fərqli göstərilir: 999/1590-91, 1099/1687-88 və 1199/1784-85 (**88**,1, 641-642). Bu sırada ən sonda adı çəkilən «Məqatilüt-talibin» əsərinin müəllifi isə yuxarıda qeyd etdiyimiz kimi, Əbül-Fərəc İsfahanidir. İxtisarla verdiyimiz bu nümunədə A.Bakıxanov Məclisinin ərəb dilində yazdığı «Həqqül-yəqin» əsərinin də adını çəkir. Bu fakt gənc A.Bakıxanovun «Riyazül-qüds»ü qələmə alarkən Kərbəla vaqiəsi mövzusunda müsəlman Şərqində geniş yazılmış üç dildə: ərəbcə, farsca və türkcə kifayət qədər əsər oxuduğunu və bu sahədə geniş məlumatı olduğunu göstərir.

Onu da əlavə edək ki, A.Bakıxanov «Riyazül-qüds»ün dibaçəsində son olaraq əsərin on dörd babdan ibarət olmasını göstərir və bunun «məsum» (günahsız) şəxsiyyətlərin sayı ilə əlaqədar olduğunu vurğulayır: *«Riyayəti-ə'dadi-əsamiyi-mə'sumin sələvatullah əleyhim əcməin edüb, on dörd bab qərar verdim»* (5a). Məlum olduğu kimi, daha çox **«çəhardəh məsum»** (on dörd günahsız) adı ilə tanınan müqəddəs

[*] Əlyazmada: *Məqatilüt-taibin (?).*

şəxsiyyətlər sonuncu peyğəmbər (s.), həzrət Fatimə (ə.) və on iki imamdır (ə.). Əsərin dibaçəsində babların adları da bir-bir göstərilir.

### *1.5. «Riyazül-qüds»ün mövzusu və məzmunu, quruluşu və janrı*

«Riyazül-qüds», yuxarıda qeyd edildiyi kimi, şəhidlik mövzusunda qələmə alınmış bir əsərdir, əsasən, imam Hüseynin (ə.) Kərbəlada şəhidlik zirvəsinə çatmasına həsr olunmuşdur. Bu mövzuda qələmə alınan digər məqtəl kitabları kimi, «Riyazül-qüds» əsərində də əsas mövzu ilə - Kərbəla müsibəti ilə yanaşı, əsərin baş qəhrəmanı imam Hüseynin (ə.) ən yaxın adamlarından - babası Məhəmməd peyğəmbər (s.), anası həzrət Fatimə (ə.), atası imam Əli (ə.), qardaşı imam Həsəndən (ə.) və digər imamlardan da bəhs olunur. Kitabın ilk babı Məhəmməd peyğəmbərin (s.) həyatı haqqındadır (6a-9a). Əsərdəki sonuncu bab istisna olmaqla, bu bab yeganə bölümdür ki, onun tərkibində heç bir fəsil yoxdur. Burada peyğəmbərin (s.) vəfatı ilə bağlı epizodlardan, yəni o həzrətin yaxın adamları ilə vidalaşması, Zülfəqar adı ilə tanınan məşhur qılıncını və Düldül adlı atını həzrət Əliyə (ə.) bağışlamasından və vəsiyyətlərindən danışılır.

Həzrət Fatimə (ə.) haqqında olan ikinci bab (9a-13a) üç fəsilə bölünür: birinci fəsildə islamda xüsusi yer tutan bu müqəddəs qadının doğumu və böyüməsindən, ikinci fəsildə sevimli atasının vəfatı ilə bağlı qəmli-hüznlü günlərindən,üçüncü fəsildə isə vəfatından qısaca söz açılır. İki fəsildən ibarət olan üçüncü bab (13a-18a) imam Əli (ə.) haqqındadır: babın birinci fəsilində imamın doğumu və

əzəmətindən, ikinci fəsildə isə şəhadətindən bəhs olunur. İmam Həsən (ə.) haqqında olan dördüncü bab (18b-23a) quruluşuna görə ikinci baba oxşayır və bu da üç fəsildən ibarətdir. Burada sıra ilə imamın doğumu, müsibətli günləri və şəhadəti təsvir olunur.

Əsərin həcmcə ən böyük babı bilavasitə imam Hüseynə (ə.) həsr olunmuş beşinci babdır (23a-78b). Kitabın ümumi həcminin yarısından çoxunu təşkil edən bu bab doqquz fəslə bölünür ki, onun da həcmcə ən böyük fəsli Aşura gününə həsr olunmuş səkkizinci fəsildir (48a-67a). Kərbəla vaqiəsinin geniş təsviri verilən bu fəsildə əvvəlcə imamın (ə.) yaxın silahdaşlarının (Hürr, Abdullah Kəlbi, Bərir bin Həsin, Həbib Müzahir, Ömər bin Xalid, Yəhya ibn Müslim, Qasım bin Həsən, Abdullah ibn Əli və b.) şəhadətindən danışılır. Maraqlıdır ki, burada bir türk qulamının igidliyindən də bəhs olunur (56b). Yeri gəlmişkən qeyd edək ki, Füzulinin «Hədiqətüs-süəda»sının eyni hissəsində (təbii ki, həm də Kaşifinin «Rövzətüş-şühəda»sında) türk tayfasından olan həmin qulam Muslim Azərbaycani kimi təqdim olunur və onun, eləcə də oğlunun Kərbəla vaqiəsində şəhid olmasından danışılır (**29**, 242-243). «Riyazül-qüds»ün bu fəslindəki ən təsirli səhnələrdən biri imamın (ə.) qardaşı - dəstənin ələmdarı (bayraqdarı) Abbas bin Əlinin və imamın böyük oğlu Əli Əkbərin igidliyi və şəhadətindən bəhs edilən hissələrdir. Burada, eləcə də bütün əsərdə başlıca diqqət isə, təbii ki, imam Hüseynin (ə.) islam və düzlük, haqq və ədalət uğrunda apardığı mübarizədə dönməzliyi və qətiyyətinin, bu yolda çəkdiyi müsibətlərin və nəhayət, şəhidlik zirvəsinə yüksəlməsinin-mənəvi qələbəsinin bədii şəkildə ifadəsinə yönəldilmişdir. Beşinci fəslin əvvəlki fəsillərində isə imam Hüseynin (ə.) doğumu, fəziləti və kəramətlərindən, imam üçün ağlamağın savabından, şəhadətinin öncədən bəzi peyğəmbərlərə məlum olmasından, imamın Mədinədən Məkkəyə, oradan da İraqa getməsi və əmisi oğlu Müslim bin Əqilin şəhid

olmasından bəhs olunur. Bu babın sonuncu fəslində Əhli-beytin digər üzvlərinin başlarına gələn əhvalatlardan danışılır.

Kitabın sonrakı bablarında digər imamların həyatı və vəfatları (eləcə də şəhadətləri) ilə bağlı hadisələrdən bəhs edilir. Sonuncu bab istisna olmaqla, bu bablar da bir neçə fəslə bölünür. Maraqlıdır ki, imam Musa Rza (ə.) haqqında olan onuncu bab əvvəlki bablardan həcminin nisbətən böyüklüyünə görə fərqlənir (83a-86a) və dörd fəslə bölünür. Görünür, bu məsələdə səkkizinci imamın (ə.) qürbətdə - Xorasanda şəhid olması və məqbərəsinin burada ziyarət yeri olması da müəyyən rol oynamışdır.

«Riyazül-qüds»ün məzmunu və bölmələri ilə bağlı qısa məlumatdan göründüyü kimi, kitabda şəhidlik məsələsinə daha geniş yer verilmişdir və onun mərkəzində Kərbəla faciəsinin bədii şəkildə təsviri dayanır. Əsərin bütün bölümlərində qəmli və hüznlü hadisələrin, faciəli və müsibətli anların təsvirinə daha geniş yer verilmişdir. Digər məqtəl kitablarında olduğu kimi, «Riyazül-qüds»də də imam Hüseynin (ə.) tutduğu yol haqq-ədalət uğrunda mübarizə kimi mənalandırılır və onun şəhadəti qəhrəmanın mənəvi qələbəsi kimi dəyərləndirilir.

«Riyazül-qüds»ün məzmunu, eləcə də quruluşu ilə bağlı onu da qeyd edək ki, digər məşhur məqtəl kitablarında da imam Hüseynin (ə.) Kərbəla müsibəti ilə yanaşı, digər müqəddəs şəxsiyyətlərin müsibət və faciələri də müəyyən dərəcədə işıqlandırılmışdır. Məsələn, Əbülfərəc İsfahaninin «Məqatilüt-talibin» əsərində imam Hüseynin (ə.) Kərbəla faciəsindən əlavə, imam Əlinin (ə.) özünün və qardaşı Cəfər bin Əbu Talibin şəhadətindən də bəhs olunur. Eləcə də Hüseyn Vaiz Kaşifinin on babdan ibarət olan «Rövzətüş-şühəda» əsərində yalnız dörd bab imam Hüseynə (ə.) həsr olunmuşdur. Kitabdakı digər bablarda isə başları bəlalar çəkmiş peyğəmbərlərdən (Adəm, Nuh, İbrahim, Yəqub, Musa, Əyyub, Zəkəriyya, Yəhya), sonuncu peyğəmbərin (s.), həzrət

Fatimə (ə.), imam Əli (ə.) və imam Həsənin (ə.) müsibət və şəhadətdlərindən bəhs olunur. Füzulinin «Hədiqətüs-süəda»sı da bu baxımdan «Rövzətüş-şühəda» ilə tam üst-üstə düşür (bax: **29**, 22-64). Deməli, bu məsələ - imam Hüseynlə (ə.) yanaşı, digər müqəddəs şəxsiyyətlərin faciələri ilə bağlı hadisələrin təsviri «Cəlaül-üyun» əsəri yazılmamışdan öncə də bir ənənə şəklini almışdır. Sadəcə olaraq, Məclisi, bizə məlum olan faktlara görə ilk dəfə olaraq məqtəl kitabındakı babların sayını «on dörd məsum» şəxsə görə bu rəqəmə - on dördə çatdırmışdır. A.Bakıxanov da «Riyazül-qüds»də, təbii ki, «Cəlaül-üyun»un quruluşuna toxunmamış, daha doğrusu, Məclisinin əsərindəki babların sayını və onların adlarını olduğu kimi saxlamışdır.

«Riyazül-qüds»dəki bütün bablar ərəbcə xütbə ilə başlanır, ardınca farsca bir şeir parçası verilir, sonra isə bilavasitə mövzudan danışılır.

Apardığımız hesablamaya görə, «Riyazül-qüds»də 294 şeir nümunəsi vardır ki, onlardan 255-i türkcə, 21-i ərəbcə, 18-i isə farscadır. Əsərdəki şeir parçalarının ümumi həcmi 845 beytə bərabərdir. «Nəzm», «şeir», «qitə», «məsnəvi», «mürəbbe», bəzən də «beyt» və «fərd» başlıqları altında verilən bu şeir parçılarının 711 beyti türkcə, 56 beyti ərəbcə, 78 beyti isə farscadır. Türkcə və farsca şeir praçalarının hamısı A.Bakıxanovun öz qələminin məhsuludur. Ərəb dilində olan şeir parçalarından bəzilərinin müəllifləri göstərilmiş, bir neçəsinin əvvəlində isə ənənəvi *«la ədri»* ("bilmirəm") sözü yazılmışdır. Ərəbcə şeir parçalarından biri isə A.Bakıxanovun özünə məxsusdur. Maraqlıdır ki, üç beytlik həmin şeir parçasının əvvəlində *«li-mütarcimihi* ("mütərcimindir") sözü yazılmışdır (13a). A.Bakıxanov «Riyazül-qüds»də daha bir yerdə özünü «mütərcim» adlandırır ki, bu barədə sonrakı fəsildə bir qədər geniş məlumat veriləcəkdir.

Kitabdakı şeir parçalarının çoxu, təbii ki, əsərin beşinci babındadır: onların ümumi sayı 555 beytə bərabərdir

(504-ü türkcə, 34-ü ərəbcə, 17-i farscadır). Daha çox iki-üç beytdən ibarət olan şeir parçaları bilavasitə əsərdə baş verən hadisələrin məzmunu ilə bağlıdır, onların emosionallığını, təsir gücünü daha da artırmağa xidmət edir. Nəsr arasında verilən bu şeir parçalarının çoxu müəllifin əsərdə baş verən faciəli hadisələrə münasibətini bədii, obrazlı şəkildə ifadə edir, bəziləri isə kitabdakı surətlərin dilindən verilmişdir. Yeri gəlmişkən qeyd edək ki, əsərdəki türkcə şeir parçalarından bir neçəsini (cəmi 71 beyt) M.Sultanov A.Bakıxanovun «Seçilmiş əsərləri»nin sonuna daxil etmişdir (**15**, 433-441). M.Sultanov həmçinin əsərdəki fars dilində olan şeir parçalarından üçünü də (cəmi 13 beyt) sözügedən kitabın sonunda öz bədii tərcüməsində vermişdir.

Əsər ənənəvi qaydada «dibaçə» adlanan giriş hissəsi ilə başlanır və «Xatimə» («Sonluq») ilə bitir. Dibaçədə yuxarıda qeyd edildiyi kimi, əsasən, əsərin yazılma səbəbi açıqlanır, «Xatimə»də isə ona yekun vurulur.

«Riyazül-qüds»dəki bütün babların adları uzun və silsiləli izafət tərkibləri şəklində qurulmuşdur və *«bəyan edər»,* bəzən də *«bildirir»* sözləri ilə bitir. Məsələn, əsərin ilk babı belə adlanır: *«Əvvəlinci bab: Həzrəti-xatəmül-nəbiyyin sənədül-əsfiyayi-seyyidül-mürsəlin Əbilqasim Məhəmməd həbibi-Rəbbül-aləmin sələvatullah əleyhi və alihüt-tahirin vəfatın bəyan edər»* (6a). Əsərin başlıca babı olan beşinci babının adı isə bu şəkildədir: *«Həzrəti-seyyidüş-şühəda və xamisi-alli-əba və imami-zümreyi-süəda və sultani-diyari-Kərbü bəla və güli-bustani-risalət və sərvi-cuybari-imamatü xilafət və laleyi-gülgünkəfəni-çəməni-şəhadət və çirağı-nurbəxşi-dudmani-seyyidüs-səqəleyn və guşvəreyi-ərşi-İlah - Əli Abdullah əl-Hüseyn əleyhissəlamın məratibi-rif'ət və vəqayei-möhnət və keyfiyyəti-şəhadətin bəyan edər»* (23a).

Yeri gəlmişkən qeyd edək ki, «Kitabi-Dədə Qorqud» dastanlarında da hər boy «bəyan edər» sözləri ilə başlanır. Məsələn: *«Salur Qazanın evi yağmalandığı boyı bəyan*

*edər»* (**35**, 42).Füzulinin «Hədiqətüs-süəda» əsərindəki babların adları da bu şəkildədir. Məsələn, «Hədiqətüs-süəda» əsərindəki məzmunca «Riyazül-qüds»ün ilk babına oxşar olan üçüncü babı Füzuli belə adlandırmışdır: *«Həzrəti-seyyidül-mürsəlin keyfiyyəti-vəfatın bəyan edər».* Göründüyü kimi, Füzuli də babın adını izafət tərkibi şəklində qurmuşdur, lakin A.Bakıxanovdan fərqli olaraq, onun adı daha qısa şəkildədir. Qeyd edək ki, bu adlardakı «bəyan» sözü ərəb mənşəlidir və «ifadə etmə»; «aşkar söz»; «şərh»; «yozum»; «açıqlama» mənalarını daşıyır (**101**, 219). Məclisinin «Cəlaül-üyun» əsərində də bütün babların adlarında «bəyan» sözü var, lakin o, əvvəldədir və «dər» önqoşması ilə işlənmişdir: «haqqında» mənasındadır. Məsələn, həmin əsərin birinci babı qısa şəkildə belə adlanır: *«Dər bəyan-e veladət və vəfat-e əşrəf-e kaenat və məxdum-e əhl-e səməvat... Əbolqasem Mohəmməd-e Mostəfa...»* (Kainatın əşrəfi və göy əhlinin ağası Əbülqasım Məhəmməd Mustafanın doğumu haqqında).

A.Bakıxanovun «Riyazül-qüds» əsərinin janrına gəldikdə isə əsər indiyədək araşdırılmadığı üçün, təbii ki, bu məsələyə də, ümumiyyətlə, toxunulmamışdır. Bu məsələ ilə bağlı qeyd edək ki, Kərbəla faciəsinə həsr edilmiş ilk əsərlərdən sayılan Əbu Mixnəfin «Kitabi-məqtəlül-Hüseyn» kitabını Avropa alimləri «ərəb romanı» adlandırmışlar (**94**, XIV). Eyni mövzuda qələmə alınan və məzmun-mündəricə baxımından ona oxşar olan Füzulinin «Hədiqətüs-süəda» əsəri də, əsasən, roman janrına aid edilir (bax: **19**, 53; **54**, 65-67; **66**, 49). Məlum olduğu kimi, «roman» anlayışı hər hansı bir əsərin şəkli xüsusiyyətlərinə, yəni nəsrlə və ya nəzmlə yazılmasına görə deyil, onun həcminə, həyat hadisələrinin geniş və əhatəli, qol-budaqlı və şaxəli olmasına, eləcə də əsərdə iştirak edən surətlərin sayına görə müəyyən edilir (**44**, 157-158). O da məlumdur ki, janr anlayışı, ümumiyyətlə bədii yaradıcılığın tarixən formalaşmış bir növü, daha doğrusu, şəkli sayılır. Məsələn, lirik növün yazılı ədəbiyyatda ən çox işlənən janrları qəzəl, qəsidə, rübai, qitə,

müxəmməs və s.-dir. Yazılı ədəbiyyatda epik növün janrları sırasında isə daha çox yayılanı hekayə, povest, roman və s. sayılır. Bütün bunları nəzərə aldıqda «Riyazül-qüds» də bütün parametrlərinə görə: quruluş və həcminə, hadisələrin çoxşaxəli qurulmasına, geniş epik lövhələrin zənginliyinə, surətlərin sayca çoxluğuna görə daha çox roman janrının tələblərinə cavab verir. Sözsüz ki, bu məsələdə ilk növbədə tarixilik prinsipi və meyarı əsas götürülməlidir. Məsələ burasındadır ki, Azərbaycan ədəbiyyatşünaslığında indiyədək belə bir fikir formalaşmışdır ki, «*Azərbaycan romanı XIX əsrin sonunda yaranıb, XX əsrdə inkişaf etməyə başlamışdır*» (**44**,161). Belə olduqda onda Füzulinin «Hədiqətüs-süəda» əsərini hansı janra aid etmək lazımdır? Eləcə də bəzi tədqiqatçılar iddia edirlər ki, guya orta əsrlərdə Yaxın və Orta Şərq xalqları ədəbiyyatında, ümumiyyətlə, bədii tərcümə anlayışı mövcud olmamışdır (**79**, 137). Yenə də məsələ bu şəkildə müstəviyə qoyulduqda onda bəs Füzulinin «Hədisi-ərbəin» tərcüməsi, eləcə də Nişatinin «Şühədanamə» tərcüməsi orijinal əsərlərmi sayılmalıdır? Axı Füzuli də, Nişati də özləri bu əsərlərinin tərcümə olduğunu qeyd etmişlər. Bundan əlavə orta əsr təzkirəçiləri - ədəbiyyatşünasları da bəzi əsərləri, məsələn, Füzulinin «Hədiqətüs-süəda» əsərini tərcümə adlardırmışlar (bax: **94**, XLIV). Onların yazdıqlarına göz yummaq nə dərəcədə düzgün sayıla bilər. Fikrimizcə, bu və bu kimi məsələlərdə tarixilik prinsipi gözlənilməli, yəni konkret dövr və şəraitlə bağlı səciyyəvi məsələlər mütləq şəkildə nəzərə alınmalıdır. Başqa sözlə desək, hər hansı bir əsərin janrının müəyyən edilməsində və ya onun orijinal əsərmi, yoxsa tərcümə sayılması məsələsində həmin dövrə məxsus səciyyəvi cəhətlərə üstünlük verilməlidir. Düzdür, «Riyazül-qüds»ə (eləcə də «Hədiqətüs-süəda»ya) çağdaş roman janrının tələbləri baxımından yanaşdıqda onun bu janra aid edilməsi məsələsi bir qədər mübahisəli görünə bilər. Ancaq tarixi şəraiti nəzərə aldıqda hər iki əsəri öz dövrünün roman janrının nümunəsi saymaq mümkündür.

Bu məsələ ilə bağlı «Riyazül-qüds» üçün səciyyəvi olan daha bir cəhəti də qeyd etmək lazımdır. Müasir dövrdə roman janrı, əsasən, nəsrlə yazılır. Bununla belə, nəzmlə yazılan romanlar da məlumdur: məsələn, ayrı-ayrı tədqiqatçılar Nizaminin «Xosrov və Şirin» məsnəvisini mənzum roman adlarıdırırlar (bax: **65**,107). A.Bakıxanov isə «Riyazül-qüds»ü dahi sələfi Füzulinin «Hədiqətüs-süəda»sı kimi həm nəsrlə, həm də nəzmlə qələmə almışdır, yəni təhkiyə yolu ilə təsvir etdiyi hadisələri lirik şeir parçaları ilə daha da emosional və təsirli etmişdir. Bunu nəzərə alaraq «Riyazül-qüds»ü roman janrı saymaqla yanaşı, ədəbi növ olaraq epik-lirik adlanan ayrıca bir ədəbi növə aid etmək məqsədəuyğundur. Qeyd edək ki, xalq dastanları da nəsrlə nəzmin növbələşməsi şəklində qurulduğu üçün epik-lirik növə aid edilir.

Beləliklə, «Riyazül-qüds» haqqındakı deyilənlər A.Bakıxanovun bu əsərini XIX əsr Azərbaycan ədəbiyyatında yaranan məqtəl kitabının ən uğurlu və klassik nümunələrindən biri kimi dəyərləndirməyə əsas verir. «Riyazül-qüds» bütövlükdə götürdükdə tərcümə səciyyəsi daşısa da, əsər klassik məqtəl kitabının bütün tələblərinə cavab verir, onun başlıca xüsusiyyətlərini daşıyır. A.Bakıxanov «Riyazül-qüds»ü qələmə alarkən Məhəmməd Bağır Məclisinin «Cəlaül-üyun» əsərini başlıca qaynaq kimi seçsə də, digər məqtəl kitablarından da, xüsusilə də dahi sələfi M.Füzulinin «Hədiqətüs-süəda» əsərindən uğurla və yaradıcılıqla bəhrələnərək dəyərli bir məqtəl nümunəsi ortaya qoymağa müvəffəq olmuşdur.

# II FƏSİL

# «CƏLAÜL-ÜYUN» VƏ «RİYAZÜL-QÜDS»: MƏTNLƏRİN MÜQAYİSƏLİ TƏHLİLİ

## *2.1. Məhəmməd Bağır Məclisi və onun «Cəlaül-üyun» əsəri haqqında*

Abbasqulu ağa Bakıxanovun «Riyazül-qüds» əsəri üçün başlıca qaynaq kimi seçdiyi «Cəlaül-üyun» əsərinin müəllifi Məhəmməd Bağır bin Məhəmməd Tağı Məclisi 1037/1627-28-ci ildə İsfahanda ruhani ailəsində doğulmuş, 1110/1698-99 və ya 1111/1699-1700-cü ildə isə elə həmin şəhərdə vəfat etmişdir. Onun atası Məhəmməd Tağı (öl. 1070/1659) dövrünün nüfuzlu ruhani alimi olmuş və Səfəvilər dövründə - II Şah Abbasın (1052/1642-1077/1667) hakimiyyəti zamanı şeyxülislam vəzifəsini tutmuşdur. Məhəmməd Bağır atasının yanında oxumuş və ərəb dilini, ilahiyyatı mükəmməl öyrənmişdir. Atasının vəfatından sonra o, iki Səfəvi hökmdarının: həm Şah Süleymanın (1077/1667-1105/1694), həm də Şah Sultan Hüseynin (1105/1694-1142/1722) hakimiyyətləri dövründə şeyxülislam olmuşdur. Bu faktın özü Məhəmməd Bağır Məclisinin fıqh və ilahiyyat sahəsində dövrünün ən nüfuzlu və tanınmış bir alimi sayıldığını açıq-aşkar sübut edir. Məclisi həm də islamda şiə məzhəbinin ən güclü ideoloqlarından biri hesab edilir (bax: **88**, II, 581-586).

Mənbələrdə Məclisinin əsərlərinin ümumi saynın altmışdan

çox olması göstərilir ki, onlardan da çoxu Səfəvilər dövründə dövlət səviyyəsinə qaldırılan şiə məzhəbinə və onun təbliğinə həsr olunmuşdur (bax: **88**, II, 581-586; **107**, V-VI, 193).

M.B.Məclisinin ən məşhur əsərləri hədis toplusu olan 26 cildlik «Biharül-ənvar» («Nurlar dənizi») və Məhəmməd peyğəmbərin (s.), on iki imamın (ə.) həyatından bəhs edən 3 cildlik «Həyatül-qülub» («Qəlblərin həyatı») əsərləridir. Bu əsərlərdən birincisi ərəb dilindədir, ikincisi isə fars dilində yazılmışdır. Hər iki əsər şiəlik ruhunda qələmə alınmışdır və açıq-aşkar bu məzhəbin təbliğinə xidmət edir. Bu məsələ ilə bağlı görkəmli Azərbaycan alimi Mirzə Məhəmmədəli Müdərris Təbrizi yazır ki, «*əgər şiə dinini (**məzhəb olmalıdır - M.N**.) Məclisi dini adlandırsaq, yerinə düşər, çünki bu dinə (**yenə də məzhəb olmalıdır - M.N**.) qüdrət və əzəmət verən Məclisi olmuşdur*» (**107**, V-VI, 193).

M.B.Məclisinin fars dilində yazdığı «Cəlaül-üyun» («Gözlərin parlaqlığı») əsəri də məşhurdur və çox geniş yayılmışdır. «Cəlaül-üyun» da şiəliyin təbliğinə həsr olunmuşdur və məzmun baxımından müəllifin «Həyatül-qülub» əsərinə yaxındır. Məclisi «Cəlaül-üyun» əsərini 1089/1678-ci ildə tamamlamış və onu Səfəvi hökmdarı Şah Süleymana ithaf etmişdir. Müəllif əsərin əvvəlində bu mövzuda yazdığı «Həyatül-qülub» əsərinin də adını çəkir. Bu fakt isə sübut edir ki, o, «Həyatül-qülub» kitabını «Cəlaül-üyun» əsərindən əvvəl yazmışdır. Müəllif burada qeyd edir ki, o, «Həyatül-qülub» kitabında imamların həyatından bəhs etmişdir, lakin bu mövzuda ayrıca bir əsərin əhəmiyyətini nəzərə alaraq «Cəlaül-üyun» əsərini yazmaq qərarına gəlmişdir. Məclisi burada həmçinin Əhli-beyt üzvləri (ə.), xüsusilə də imam Hüseyn (ə.) üçün ağlamağın savabından da söz açır və bununla da əsəri nə məqsədlə yazdığını açıqlayır. Göründüyü kimi, Məclisi bu mövzunun - şiəliyin təbliğinin xüsusi əhəmiyyətini nəzərə alaraq, ömrünün nisbətən yetkin çağlarında məqtəl kitabı olan «Cəlaül-üyun»u yazmışdır.

Ümumiyyətlə, bir sıra müəlliflər məqtəl kitablarını, bir qayda olaraq, ömürlərinin yetkin çağlarında qələmə almışlar ki, bu da mövzunun həm ağırlığı, həm də müəyyən mənada ölümün yaxınlaşdığı anlarda savab qazanmaq arzusu ilə bağlıdır. Məsələn, Hüseyn Vaiz Kaşifi «Rövzətüş-şühəda»nı ömrünün lap sonlarında, vəfatından iki il öncə - 1502-ci ildə yazmışdır. Füzuli isə «Hədiqətüs-süəda»nı 1547-ci ildə ərsəyə gətirmişdir. Bu baxımdan A.Bakıxanovun «Riyazül-qüds» əsəri istisnadır, çünki o, müəllifin ilk qələm təcrübələrindən sayılır.

«Cəlaül-üyun» 14 babdan ibarətdir ki, bu da ilk növbədə şiəlikdə «Çəhardəh-mə'sum» («On dörd məsum») adı ilə məşhur olan on dörd müqəddəs şəxsiyyətlə - həzrət Məhəmməd peyğəmbər (s.), Fatimə (ə.) və on iki imamla (ə.) bağlıdır. Əsərin ilk babı Məhəmməd peyğəmbər (s.), ikinci babı o həzrətin qızı Fatimə (ə.) haqqındadır. Sonrakı bablar ayrı-ayrılıqda on iki imamın (ə.) hər birinin həyatına həsr olunmuşdur. Məclisi «Cəlaül-üyun»da özündən əvvəl yazılan məqtəl kitablarından (məsələn, «Rövzətüş-şühəda»dan) fərqli olaraq, imam Hüseynin (ə.) şəhadəti hissəsini – Kərbəla müsibətini daha ətraflı qələmə almaqla yanaşı (bu bab nə az, nə çox 23 fəsildən ibarətdir), digər imamların da həyatını ayrıca bir babda nisbətən yığcam və müfəssəl şəkildə təsvir etmişdir. Qeyd edək ki, istər «Rövzətüş-şühəda»da, istərsə də «Hədiqətüs-süəda»da yalnız «Xatimə» adlanan sonluqda on bir imamın doğumları, vəfatı və ya şəhadəti və övladları haqqında qısaca məlumat verilmişdir.

Müsəlman Şərqində ənənəvi mövzuda qələmə alınmış əsərlərdə müəlliflər, bir qayda olaraq, özlərindən əvvəl yazılmış kitablara, mövcud qaynaqlara da üz tutaraq həmin mənbələrdə olan bəzi məlumatlara, rəvayət və əhvalatlara da söykənir, bir çox hallarda isə onları öz əsərlərinə əlavə edirlər. Məclisi də «Cəlaül-üyun»da bu ənənəyə sadiq qalaraq mövzu ilə bağlı əsasən ərəb dilində yazılmış qaynaqlardakı rəvayətlərə və əhvalatlara geniş yer vermiş, onlardan yetərincə bəhrələnmiş və

bununla da əsərinin mötəbərlik səviyyəsini daha da artırmağa səy göstərmişdir. Məsələn, o, Kərbəla müsibəti ilə bağlı hadisələri qələmə alarkən bu qanlı faciənin canlı şahidi olmuş imam Zeynəlabidinin (ə.) dilindən söylənilmiş rəvayətləri və ya digər imamlara (ə.) aid edilən əhvalatları verərək əsərini daha canlı şəkildə qurmağa, onun mötəbərliyini artırmağa çalışmışdır. Bununla belə, əsərdəki bəzi hadisə və rəvayətlər inandırıcı görünmür və uydurma, şişirtmə təsirini bağışlayır. Məsələn, «Cəlaül-üyun»un beşinci babının altıncı fəslində Adəm peyğəmbərdən başlayaraq, Nuh, Musa, İsa və s. kimi peyğəmbərlərin gələcəkdə baş verəcək Kərbəla vaqiəsindən xəbər tutmalarından bəhs edilir. Həmin rəvayətlərdən birində təsvir edilir ki, İsa peyğəmbər öz həvariləri ilə Kərbəla düzündən keçərkən bir şir qabaqlarını kəsərək onlara yol vermir. Peyğəmbər şirdən bu hərəkətinin səbəbini soruşduqda o, dil açaraq deyir ki, imam Hüseynin (ə.) qatilinə (Yezidə) lənət oxumayınca buradan keçmək olmaz. Elə həmin fəsildə Süleyman peyğəmbərin bu xəbəri küləkdən eşitməsindən bəhs olunur (**104**[*], 182a-b).

«Cəlaül-üyun» əsərindəki bu qəbildən olan digər rəvayət və əhvalatlar da uydurma təsirini bağışlayır. Böyük mütəfəkkir Mirzə Fətəli Axundzadə şiəliyin təbliği, xüsusilə də təziyədarlıqla bağlı yazılan bəzi əsərlərdə açıq-aşkar uydurma fikirlər olduğunu tənqid edərək yazırdı ki, bu cür kitabları «*hər aqil və həkim (**ağıllı, müdrik - M.N.**) şəxs oxuyanda əti tökülür, ondan ötrü ki, əxbari-kazibənin (**yalan xəbərlərin - M.N.**) həddi və həsri (**məhdudiyyəti – M.N.**) yoxdur*» (**7**, 260). M.F.Axundzadənin bu sözlərini «Cəlaül-üyun» əsərindəki bəzi epizod və məqamlara da aid etmək olar. Qeyd edək ki, əsərdəki İsa və Süleyman peyğəmbərlə bağlı verilən rəvayətlər eynilə «Riyazül-qüds»də də vardır, daha doğrusu, oradan tərcümə edilmişdir. Bununla

---

[*] «Cəlaül-üyun»dan verilən bütün nümunələr bu mənbədən götürülmüşdür. Bundan sonra yalnız nümunə verilən vərəq göstəriləcək.

belə, «Cəlaül-üyun» yazıldığı dövrdən başlayaraq geniş şöhrət qazanmış və əsərin əlyazmaları çoxaldılaraq geniş yayılmışdır ki, bunu da ilk növbədə şiəliyin təbliği ilə əlaqələndirmək lazım gəlir. Əsərin dünya əlyazma kitabxanalarında mövcud olan çoxsaylı əlyazmaları bunu əyani şəkildə sübut edir (bax: **88**, II, 581-586). Qeyd edək ki, Azərbaycan Milli Elmlər Akademiyasının M.Füzuli adına Əlyazmalar İnstitutunda da «Cəlaül-üyun»un 20 ədəd əlyazması saxlanılır ki, onlardan biri əsər tamamlanan il, yəni 1089/1679-cu ildə köçürülmüş, digərləri isə XVIII-XIX yüzilliklərə aiddir (bax: **80**, 244-252).

Məclisinin «Cəlaül-üyun» əsərini Gülşən Əli Ənsari 1226/1811-ci ildə ixtisar edərək və məzmununu bir qədər dəyişdirərək «**Cəlaül-əbsar**» («Gözlərin parlaqlığı») adlı bir kitab tərtib etmişdir. Seyyid Abdullah bin Məhəmməd Rza Şübbar Hüseyni isə 1242/1826-27-ci ildə əsəri ərəb dilinə çevirmişdir. A.Bakıxanovun «Riyazül-qüds» əsərinin də bu dövrdə meydana çıxmasını nəzərə alaraq, XIX yüzilliyin birinci yarısında «Cəlaül-üyun»un məşhurluğu və geniş yayıldığı qənaətinə gəlmək olar. Bunu elə həmin dövrdə əsərin Tehranda daşbasma şəklində iki dəfə çap olunması da sübut edir (1240/1825 və 1262/1846). «Cəlaül-üyun» 1326/1947-48 və 1334/1955-56-cı illərdə Tehranda müasir üsulla da nəşr edilmişdir. Əsər Təbriz və Nəcəf şəhərlərində də çap olunmuşdur.

Məhəmməd Bağır Məclisi bütün əsərləri kimi «Cəlaül-üyun»u da yalnız nəsr şəklində qələmə almışdır.

### *2.2. «Riyazül-qüds»: tərcümə, yoxsa orijinal əsər? Məsələyə A.Bakıxanovun münasibəti*

Hər şeydən öncə xatırladaq ki, bu məsələyə irəlidə ötəri də olsa toxunmuşuq. Belə ki, əsərin yazılma səbəbini açıqlayarkən qeyd etdik ki, A.Bakıxanov «Riyazül-qüds»ün dibaçə hissəsində

əsərin yazılmasını şərtləndirən amillərdən danışarkən onu «Cəlaül-üyun»dan tərcümə etdiyini açıq-aşkar şəkildə göstərir. Bununla belə, bu məsələ üzərində bir qədər ətraflı dayanmaq lazım gəlir, çünki əsərdə A.Bakıxanovun bu barədə vacib və əhəmiyyəti digər qeydləri də vardır.

A.Bakıxanovun «Riyazül-qüds»ün tərcümə, yoxsa orijinal əsər olması ilə bağlı ikinci və daha mühüm, əhəmiyyətli bir qeydinə də kitabın sonunda, onun «Xatimə» hissəsində rast gəlirik. Yeri gəlmişkən qeyd edək ki, əlyazmalarda, bir qayda olaraq, müəllif və əsər haqqındakı məlumatlar ya onların əvvəlində, yəni giriş hissəsində («müqəddimə»də və ya «dibaçə»də), ya da «Xatimə» adlanan sonluq hissəsində verilir. A.Bakıxanov da bu qaydaya tam əməl etmişdir. O, əsərin sonunda «Riyazül-qüds»lə bağlı aşağıdakı məlumatı verir: *«Əgərçi bu nüsxeyi-cansuzi-möhnətxiz və risaleyi-qəmənduzi-şurəngiz* ***vəchi-intixab və ixtisar ilə «Cəlaül-üyun» kitabından tərcümə olunub*** *(seçdirmə bizimdir - M.N.) təfsiri-rəvayətə talib olan ərbabi-üqul və tətvili-əhadisi təmənna qılan əshabi-qəbul ol kitabi-müstətabə rücu etsin, ta həqiqəti-müddəası dərəceyi-vüzuhə yetsün»* (90b). Yuxarıda qeyd etdiyimiz kimi, A.Bakıxanov «Riyazül-qüds»ün əvvəlində bu kitabı «Cəlaül-üyun»dan sadəcə olaraq tərcümə etdiyini bildirirdisə, burada öz fikrini bir qədər də dəqiqləşdirir. Bu cümlədə seçdirdiyimiz ***«vəchi-intixab və ixtisar ilə»*** sözləri ilə o, aydınca bildirir ki, «Riyazül-qüds»ü «Cəlaül-üyun»dan seçmə və ixtisar yolu ilə tərcümə etmişdir. A.Bakıxanov burada onu da əlavə edir ki, kitabdakı hadisələr, əhvalat və rəvayətlər haqqında daha geniş məlumat əldə etməyi *«təmənna qılan»* şəxslər o pak kitaba - «Cəlaül-üyun»a müraciət etsinlər.

Beləliklə, A.Bakıxanovun bu qeydindən açıq-aşkar aydın olur ki, o, «Cəlaül-üyun»u tam şəkildə deyil, ixtisarla tərcümə etmişdir, daha doğrusu, aşağıda görəcəyimiz kimi sözügedən kitabdan daha vacib saydığı bəzi yerləri seçərək

sərbəst şəkildə ana dilinə çevirmişdir. A.Bakıxanovun «Riyazül-qüds»ün daha bir yerində olan kiçik bir qeydi də eynilə yuxarıdakı fikirlə səsləşir. Əsərdə imam Zeynəlabidinə (ə.) həsr olunmuş altıncı babın sonunda o sözügedən imamın anasının *«Yəzdcürdi-padşahi-əcəmin (fars padşahının - M.N.) qızı»* olduğunu qeyd etdikdən sonra yazır: *«Təfsili-hekayətin təmənna qılan kimsə kitabi-«Cəlaül-üyun»ə rücu etsün, ta keyfiyyəti vüzuhə yetsün»* (79a). Deməli, A.Bakıxanov burada da söz açdığı məsələ ilə bağlı əlavə məlumat əldə etmək istəyən oxucuya tövsiyə edir ki, bu barədə «Cəlaül-üyun» kitabına müraciət etsin. Bu fakt da «Riyazül-qüds»lə bağlı iki məsələyə aydınlıq gətirir: birincisi, A.Bakıxanovun əsərinin farsca qaynağı «Cəlaül-üyun» kitabıdır; ikincisi isə, A.Bakıxanov Məclisinin əsərindən yalnız müəyyən hissələri ana dilinə çevirmişdir. Əgər belə olmasaydı, A.Bakıxanov bu məsələ ilə ətraflı maraqlanan oxuculara məhz «Cəlaül-üyun» kitabına müraciət etməyi məsləhət görməzdi.

«Riyazül-qüds»ün bu hissəsində A.Bakıxanov aşağıdakı şeir parçasında da kitabın «Cəlaül-üyun»dan tərcümə olunmasına bilavasitə işarə edərək yazır:

*Əgərçi mətni-«Cəlaül-üyun» degil bu xəbər,*
*Vəleyk sihhəti məlumdur ki, İbn Həcər*[*]
*Yazub «Səvaiqi-mühriq»də*[**] *çün görüb məqbul,*
*Əbu Nəimdən*[***] *etmiş rəvayətin mənqul...* (79a)

Bu fakt eyni zamanda onu da sübut edir ki, A.Bakıxanov «Riyazül-qüds»də yeri gəldikcə mövzu ilə bağlı ərəb və fars dillərində olan digər qaynaqlardan da istifadə etmişdir.

---

[*] İbn Həcər - Şihabəddin Əbülabbas İbn Həcər (907/1501-974/1566). Məşhur fiqh alimidir.
[**] «Səvaiqi-mühriq» - İbn Həcərin şiəliyə həsr olunmuş əsəridir.
[***] Əbu Nəim - bu adda bir neçə orta əsr müəllifi məlumdur. Burada, cox güman ki, 517/1123-cü ildə vəfat etmiş Əbu Nəim İsfahanidən söhbət gedir.

A.Bakıxanov «Riyazül-qüds»ün «dibaçə» hissəsindəki qeydlərində də onu «Cəlaül-üyun»dan ixtisar yolu ilə tərcümə etməsini bir qədər başqa şəkildə bildirir. Bunu A.Bakıxanovun «Riyazül-qüds»ü *«bir kitabi-müxtəsəri-müfid»* (bir müxtəsər və faydalı kitab) adlandırması (4a) sübut edir. O, buradakı qeydlərində «Riyazül-qüds»lə bağlı *«tərtib etmək»* (4a) sözünü işlədir ki, bu da əslində onun orijinal yox, tərcümə əsəri olmasını sübut edən dəlillərdən biri sayıla bilər, çünki, adətən, müstəqil əsər üçün *«tərtib»* yox, *«təsnif»* sözü işlənir. Bununla belə, sırf orta çağlarda tərcümə əsərlərinin də *«təsnif»* kimi qələmə verilməsi hallarına rast gəlirik (bax **56**, 59)

«Riyazül-qüds»ün tərcümə əsəri olması ilə bağlı A.Bakıxanovun daha bir mühüm qeydi vardır. Belə ki, o, əsərin iki yerində özünü ***«mütərcim»*** adlandırır. Bu qeydlərdən biri «Riyazül-qüds»ün ikinci babının sonundakı ərəb dilində olan üç beytlik şeir parçasının əvvəlindədir. A.Bakıxanov dini məzmunlu aşağıdaki şeir parçasının qarşısına ərəbcə ***«li mütərcimihi»*** (mütərcimindir) sözünü yazaraq (13a) bununla həmin nümunənin mütərcimə, yəni özünə məxsus olduğunu qeyd etmişdir:

*Ləənəl-lahü ünasən qətəlü seyyidəhüm,*
*Ma rəəv izzətə dinün bəisü min nəimat,*
*Əlləzi yəkfürü min xalifini fil-əhkam,*
*Keyfə qövmün bədəül-qətli ləhü fizzülümat,*
*Leytə qövlən kəburət mən lüinə qültu ləhüm,*
*İnnə fi zalikə la yədfə'ü 'annil-həsərat.* (13a)

(Öz ağalarını (seyyidlərini) öldürən insanları Allah lənətlədi,

Din izzəfinə riayət etməyənlər nemətlərdən uzaq olarlar.
Ehkamlara qarşı çıxan (müxalif olan) kəs küfr

edəndir,
Qövm necə onu zülmətlərdə öldürməyə başladı?!
Əgər sözlə lənətlənmiş kəs böyüsəydi,
Ona deyərdim ki, o ağrı-acıları məndən uzaqlaşdıra bilməz.)

Aydınlıq üçün qeyd edək ki, digər klassik nəsr əsərlər də, məsələn, XVIII əsr Azərbaycan nəsr abidəsi - Möhsün Nəsirinin «Lisanüt-teyr» («Quşların dili») əsərində nəsr arasında verilən şeir parçaları müəllifin özünə məxsus olduqda, onların qarşısında ərəbcə *«li müəllifihi»* (müəllifindir) sözü yazılmış, digər nəzm nümunələrinin əvvəlində isə ayrı-ayrı müəlliflərin adları qeyd olunmuşdur (bax: **50**). «Riyazül-qüds»də də müxtəlif müəlliflərə aid ərəbcə şeir parçaları vardır ki, onların çoxunun əvvəlində müəlliflərin adları göstərilmişdir, məsələn: *«li Debel»* (30a) - Debelindir, *«li Bəhaəddin»* (1b) - Bəhaəddinindir* və s. Bəzi şeir parçasının əvvəlində isə *«la ədri»* (6a) – "*bilmirəm"* sözü yazılmışdır ki, A.Bakıxanov (və ya katib) bununla həmin şeir parçasının kimə məxsus olduğunu bilmədiyini vurğulamışdır.

A.Bakıxanovun «Riyazül-qüds»də özünü «mütərcim» kimi təqdim etdiyi ikinci qeydi isə bilavasitə əsərdəki bir epizodla bağlıdır. «Riyazül-qüds»ün beşinci babının üçüncü fəslində ərəb şairi Debel Xüzainin imam Rzanın (ə.) yanına getməsi və onun məclisində imam Hüseyn (ə.) haqqında yazdığı mərsiyəsini oxumasından danışılır (30a). Bu hadisə eynilə «Cəlaül-üyun» əsərində də vardır (177a), deməli, oradan tərcümə olunmuşdur. Həmin epizoddan sonra isə A.Bakıxanov yazır: ***«Mütərcim (seçdirmə bizimdir –M.N.)*** *deyir: Hərçənd ki, mətni-«Cəlaül-üyun» dəgil, amma vəchi-tənasüb üzrə (uyğun gəldiyi üçün - M.N.) mərqum edirəm* (***qeyd edirəm, yazıram - M.N****.)».*

* Bəhaəddin – Şeyx Bəhai Amili (953/1546-1031/1622) tanınmış İran şairi və alimidir. Dini məzmunlu 88-dən çox əsər yazmışdır.

A.Bakıxanov burada özünü ***«mütərcim»*** adlandıraraq nəzərə çatdırmaq istəyir ki, aşağıda yazdıqları «Cəlaül-üyun»un mətnində yoxdur, ancaq mətləbə uyğun gəldiyi üçün kitaba əlavə edir. «Riyazül-qüds»də bu cümlədən sonra imam Rzanın (ə.) şair Debel Xüzaiyə dediyi sözlər verilir. İmamət elmi ilə tezliklə şəhid olacağını öncədən bilən imam Rza (ə.) Debelə bu xəbəri dedikdən sonra özünün ərəb dilində yazdığı 2 beytlik şeirini oxuyur (30a). İki cümləlik bu epizod və şeir «Cəlaül-üyun»da yoxdur (bax: 177a). Deməli, A.Bakıxanov bu hissəni «Riyazül-qüds»ün mətninə özü əlavə etmişdir. Qeyd edək ki, A.Bakıxanovun burada özünü ***«mütərcim»*** adlandırması, fikrimizcə, daha bir məsələ ilə bağlı ola bilər. Məclisi «Cəlaül-üyun»da bir sıra hallarda müxtəlif ərəb mənbələrinə üz tutaraq onlardan əxz etdiyi məlumatları verdikdən sonra məsələ ilə bağli öz fikirlərini də açıqlayır və bu zaman tez-tez ***«moəllef quyəd»*** (müəllif deyir) ifadəsini işlədir. Görünür, A.Bakıxanov da Məclisinin yolu ilə gedərək burada ***«mütərcim deyir»*** ifadəsini işlətmişdir.

A.Bakıxanovun yuxarıdakı əlavəsi ilə bağlı heç bir qeydi yoxdur, yəni o, «Riyazül-qüds»ə artırdığı hissəni hansı mənbədən götürdüyünü göstərmir. Buna baxmayaraq, gənc A.Bakıxanovun «Riyazül-qüds»ü qələmə alarkən digər qaynaqlara da üz tutması heç bir şübhə doğurmur. Belə qaynaqlardan biri A.Bakıxanovun «Riyazül-qüds»ün dibaçəsində adını böyük ehtiramla çəkdiyi Füzulinin «Hədiqətüs-süəda» əsəridir.

Beləliklə, «Riyazül-qüds»dəki yuxarıdakı qeydlər tam aydınlığı ilə sübut edir ki, A.Bakıxanovun özü «Riyazül-qüds»ü açıq-aşkar bir şəkildə Məclisinin «Cəlaül-üyun» əsərinin müxtəsər tərcüməsi adlandırmış və mahiyyət etibarilə bu məsələdə heç bir şübhə yeri qoymamışdır. Bütün bunları nəzərə alaraq, əslində «Riyazül-qüds»ün tərcümə və orijinal əsər olması ilə bağlı qaldırdığımız məsələni bağlamaq, necə deyərlər, ona nöqtə qoymaq olardı. Bəli, A.Bakıxanov təsdiq

edir ki, «Riyazül-qüds» tərcümə əsəridir - «Cəlaül-üyun»un müxtəsər tərcüməsidir. Ancaq problem bununla bitmir. Məsələ burasındadır ki, «Riyazül-qüds»ün diqqətlə öyrənilməsi kitabda olan bəzi incə məqamların bu məsələnin müsbət şəkildə çözülməsinə bir qədər əngəl törətdiyini, daha doğrusu, onu şübhə altına almaq üçün müəyyən qədər əsas verdiyini göstərir. Həmin incə məqamlardan biri yenə də «Riyazül-qüds»ün «Xatimə» hissəsindədir. A.Bakıxanov kitabın lap sonunda yekun olaraq nəzərə çatdırır ki, «Riyazül-qüds»ə nəzm və nəsrlə zinət vermiş, bu məqsədlə ona digər müəlliflərin də ərəbcə şeirlərini daxil etmişdir. Bu fikrini bildirdikdən sonra o, aşağıdakı şeir parçasını verir:

*Xarici-imkan olur vəsfi-kəmali-Əhli-beyt,*
*Bən kiməm kim, eyləyəm izhari-hali-Əhli-beyt?*
*Ad bənim məzkur olur bu nüsxə təhrirində, leyk,*
*Baisi-tə'lifidir feyzi-cəlali-Əhli-beyt.* (91a)

Bu misraların məzmununun diqqətlə öyrənilməsi belə bir nəticəyə gəlməyə əsas verir: yuxarıdakı sözləri hər hansı bir müəllif ancaq öz qələminin məhsulu olan orijinal əsəri haqqında deyə bilərdi. Ona görə ki, bu şeir parçasının ikinci misrasında A.Bakıxanov özünü *«Əhli-beytin halını»* bildirən, üçüncü misrada isə bu nüsxənin (kitabın) yazılmasında adı qeyd olunan şəxs kimi qələmə verir. Bu, əslində, o deməkdir ki, A.Bakıxanov burada özünü əsərin mütərcimi kimi yox, müəllifi kimi təqdim edir. Başqa sözlə desək, A.Bakıxanov bu misraları ilə «Riyazül-qüds»ün müəllifi olduğunu, burada onun adının yazıldığını vurğulamaq istəyir. Klassik tərcümə əsərlərinə xas olan səciyyəvi cəhətlər də bu fikri təsdiqləyir. Məsələ burasındadır ki, orta əsr mütərcimlərinin bir çoxu tərcümə sənətinə bədii yaradıcılığın ayrıca bir növü kimi yanaşmış, buna görə də, bir qayda olaraq, tərcümələrini *«təsnif»* (əsər), özlərini isə *«nazim»*

(nəzmə çəkən, şair) və ya *«müsənnif»* (müəllif) adlandırmışlar. Məsələn, XV əsr Azərbaycan tərcümə əsəri «Əsrarnamə»nin mütərcimi Əhmədi Təbrizi kitabın bir yerində onu farsdilli sufi şairi Fəridəddin Əttarın (514/1120-628/1230) ədəbi irsindən seçmə yolu ilə tərcümə etdiyini açıq-aşkar şəkildə bildirir, digər bir yerdə isə özünü *«nazim»* adlandırır (bax: **58**, 34-38). Eləcə də XVI əsr Azərbaycan tərcümə abidəsi «Şühədanamə»nin mütərcimi Nişati kitabın əvvəlində onu fars dilindən tərcümə etdiyini bildirməsinə baxmayaraq, sonda özünü *«müsənnif»* kimi təqdim edir (bax: **75**, 338a). Bunun başlıca səbəbi isə orta əsrlərdə tərcümə ədəbiyyatının, xüsusilə də poetik tərcümələrin çağdaş tərcümə sənətindən kəskin şəkildə fərqlənməsidir. Bu səciyyəvi xüsusiyyətlərinə görə orta yüzilliklərə aid bir sıra tərcümə əsərlərinin mütərcimləri daha çox həmin əsərlərin müəllifləri hesab edilmişlər. Təsadüfi deyil ki, klassik tərcümə ədəbiyyatı nümunələrinin bir çoxu elə mütərcimlərin adları ilə tanınır. Məsələn: Əhmədinin «Əsrarnamə»si, Nişatinin «Şühədanamə»si və s. Bu ənənə nadir hallarda çağdaş dövrümüzdə də yaşanır. Məsələn, fılologiya elmləri doktoru Ataəmi Mirzəyevin qeyd etdiyi kimi, Xəlil Rza Ulutürkün adı ilə çap olunan «Turan çələngi» kitabında şairin fars dilindən etdiyi tərcümələr toplanmışdır (bax: **47**, 13).

Məlum olduğu kimi, klassik ədəbiyyatın bir çox ənənələri XIX əsr Azərbaycan ədəbiyyatında da davam etdirilmişdir. Həmin dövr ədəbiyyatında Füzuli ənənələrinin geniş yayılması buna əyani sübutdur. Klassik tərcümə ənənələri də bu baxımdan istisna deyil. Belə ki, orta əsrlərdə geniş yayılan sərbəst tərcümə nümunələrinə XIX yüzillikdə də təsadüf edirik. Məsələn, görkəmli Azərbaycan şairi Seyid Əzim Şirvani farsdilli şair Übeyd Zakaninin (öl. 881/1370-71) «Qorbe və muş» («Pişik və siçan») adlı təmsilini farscadan tam sərbəst şəkildə ana dilinə çevirmişdir. Belə ki, S.Ə.Şirvəni 159 beytlik bu şeirdən

yalnız 65 beyti sərbəst tərcümə edərək təmsili öz əlavələri ilə daha da genişləndirmiş və ondakı beytlərin sayını 300-ə çatdırmışdır (**17**, 72). «Riyazül-qüds» üzərindəki müşahidələrə əsasən deyə bilərik ki, A.Bakıxanov da burada sərbəst tərcümələrə xas olan başlıca xüsusiyyətlərin (bax: **55**, 30-41) təsiri altında olmuş, yəni «Cəlaül-üyun»un istənilən yerini buraxmış və istədiyi yerdə türkcə mətnə öz əlavələrini artırmaqdan çəkinməmişdir. Deməli, A.Bakıxanov da sələfləri Əhmədi və Nişati kimi tərcümə sənətini bədii yaradıcılığın xüsusi bir növü hesab edərək, «Riyazül-qüds»ə müstəqil bir əsər kimi yanaşmış, məhz buna görə yuxarıdakı misralarında bu əsərin ərsəyə gətirilməsində özünün müəyyən əməyi və payı olduğunu diqqətə çatdırmaq istəmişdir.

A.Bakıxanov «Riyazül-qüds»ün daha bir yerində yenə də şeir parçasında dolayısı ilə bu fıkri vurğulayır. İmam Hüseyn (ə.) haqqındakı babda imamın bu dünyadakı həyatının son anlarını təsvir edərkən A.Bakıxanov əsərin baş qəhrəmanı haqqındakı şeirində yazır:

*Novbəhari-«Riyazül-qüds»,*
*Və pərtovi-«Cəlaül-üyun».* (62a)

Fikrimizcə, A.Bakıxanov burada imam Hüseyni (ə.) «Riyazül-qüds»ün təzə baharı, «Cəlaül-üyun»un işığı adlandırarkən bu iki əsərin adlarını ayrı-ayrı çəkməklə onların hər birinə ayrıca bir əsər kimi yanaşdığını vurğulamaq istəmişdir. Əsərin başqa bir yerində isə, o, imam Hüseyn (ə.) haqqındakı kitabları sadalayarkən bu siyahıda müstəqil əsərlərin, o cümlədən «Cəlaül-üyun»un adını çəkir, «Riyazül-qüds»ün adını isə dilə gətirmir:

*Və ətri-dilavəzi-güli-reyhan,*

*Və mənbəi-«Eynül-büka»*[*].
*Və «Cəlaül-üyun»i-əhli-cəhan,*
*Və pirayeyi-novbəhari-«Rövzətül-vaizin»*[**]. (24a)

A.Bakıxanovun «Riyazül-qüds»ü öz müstəqil əsəri hesab etməsi ilə bağlı daha bir məqam - maraqlı faktı qeyd etmək yerinə düşər. «Riyazül-qüds»ün sözügedən əlyazmasında əsərin mətni 91a vərəqində tamamlanır, lakin nüsxədə bundan sonra daha üç vərəq vardır. Həmin vərəqlərdə (91b-94b) katibin öz xətti ilə müxtəlif şairlərin (Molla Mehdi Nəraqi, Heyran Rumi, Molla Bağır Xoyi, Fərrux bin Məsih Qarabaği-Təbrizi və b.) türkcə və farsca növhələri yazılmışdır. Əsasən, imam Hüseynin (ə.) böyük oğlu Əli Əkbər haqqında olan bu növhələrdən biri də A.Bakıxanovun qələminin məhsuludur. Əlyazmanın 91a vərəqindəki: *«Rəhm eylə göz yaşimə, getmə bu meydanə, Əli»* misrası ilə başlayan on beş beytlik həmin növhənin əvvəlində katibin farsca belə bir qeyd vardır: *«Əz-Əbbasquli ağa-ye Qobbei-mosənnəf-e «Riyazol-qods»* («Riyazül-qüds»ün müəllifi Abbasqulu ağa Qubalınındır»). Bu fakt açıq-aşkar göstərir ki, «Riyazül-qüds»ün əlyazması köçürülən vaxt, yəni 1842-ci ildə A.Bakıxanov «Riyazül-qüds»ün müəllifi kimi tanınırmış. Həmin növhənin indiyə qədər nəşr edilmədiyini nəzərə alaraq onu ilk dəfə tam şəkildə diqqətə çatdırırıq.

**Növhə**

*Rəhm eylə göz yaşimə, getmə bu meydanə, Əli,*
*Heyfdir kakili-mişkin batə al qanə, Əli.*
*Qoyma hicrində bəni əşk tökəm həsrət ilə,*

[*] Yuxarıda qeyd etdiyimiz kimi, Məhəmməd Tağı Bürucərdi Kaşaninin əsəridir.
[**] Əbu Əli Məhəmməd Fəttal Nəysəburi əl-Farisinin (XI əsr) əsəridir.

*Şəmtək suzi-dilimdən yanə pərvanə, Əli.*
*Bilürəm axir əlimdən üzülür vəsl ətəgin,*
*Qoy çəkim həsrət ilə zülfünə bir şanə, Əli.*
*Məni-sövdazədəni qoyma dutum daməni-dəşt,*
*Salma Məcnun kimi Leylayi biyabanə, Əli*
*Demə çək daməni-vəslimdən əlin, Nuhsifət*
*Verürəm aləmi bir ah ilə tufanə, Əli.*
*Ol siyəh türrələrin boynuma zəncir salub,*
*Çəkmə, çəkdün bəni Yusif kimi zindanə, Əli.*
*Bir tərəf dərdi-qəmin, ol tərəfə hicri-rüxün,*
*Bu qədər yaxşı degil zülm bir insanə, Əli.*
*Tökmə zülfün yüzünə etmə nihan xallarını,*
*Bədnəzər dəfinə lazımdı siyəhdanə, Əli.*
*Didə-nəm, qamət-xəm, bəxt-siyəh, tale-kəm,*
*Görsə kafər məni, billah, gəlür imanə, Əli.*
*Həzər et əhli-cəfadən, verilür tiri-cəfa,*
*Bərgi-gül tab gətürməz dəmi-peykanə, Əli.*
*Sən gedərsən dağlur, ceyş olur bərhəm əsas,*
*Ceyş lazımdı bu gün bir belə sultanə, Əli.*
*Mürği-vəhşi kimi, billah, oluram guşənişin,*
*Dutaram bayqu kimi mənzili-viranə, Əli.*
*Şanədən nalə yetər guşimə, bu rəmz nədir,*
*Hər zaman kim çəkərəm zülfi-pərişanə, Əli.*
*Olmaya çərxi-fələk cövr ilə məni-dilzədəni,*
*Yandura qürbət ara atəşi-hicranə, Əli.*
*Qorxaram ah çəkəm, Qüdsi kimi ahimdən,*
*Yana bülbül, düşə od səhni-gülüstanə, Əli.*

Yuxarıdakı fikri, yəni A.Bakıxanovun "Riyazül-qüds"ü özünün müstəqil əsəri saymasını sübut edən ikinci və daha tutarlı bir fakt isə yenə də müəllifin dilindədir. Maarifçi sənətkar ən məşhur elmi əsəri olan «Gülüstani-İrəm»in sonunda verdiyi tərcümeyi-halında bir neçə əsərinin adını çəkir ki, onlar sırasında «Riyazül-qüds» birinci yerdədir: A.Bakıxanov burada «Riyazül-

qüds»ü özünün müstəqil əsəri kimi təqdim edir (**76**,206).

Beləliklə, «Riyazül-qüds»ün tərcümə və ya orijinal bir əsər olması ilə bağlı suala birmənalı şəkildə belə cavab vermək daha məqsədəuyğundur: Əsər «Cəlaül-üyun»un sərbəst və müxtəsər tərcüməsidir. Qeyd etdiyimiz kimi, bunu ilk növbədə A.Bakıxanovun sözügedən məsələ ilə bağlı «Riyazül-qüds»də yer alan öz açıqlamaları təsdiqləyir. Bununla belə «Riyazül-qüds»də A.Bakıxanovun müəyyən əməyinin, yaradıcılıq işinin olmasını da danmaq olmaz. Başqa sözlə desək, «Riyazül-qüds» adi bir tərcümə əsəri deyil, **klassik sərbəst-yaradıcı tərcümə nümunəsidir**. Məhz buna görə A.Bakıxanov da orta yüzilliklərin bir sıra mütərcimləri kimi «Riyazül-qüds»ü öz doğma əsəri hesab etmişdir. Bu məsələdə o, sözsüz ki, müəyyən mənada haqlıdır, çünki «Riyazül-qüds» çağdaş tərcümələrdən bir sıra xususiyyətlərinə görə kəskin şəkildə seçilən klassik sərbəst tərcümə nümunəsidir.

Burada daha bir incə məsələyə toxunmağı zəruri sayırıq. A.Bakıxanov «Riyazül-qüds» üçün başlıca qaynaq kimi nəyə görə ana dilində olan «Hədiqətüs-süəda»nı deyil, məhz «Cəlaül-üyun»u seçmişdir? Kərbəla vaqiəsi mövzusunda qələmə alınmış məşhur əsərlər üzərindəki müşahidələr göstərir ki, XVI yüzillikdən başlayaraq, fars və ərəb dillərində qələmə alınmış ən geniş yayılmış məqtəl kitablarını, əsasən, böyük nüfuz sahibi olan ilahiyyatçı alimlər yazmışlar. Məsələn, farsca ən məşhur məqtəl kitabı sayılan «Rövzətüş-şühəda»nın müəllifi Hüseyn Vaiz Kaşifi dövrünün ən görkəmli ilahiyyatçı alimi, vaizi olmuş, Qur'ani-Kərimə təfsir yazmışdır. Eləcə də «Cəlaül-üyun»un müəllifi Məclisi, yuxarıda qeyd etdiyimiz kimi, şeyxülislam olmuşdur. Kərbəla vaqiəsi mövzusu isə bilavasitə dinlə, ilahiyyatla, müəyyən mənada islam tarixi ilə bağlıdır. Deməli, bu mövzuda əsər yazmaq üçün nüfuzlu ilahiyyatçı şəxs olmağın özü də o dövrdə başlıca amillərdən, şərtlərdən biri sayılmışdır.

Mütəfəkkir şair Məhəmməd Füzulinin Kərbəla vaqiəsi

mövzusunda «Hədiqətüs-süəda» əsərini qələmə almasına gəldikdə isə, qeyd edildiyi kimi, o da bu kitabı üçün ilahiyyatçı alim Kaşifinin «Rövzətüş-şühəda»sını əsas götürmüşdür. Deməli, elə o dövrdə də A.Bakıxanovun sələfi Füzuli, təbii ki, mütəfəkkir bir şair sayılır, Məclisi isə nüfuzlu ilahiyyatçı alim kimi tanınırmış. Görünür, A.Bakıxanov da bu başlıca amili nəzərə alaraq, öz kitabını tərtib edərkən Füzulinin «Hədiqətüs-süəda»sına deyil, Məclisinin «Cəlaül-üyun» əsərinə üstünlük vermiş və onu ixtisar şəklində ana dilinə çevirmişdir. Qeyd edək ki, «Cəlaül-üyun»un sözügedən məsələdə daha mötəbər sayılmasında Məclisinin tez-tez müxtəlif mənbələrə, o sıradan ilkin ərəb qaynaqlarına müraciət etməsi də, təbii ki, az əhəmiyyətli olmamışdır. Məlum olduğu kimi, müsəlman Şərqində tarixə aid qaynaqların çoxu ilk öncə ərəb dilində yazılmış və daha mötəbər mənbə sayılmışdır. Beləliklə, bütün bu amilləri nəzərə aldıqda A.Bakıxanovun sözügedən məsələdə «Cəlaül-üyun»a üstünlük verməsi təbii qəbul edilməlidir. Onu da qeyd edək ki, «Cəlaül-üyun» ortaya çıxdıqdan sonra bir sıra şiə ilahiyyatçı alimləri «Rövzətüş-şühəda» ilə müqayisədə Məclisinin əsərini bu məsələdə daha mötəbər mənbə və nüfuzlu qaynaq saymışlar, çünki burada şiəliyin təbliği daha açıq və qabarıq şəkildə öz əksini tapmışdır. Təkcə belə bir faktı qeyd etmək kifayətdir ki, Kaşifinin «Rövzətüş-şühəda» əsərində imam Hüseyndən (ə.) sonra yaşamış imamların həyatına ayrıca bölmə həsr edilmədiyi halda, Məclisi «Cəlaül-üyun»da hər bir imamın həyatını ayrıca babda təfsilatı ilə qələmə almışdır. Məlum olduğu kimi, şiəlikdə isə on iki imama etiqad ən başlıca və vacib şərtlərdən biri sayılır. Onu da əlavə edək ki, keçən yüzillikdə İranın ayrı-ayrı nüfuzlu din xadimləri, ilahiyyatçı alimləri Kaşifinin əsərində verilən bəzi rəvayətlərin həqiqətə uyğun gəlmədiyini göstərmiş və məhz bu səbəbdən də onu tənqid etmişlər (bax: **28**, 607-608).

A.Bakıxanov «Riyazül-qüds»ü qələmə aldığı dövrdə də onun özünün də qeyd etdiyi kimi, «Cəlaül-üyun» Kərbəla

müsibəti mövzusunda daha mötəbər qaynaq sayılırmış. Burada bir məsələni də qeyd etməyi lazım bilirik. «Riyazül-qüds»də A.Bakıxanovun öz qələminin məhsulu olan «dibaçə» hissəsi üzərindəki müşahidələr göstərir ki, o, «Riyazül-qüds» üzərində işləyərkən gənc olmasına baxmayaraq, islama, onun müqəddəs kitabı olan Qur'ana və qələmə aldığı mövzuya, müxtəlif qaynaqlara yetərincə bələd olmuşdur. Gənc A.Bakıxanovun kitabın bu hissəsində tez-tez Qur'ana müraciət etməsi, bu səmavi Kitabdakı ayrı-ayrı ayələrə yerli-yerində və çox uğurla, məqsədəuyğun şəkildə üz tutması, onları tutalqa, dəlil olaraq göstərməsi bunu əyani şəkildə sübut edir. Bu məsələyə diqqət yetirən Ə.Əhmədovun ehtimalına görə A.Bakıxanov həyatının Quba dövründə ("Riyazül-qüds"də bu dövrə aiddir) dini titul almağa hazırlaşırmış. Bu fikirlə müəyyən mənada razılaşmaq olar, lakin məlum olduğu kimi, A.Bakıxanov elə "Riyazül-qüds"ü qələmə aldığı il Tiflisə köçür və tamamilə fərqli yeni bir mühitdə əvvəllər belə bir niyyətdə olsa belə, ondan vaz keçməli olur.

### *2.3. «Cəlaül-üyun» və «Riyazül-qüds»: oxşar cəhətlər. «Riyazül-qüds»ün tərcümə xüsusiyyətləri*

«Riyazül-qüds»ün əsasən tərcümə səciyyəli bir əsər olmasının sübutu olaraq A.Bakıxanovun əsərin əlyazmasında verilən yuxarıda göstərdiyimiz qeydləri əslində yetərlidir və ən başlıca arqument, əsas dəlil sayılmalıdır. Bununla belə, bu fikrin əyani şəkildə sübutu olaraq və tam yəqinlik əldə etmək üçün biz hər iki əsərin – «Riyazül-qüds» və «Cəlaül-üyun»un mətnləri üzərində də müqayisə aparmağı məqsədəuyğun saydıq. Bəri başdan qeyd edək ki, bu iki əsər arasında həm oxşar cəhətlər, həm də fərqli xüsusiyyətlər özünü göstərir. İlk öncə hər iki əsər arasındakı oxşar cəhətlər üzərində dayanaq. Müqayisə göstərir

ki, bu məsələdə birincilər-oxşarlıqlar üstünlük təşkil edir.

«Riyazül-qüds»ün «Cəlaül-üyun»la bağlılığını, daha doğrusu, birinci əsərin ikincidən sərbəst və ixtisarla tərcümə olunduğunu sübut edən dəlil-sübutlar sırasında, ilk növbədə onların quruluş baxımından, demək olar ki, üst-üstə düşdüyünü qeyd etmək lazımdır. Hər iki əsər bablar şəklində qurulmuşdur və onların sayı da eynidir: on dörd. Düzdür, «Cəlaül-üyun»la «Riyazül-qüds»dəki babların adlarında müəyyən kiçik fərqlər də özünü göstərir, lakin həmin bablarda, qeyd etdiyimiz kimi, eyni şəxsiyyətlərdən danışılır və onların məzmunları da bir-birinə uyğun gəlir. «Riyazül-qüds» quruluş, kompozisiya baxımından «Cəlaül-üyun»la, demək olar ki, tam üst-üstə düşür. Bununla belə, «Cəlaül-üyun»dakı bütün bablar öz növbəsində bir neçə fəsilə bölünür ki, onların da hər birində haqqında danışılan ayrı-ayrı müqəddəs şəxsiyyətlərlə bağlı çoxçeşidli və müxtəlif səciyyəli bioqrafik məlumatlar verilir. Məsələn, Məclisinin əsərində Məhəmməd peyğəmbər (s.) haqqındakı ilk bab altı fəsildən ibarətdir ki, onlarda o həzrətin həyatı ilə bağlı bütün mühüm faktlardan bəhs edilir. Həmin fəsillərdə verilən məlumatlar Peyğəmbərin (s.) nəsəbi, adı, künyəsi, nuri-şərifı, doğum tarixindən tutmuş o həzrətin həyatının son mərhələsi də daxil olmaqla baş vermiş hadisələri: vəsiyyətini, dünyasını dəyişməsini əhatə edir. Babın sonuncu - altıncı fəslində isə o həzrətin dəfnindən sonra baş verən bəzi hadisələrdən danışılır. «Riyazül-qüds»də isə bu babda yalnız Peyğembərin (s.) vəfatı ilə bağlı məsələlərdən söz açılır, buna görə də o heç bir fəslə bölünmür.

«Cəlaül-üyun»da olan digər bablar da bu şəkildə qurulmuşdur: onlarda da haqqında bəhs edilən şəxsiyyətlər barədə nisbətən dolğun məlumat verilir. Əsərdəki digər bablarda olan fəsillərin sayları aşağıdakı kimidir: II bab: 8; III bab: 5; IV bab: 6; V bab: 23; VI bab: 2; VII bab: 2; VIII bab: 4; IX bab: 3; X bab: 3; XI bab: 2; XII bab: 2; XIII bab: 2.

Əsərdəki sonuncu – on dördüncü babda isə hec bir fəsil yoxdur.

«Riyazül-qüds»də isə, birinci babda (eləcə də «Cəlaül-üyun»da olduğu kimi sonuncu babda) heç bir fəsil yoxdur. Digər bablardakı fəsillərin sayı isə belədir: II bab: 3; III bab: 2; IV bab: 3; V bab: 9; VI bab: 3; VII bab: 2; VIII bab: 2; IX bab: 2; X bab: 4; XI bab:2; XII bab:2; XIII bab:2.

Göründüyü kimi, «Riyazül-qüds»də yalnız beşinci babdakı fəsillərin sayı çoxdur: 9-a bərabərdir, digər bablar isə, onuncu istisna olmaqla iki-üç fəsildən ibarətdir.

«Cəlaül-üyun» əsərinin bu cür geniş və əhatəli şəkildə qurulmasının başlıca səbəbi onunla izah edilə bilər ki, buradakı bablarda sözügedən müqəddəs şəxsiyyətlərlə bağlı verilən bilgilər çoxçalarlıdır, müəyyən mənada irihəcmli bioqrafik məlumat səciyyəsi daşıyır, yəni hər bir şəxsiyyətin həyatını əvvəldən axıradək - doğumundan vəfatına və ya şəhadətinədək olan dövrünü əhatə edir. Məclisi bu məsələləri işıqlandırarkən ən kiçik detallar üzərində belə ayrıca dayanmağı zəruri sayır. Məsələn, o, imam Əli (ə.) haqqında olan üçüncü babda bu müqəddəs şəxsiyyətin qüsl və kəfəninə, dəfn edilməsinə ayrıca bir fəsil həsr etmişdir ki, bu hissə «Riyazül-qüds»də ayrıca bir bölmə şəklində deyil. «Riyazül-qüds»ə gəldikdə isə, eyni bablardakı oxşar səciyyəli məlumatlar həmin müqəddəs şəxsiyyətlərin, əsasən, doğumları və vəfatları və ya şəhadətləri ilə bağlı qəmli, hüznlü məqamları özündə birləşdirir. Bu isə əslində o deməkdir ki, A.Bakıxanov «Cəlaül-üyun»un mətnini, özünün də xüsusi olaraq vurğuladığı kimi, tam şəkildə deyil, yalnız seçmə və ixtisar yolu ilə tərcümə etmiş, yəni Məclisinin əsərinin ancaq müəyyən hissələrini ana dilinə sərbəst şəkildə çevirmişdir.

Hər iki əsərdəki babların və mövcud fəsillərin adlarına gəldikdə isə, onlar da, demək olar ki, üst-üstə düşür, bir-birinə uyğun gəlir. Məsələn, «Cəlaül-üyun»dakı əsas hissə - beşinci bab belə adlanır: *«Dər bəyan-e tarix-o-veladət-o-şəhadət-e seyyedoş-şohəda və xames-e al-e əba və emam-e soəda və pişva-ye əhl-e səbr-o-ebtela və qol-e bustan-e resalət və sərv-e*

*cuybar-e emamət və xilafət, ə'ni" seyyed-e məzlum»* (160a). «Riyazül-qüds»də isə həmin babın adı bu şəkildədir: *«Həzrəti-seyyidüş-şühəda və xamisi-ali-əba və imami-zümreyi-süəda və sultani-diyari-Kərbü bəla və pişvayi-əhli-səbrü ibtila və güli-bustani-risalətü şərafət və sərvi-cuybari-imamətü xilafət və laleyi-gülgüni-kəfəni-çəməni-şəhadət və çirağі-nurbəxşi-dudmani-seyyidüs-səqəleyn və guşvareyi-ərşi-İlah Əbi Abdullah əl-Hüseyn əleyhissəlamın ağazi-ömründən intihayədək vəqayeyi-əhvalın bəyan edər»* (23a). Göründüyü kimi, A.Bakıxanov bu babın farsca adında işlənmiş izafət tərkiblərinin çoxunu *(«seyyedoş-şohəda», «xames-e al-e əba», «pişva-ye əhl-e səbr-o-ebtela»* və s.) olduğu kimi saxlamış, bəzilərinə isə müəyyən söz artırmışdır. Məsələn, o, orijinaldakı *«emam-e soəda»* tərkibini *«imami-zümreyi-süəda»* kimi vermişdir. A.Bakıxanov bu babın türkcə adına özündən də bir sıra silsiləli epitetlər artırmışdır *(laleyi-gülgüni-..., çirağі-nurbəxşi-...., guşvareyi-ərşi-İlah).*

Hər iki əsərdə olan bablardakı fəsillərin adları arasında da müəyyən uyğunluq vardır. Məsələn, «Cəlaül-üyun»dakı beşinci babın əsas fəsli (IX fəsli) belə adlanır: *«Dər bəyan-e təvəccoh-e an emam-e məzlum be-su-ye Erağ və ançe əz-əhl-e kofr-o nefağ be-an emam-e afağ rəsid»* (204b). «Riyazül-qüds»də bu fəsil sıra ilə yeddincidir və bu başlıq altındadır: *«Nuri-dideyi-həzrəti-peyğəmbər və xələfüs-sidqi-dudmani-əbül-bəşər, sərdari-ləşkəri-şühəda cənabi-sultani-Kərbəlanın xitteyi-Hicazdan azimi-diyari-İraq və mövridi-bidadi-zümreyi-əhli-nifaq olmağın bəyan edər»* (41a). İlk baxışda bu iki fəslin adları bir-birindən çox fərqlənir. Əslində isə hər iki fəslin adı imam Hüseynin (ə.) İraqa getməsini və orada «əhli-nifaq» (zülm əhli) tərəfindən zülmkarlıqla qarşılanmasını əks etdirir. Göründüyü kimi, «Cəlaül-üyun»dakı bu adda imam Hüseyn (ə.) üçün sadəcə olaraq «emame-e məzlum» tərkibi işləndiyi halda, A.Bakıxanov «Riyazül-qüds»də imam (ə.) üçün bir neçə tərkib (həzrəti-Peyğəmbərin gözünün işığı, bəşər atası nəslinin sədaqətli xələfi, şəhidlər ordusunun başçısı) işlətmişdir. Qeyd edək ki, A.Bakıxanov «Cəlaül-

üyun»dakı bu fəsli ikiyə bölərək Aşura günü (məhərrəm ayının 10-cu günü) baş verən hadisələr üçün ayrıca bir fəsil ayırmışdır. A.Bakıxanovun bu qərarını əsərdə başlıca yer tutan sözügedən hadisəni daha da qabarıq şəkildə vermək istəyi ilə izah etmək olar. Yeri gəlmişkən onu da əlavə edək ki, «Hədiqətüs-süəda»da bu hadisəyə iki fəsildən ibarət olan ayrıca bir bab həsr olunmuşdur (**29**,227-260). Maraqlıdır ki, A.Bakıxanov «Riyazül-qüds»dəki bu fəslin adını xüsusi bir biçimdə, qafiyəli nəsr şəklində qurmuşdur:

*«Səkkizinci fəsl kim, sərgüzəşti-əhzani-gülşəni-Əhli-beytə bir fəsldür və*

*Ələmxizi-möhnəti-istima'i-firqeyi-əhbab içün müsibəti-əhzanə baisi-vəsldür;*

*Bəlaəngiz və cümleyi-təmhidati-məsaibə bu dastani-rahətsitan, filhəqiqə, əsldür;*

*Dəhşətamizi-səvanihi-şəbü ruzi-Aşuranı və vəqayeyi-hüzni-istimali-şühədanı və keyfiyyəti-şəhadəti-sultani-Kərbə-lanı bəyan edər».* (48a)

A.Bakıxanovun bu fəslə verdiyi ad istər-istəməz Füzulinin «Leyli və Məcnun» poemasındakı nəzm şəklində olan başlıqları yada salır: *«Bu, bünyadi-binayi bəladır və müqəddimeyi-ələmi-ibtiladır»* (**31**,17). Aydındır ki, A.Bakıxanov bu əsərini qələmə alarkən, ümumiyyətlə, Füzuli yaradıcılığının güclü təsiri altında olmuşdur və bu təsir yuxarıdakı fəslin adında da özünü göstərmişdir.

«Cəlaül-üyun» üzərindəki müşahidələr göstərir ki, Məclisi bir ilahiyyatçı alim olaraq, digər əsərlərində olduğu kimi, bu kitabında da şiəliklə bağlı məsələlərə daha çox yer vermiş, onları xüsusi olaraq vurğulamağa, qabartmağa meyilli olmuş və oxucularını bu ruhda tərbiyə etməyə, maarifləndirməyə can atmışdır. Bu da təbii haldır, çünki o, böyük bir ölkənin şeyxülislamı kimi Səfəvilər dövründə hakim məzhəb olan şiəliyi təbliğ etməyi, geniş yaymağı qarşısına başlıca bir məram və məqsəd olaraq qoymuş və bunu bütün əsərlərinin ana

xəttinə çevirmişdir. «Riyazül-qüds» üzərindəki müşahidələr isə göstərir ki, A.Bakıxanov burada daha çox hüznlü və müsibətli, qəmli və kədərli hadisələri işıqlandırmağa meyilli olmuş və onları əsərin baş mövzusu olan Kərbəla faciəsi ilə, hər bir müsəlman üçün ağrılı olan bu qanlı hadisə ilə əlaqələndirməyə, bununla da əsərdə bir ahəngdarlıq yaratmağa çalışmışdır. Məhz buna görə də o, «Cəlaül-üyun»da təsvir edilən çoxçalarlı və əhatəli hadisələr içərisindən ən qəmli, kədərli səciyyə daşıyan məqamları və əhvalatları seçərək ana dilinə sərbəst şəkildə tərcümə etmişdir. Belə bir əməliyyatın nəticəsində, təbii ki, «Riyazül-qüds» bütövlükdə götürdükdə «Cəlaül-üyun»la müqayisədə həcminə görə çox kiçik görünür. Onun ümumi həcmi «Cəlaül-üyun»un təqribən üçdə birinə, bəlkə də dörddə birinə ancaq bərabər olar. Bu iki əsər arasındakı həcm baxımından mövcud fərqlə bağlı müəyyən bir təsəvvür əldə etmək üçün qeyd edək ki, «Cəlaül-üyun»un Azərbaycan MEA M.Füzuli adına Əlyazmalar İnstitutunda saxlanılan əlyazmaları orta hesabla 290-300 vərəq həcmindədir (bax: **80,** 244-254). «Riyazül-qüds»ün yeganə əlyazması isə cəmi 91 vərəqdən ibarətdir. Deməli, onun həcmi «Cəlaül-üyun»un həcmindən azı üç dəfə kiçikdir. Əlbəttə, belə bir müqayisə mütəxəssislər üçün bir qədər bəsit və qeyri-dəqiq görünə bilər, çünki əlyazma çap kitabı deyil, buna görə də onlar ölçülərinə, xətt növlərinə, vərəqlərdəki sətir saylarına və s. kimi paleoqrafik əlamətlərinə görə bir-birlərindən fərqlənirlər. Bununla bağlı onu da qeyd edək ki, istər «Riyazül-qüds»ün əlyazması, istərsə də «Cəlaül-üyun»un araşdırmamızda istifadə etdiyimiz əlyazmaları ölçü, xətt növləri, sətir sayı və s. baxımdan bir-birlərinə çox yaxındır. Hər halda bu iki əsərin əlyazmaları arasında həcm baxımından mövcud fərq göz qabağındadır və bu fərq onların məzmunlarındakı mövcud ayrıntı haqqında müəyyən təsəvvür yaratmağa imkan verir. Bundan əlavə nəzərə alsaq ki, «Riyazül-qüds»ün ümumi həcminin təxminən onda birinə qədəri, əsasən, A.Bakıxanovun özünə məxsus şeirlərindən

ibarətdir, onda bu iki əsərin həcmləri arasındakı fərqlərdə olan nisbət bir qədər də artmış olar.

«Cəlaül-üyun»la «Riyazül-qüds»ün mətnləri arasındakı uyğunluq hər iki əsər boyu açıq-aşkar şəkildə özünü göstərir. Bu uyğunluğun necə səciyyə daşımasını və hansı səviyyədə olmasını əyani şəkildə göstərmək üçün hər iki əsərdəki imam Hüseyn (ə.) haqqında olan beşinci babdakı bir epizodun farscasını və türkcəsini nümunə olaraq veririk.

**«Cəlaül-üyun»da:** *«Əz həzrət-e emam Reza rəvayət kərde əst ke, çun Həğğ-təala əmr kərd həzrət-e Ebrahimra ke, fərzənd-e xod Esməilra ğorban konəd və bəray-e u fədai ferestad və əmr kərd ke, qusfəndra be-əvəz-e u ğorban konəd. Pəs Ebrahim arzu kərd ke, kaş mə'mur nemişodəm be-koştən-e qusfənd və fərzənd-e xodra be-dəst-e xod əz bəray-e Xoda ğorbani mikərdəm, ta anke del-e mən be-koştən-e əziztərin fərzəndan-e mən be-dərd miaməd və mostəhəğ mişodəm be-səbəb-e an ərfə'-e dərəcat-e əhl-e məsaebra. Pəs Həğğ-təala be-su-ye u vəhy kərd ke, ey Ebrahim, kist məhbubtərin-e xəlğ-e mən be-su-ye to? Ebrahim qoft: Xodəvənda, xəlği nəyafəridei ke, məhbubtər başəd be-su-ye mən əz-həbib-e to Mohəmməd... Pəs Həğğ-təala fərmud ke, ey Ebrahim, qoruhi ke, də'vi xahənd kərd ke, əz-ommət-e Mohəmmədənd, Hoseyn - fərzənd-e ura xahənd koşt be-zolm-o-odvan, çenanke qusfəndra koşənd və be-səbəb-e in mostouceb-e ğəzəb-e mən xahənd şod. Pəs Ebrahim be cəzə' aməd və deləş be-dərd aməd və geryan şod. Pəs Həğğ-təala neda kərd ke, fəda kərdəm cəzə'-e tora bər fərzənd-e xod Esməil...» (178a)*

**«Riyazül-qüds»də:** *«İmam Rzadan nəqldir kim, həzrəti-hakimi-əlaliltaq cənabi-mə'budi-bilistihqaq İbrahim Xəlilə əmr etdi kim, kəndü fərzəndi İsmayılı qurban etsün. Sonra onun içün fəda nazil olub zibhi-qusfəndə hökm etdi. Pəs cənabi-Xəlilullah arzu etdi kim, ey kaş, təfdiyə ğənəm olmayub, kəndü fərzəndimi qurban kəsüb əəzzi-övladımın qətli səbəbilə ərfə'i-dərəcati-əhli-məsaibə faiz olaydım. Pəs*

*Həqq-təala ona vəhy etdi kim, ya İbrahim, cümleyi-maxələqəllahidən kimi ziyadə sevərsən? Ərz eylədi: Əşrəfi-məxluqat Məhəmmədül-Mustafanı... Buyurdu: Ya İbrahim, bir güruh kim də'viyi-iman və lafi-mütabiəti-peyğəmbəri-axir-üzzəman edücəkdirlər, onun cigərguşəsi imam Hüseyni zülm və üdvan ilə biyabani-Kərbəlada ləbi-təşnə və tənha gül kibi ə'zayi-lətifin xar və navəki-tir və nuki-şəmşir ilə parə-parə qılub naz ilə bəsləyən bədənin xakü xun içində qəltan edüb, səri-mübarəkin xəncəri-bidad ilə kəsəcəkdürlər. Bu əmri-şəni'ə irtikab etməklən müstövcibi-qəzəb və nüzüli-səxət ilə müəzzəb olacaqdurlar. Bu əxbari-pürməhin istima'indən və bu göftüguyi-dilşikən ittilaindən həzrəti-Xəlilullah qayətdə mütəəllim olub giryə qılduqda xitab yetişdi: Ya İbrahim, etdigün cəzə'i fərzəndin İsmayıla fəda qıldum...» (31b)*

Qeyd edək ki, ixtisarla verdiyimiz bu epizodun ilk hissəsi - İbrahim peyğəmbərin oğlu İsmayılı qurban kəsmək istərkən Allah-taalanın ona qurbanlıq (qoyun) göndərməsi ilə bağlı hadisə məşhurdur və Qur'ani-Kərimdən götürülmüşdür (Saffat, 99-107). Epizodun davamı olaraq verilən hissələr - Allah-taalanın İbrahimə sual şəklində göndərdiyi vəhylər və İbrahimin cavabları isə mətndən də göründüyü kimi, imam Rzanın (ə.) rəvayətinə əsasən verilmişdir. Farsca mətnin məzmununun «Riyazül-qüds»də, demək olar ki, eynilə öz əksini tapdığını nəzərə alaraq, onun çağdaş dilimizə tam tərcüməsini verməyə ehtiyac duymur və birbaşa müqayisəli təhlili üzərində dayanmağı məqsədəuyğun sayırıq. İlk öncə bu mətnin farscası ilə onun türkcə qarşılığında üst-üstə düşən, uyğun gələn məqamları nəzərdən keçirək. Hər iki mətndəki ilk cümlənin məzmunları bir-birlərinə tam uyğun gəlir. Bunu elə farsca cümlədəki bəzi sözlərin türkcə cümlədə də ya eynilə işlənməsi və ya qismən tərcümə edilməsi açıq-aşkar şəkildə sübut edir: ***«əmr kərd»*** *- «əmr etdi»,* ***«fərzənd-e xod»*** *- «kəndü fərzəndi»,* ***«ğorban konəd»*** *- «qurban etsün».* Göründüyü kimi,

A.Bakıxanov farsca mətndəki *«əmr kərd»* və *«ğorban konəd»* fellərinin birinci hissəsini saxlamış, ikinci hissəsini isə onun türkcə qarşılığı ilə vermişdir. O, *«fərzənd-e xod»* ("öz oğlu") izafət tərkibində isə *«fərzənd»* ismini saxlayaraq, *«xod»* əvəzliyini onun qarşılığı ilə - *«kəndü»* əvəzliyi ilə vermişdir. Tərcümədə həcmcə kiçik olan ikinci cümlədə də Bakıxanov orijinaldakı *«qusfənd»* (qoyun) sözünü saxlamış, buradakı *«əmr kərd»* felinin əvəzində isə onun qarşılığını - *«hökm etdi»* felini işlətmişdir. A.Bakıxanov həcmcə nisbətən böyük olan üçüncü cümləsində isə farsca mətndəki *«ərfə'-e dərəcat-e əhl-e məsaeb»* (müsibət əhlinin ən yüksək dərəcəsi) izafət tərkibini eynilə saxlamış *«əziztərin fərzəndan-e mən»* (ən əziz oğlan övladı) tərkibini isə *«əəzzi-övladımın»* (birinci söz «əziz»in üstünlük dərəcəsidir: «ən əziz») şəklində vermişdir.

A.Bakıxanov sonrakı cümlələrdə də farsca mətndə olan *«zolm-o odvən»* (zülm və ədavət), *«mostouceb-e ğəzəb»* (qəzəbə düçar olmaq), *«cəzə'»* (qəm, kədər), *«də'vi»* (iddia) kimi söz və söz birləşmələrini də olduğu kimi saxlamışdır. Ümumiyyətlə, istər bu iki parça bütövlükdə, istərsə də onun tərkibində olan cümlələr ayrı-ayrılıqda məzmunca bir-birinə tam uyğun gəlir. Hər iki nümunədə eyni hadisədən, eyni mövzudan bəhs edilir - bir sözlə, onlar məzmun baxımından bir-biri ilə üst-üstə düşür. Başqa sözlə desək, «Riyazül-qüds»dəki bu epizod eynilə «Cəlaül-üyun»dan tərcümə olunmuşdur.

Bu parçalar arasında müəyyən fərqli cəhətlər də müşahidə olunur ki, bu da, əsasən, iki şəkildə özünü göstərir. Birincisi fikrin ifadə tərzində, bədiilikdə; ikincisi isə cümlə quruluşlarında. Ümumiyyətlə, hər iki əsərin mətnləri üzərindəki müşahidələr göstərir ki, A.Bakıxanov Məclisindən fərqli olaraq, cümlələrini bədii şəkildə qurmağa, fikri daha emosional və canlı şəkildə ifadə etməyə, dəbdəbəli və təmtəraqlı ifadələri, təntənəli ibarələri və uzun silsiləli tərkibləri işlətməyə meyilli olmuşdur

ki, bu da ilk növbədə «Riyazül-qüds»ün adi nəsrlə deyil, qafiyəli nəsrlə qələmə alınması ilə bağlıdır. Bu xüsusiyyət yuxarıdakı parçalarda da açıq-aşkar şəkildə özünü göstərir. Hər iki parçanın müqayisəsində türkcə mətndəki bir çox söz və ifadələrin qarşılığının onun farscasında olmadığını, yəni A.Bakıxanov tərəfindən tərcüməyə artırıldığını müşahidə etmək olar. Məsələn, türkcə mətnin ilk cümləsində qafiyə xatirinə işlənmiş *«hakimi-ələlitlaq»* (mütləq hakim - Allah) və *«mə'budi-bilistihqaq»* (şərafət sahibi - Allah) birləşmələrinin farsca mətndəki qarşılığı yalnız *«Həğğ-təala»* (uca Allah) birləşməsidir. Başqa bir nümunə: farsca mətnin sonunda olan və imam Hüseynin (ə.) adı çəkilən cümlədə Allah-taalanın İbrahimə vəhyindən danışılır. Həmin cümlənin çağdaş dilimizə tərcüməsi belədir: *«Ey İbrahim, bir qrup iddia edəcək ki, Məhəmmədin ümmətindənəm və onun övladı Hüseyni zülm və əzabla öldürəcək, necə ki qoyunu öldürürlər, bu səbəbə görə də mənim qəzəbimə düçar olacaqdır».* Məclisi bu cümlədə ibarəli ifadələr işlətməmiş və fikri sadə şəkildə ifadə etmişdir. Türkcə mətndə bu cümlə: *«Ya İbrahim, bir güruh kim...»* sözləri ilə başlanır və *«xəncəri-bidad ilə kəsəcəklər»* sözləri ilə bitir. Bu iki cümlənin müqayisəsindən aydın görmək olar ki, A.Bakıxanovun burada işlətdiyi *«lafi-mütabiəti-peyğəmbəri-axirüzzəman»* (sonuncu peyğəmbərə tabe olmaq kimi boş sözlər) izafət tərkibi farsca mətndəki bircə sözün - Məhəmməd xüsusi isminin qarşılığıdır. A.Bakıxanov yuxarıdakı birləşməni bu cümlədə ondan əvvəl işlətdiyi *«də'viyi-iman»* (iman iddiası) birləşməsi ilə qafiyə təşkil etmək xatirinə mətnə əlavə etmişdir. A.Bakıxanov burada həmçinin farsca cümlədəki *«fərzənd»* (oğul, övlad) sözünü *«cigərguşə»* (ciyərpara) kimi verməklə yanaşı, bədiilik xatirinə bir sıra söz və ifadələri tərcümənin mətninə artırmışdır: *«biyabani-Kərbəla», «ləbi-təşnə»* (susuz dodaq), *«ə'zayi-*

*lətif»* (lətif üzvlər), *«navəki-tir»* (kaman oxu), *«nuki-şəmşir»* (qılınc ucu), *«səri-mübarək»* (mübarək baş), *«xəncəri-bidad»* (zülm xəncəri) və s. Mütərcimin bu əlavələri, sözsüz ki, fikrin təsir gücünü, onun emosionallığını daha da artırmağa xidmət edir. Qeyd edək ki, bu ifadələrdən ikisi ilə A.Bakıxanov həm də qafiyə yaratmışdır: *navəki-tir* və *nuki-şəmşir.* Beləliklə, A.Bakıxanov bu mətnin tərcüməsində, əsasən, bədiilik xatirinə bir sıra söz və ifadələri də tərcüməsinə artıraraq epizoddakı hadisəni daha emosional şəkildə ifadə etməyə nail olmuşdur.

Mətnlər arasındakı ikinci fərq isə, qeyd etdiyimiz kimi, onlardakı cümlələrin quruluşlarındadır. Belə ki, A.Bakıxanov farsca mətni tərcümə edərkən başlıca diqqəti onun məzmununa yönəltmiş və cümlələlərini orijinalın sintaktik quruluşundan fərqli biçimdə, sərbəst şəkildə qurmağa meyilli olmuşdur. Məsələn, farsca mətnin son cümləsi tabeli mürəkkəb cümlə şəklindədir və sözlərin sırasını saxlamaq şərtilə cağdaş dilimizdə belə səslənir: *«Sonra Haqq-taala səsləndi ki, fəda etdim sənin qəmini öz oğlun İsmayıla».* Göründüyü kimi, tamamlıq budaq cümləli bu tabeli mürəkkəb cümlənin ikinci cümləsindəki *«fəda kərdəm»* (fəda etdim) xəbəri lap əvvəldə işlənmişdir. Bu cümlənin türkcə qarşılığı isə üç cəhətdən ondan fərqlənir. Birincisi, o, mürəkkəb cümlə yox, sadə cümlə şəklindədir. İkincisi, baş cümlədəki *«neda kərd»* (səsləndi) xəbərini A.Bakıxanov sondan ikinci cümlədə verərək bu cümləni vəsitəsiz nitq şəklində qurmuşdur: *«...xitab yetişdi: Aya İbrahim, etdügün cəzə'i fərzəndin İsmayıla fəda qıldum».* Üçüncüsü isə, farsca cümlədəki *«fəda kərdəm»* xəbərinin qarşılığı cümlədə əvvəldə yox, sonda işlənmişdir. Beləliklə, A.Bakıxanov farsca mətndəki son iki cümləni tərcümə edərkən onların quruluşunu dəyişdirmiş və fikrini tam sərbəst şəkildə ifadə etmişdir. Başqa sözlə desək, farsca və türkcə mətnlərdəki cümlələrin çoxu sintaktik quruluş baxımından bir-birindən fərqlənirlər ki, bu da tərcümə nəzəriyyəsində ən mühüm və başlıca müsbət

keyfiyyətlərdən biri kimi dəyərləndirilir.

Yuxarıdakı mətnlə bağlı onu da qeyd edək ki, burada təsvir edilən hadisə, demək olar ki, eynilə Füzulinin «Hədiqətüs-süəda»sında da (təbii ki, həm də Kaşifinin «Rövzətüş-şühəda» əsərində) vardır və burada da həmin rəvayət imam Rzanın (ə.) dilindən söylənilmişdir (bax: **29**, 41). Bu fakt, eləcə də bu qəbildən olan digər oxşar xüsusiyyətlər sübut edir ki, məqtəl kitabı yazan müəlliflər, eləcə də onların mütərcimləri, əsasən, eyni mənbələrdən bəhrələnmiş və bir sıra hallarda bir-birlərini təkrar etmişlər.

«Cəlaül-üyun»la «Riyazül-qüds»ün mətnləri arasında bu cür uyğun gələn hissələr, üst-üstə düşən yerlər hər iki əsərdəki eyni bab və fəsillərin hamısında, ümumiyyətlə, bütün əsər boyu müşahidə olunur. Buna sübut olaraq daha bir kiçik parçanın farsca və türkcəsini nəzərdən keçirək.

**«Cəlaül-üyun»da:** *«Həzrət ba-Horr xetab kərd ke, madərət be-əza-ye to neşinəd, əz-ma çe mixahi? Horr qoft ke, əgər digəri nam-e madər-e məra mibord, motəərrez-e madər-e u mişodəm, əmma dər-həğğ-e madər-e to be-ğeyr əz-tə'zim-o-təkrim soxəni bər-zəban nemitəvanəm avərd. Həzrət fərmud ke, mətləb-e to çist? Horr qoft: Mixahəm tora nəzd-e pesər-e Ziyad bebərəm. Həzrət fərmud ke, mən etaət-e tora nəxahəm kərd. Horr qoft:Mən niz dəst bər nemidarəm. Çun soxən-e işan be-tul əncamid, Horr qoft ke, mən mə'mur naşodəm ke, ba-to cəng konəm. Əknun ke beamədən-e Kufe razi nemişəvi, be-rah-e digər be-ğeyr əz-Mədine boro». (208b)*

**«Riyazül-qüds»də:** *«Həzrəti-sultani-Kərbəla və sərdari-ləşkəri-şühəda Hürrə dedi: Anan matəmində əgləşsün, neçün bizə manesən? Hürr dedi: Əgər özgə kimsə madərim ismin zikr etsə idi, əlbəttə, mən dəxi anasına mütəərriz olurdum, amma anaŋ haqqında tə'zim və təkrimdən savay söz izhar edə bilməzəm. Həzrət buyurdı: Mətləbin nədir? Hürr ərz eylədi: Səni İbn Ziyad yanına aparmaq istərəm. Həzrət imtina edüb, bəsti-kəlam aralarında tuli-əncam*

*olub, axirüləmr, Hürr dedi: Bən müqatiləyə mə'mur degiləm. Çün Kufəyə getməzsən, Mədinə yolundan savay canibə təvəccöh et».* (44a)

Yuxarıda verilmiş nümunə ilə müqayisədə bu nümunədəki cümlələrin farscası ilə türkcələri arasındakı uyğunluq və yaxınlıq daha qabarıq şəkildə nəzərə çarpır. Kufəyə gedən imam Hüseynlə (ə.) onun yolunu kəsən Hürrün (sonradan o, imamın (ə.) dəstəsinə qoşulur və Kərbəlada şəhid olur) söhbəti şəklində qurulan bu epizodun farscası ilə türkcəsini nəinki cümlə-cümlə, hətta söz-söz belə izləmək mümkündür. Bu nümunənin müqayisəsini ayrılıqda hər bir cümlə üzərində quraq. Farsca birinci cümlə çağdaş dilimizdə belə səslənir: *«Həzrət, Hürrə dedi ki, anan matəmində otursun, bizdən nə istəyirsən?».* Cümlənin türkcəyə tərcüməsi məzmunca ona, əsasən, uyğun gəlsə də, onlar arasında müəyyən fərq də özünü göstərir. A.Bakıxanov bu cümlədəki *«madərət be-əza-ye to neşinəd»* deyimini çox uğurla *«anan matəmində əgləşsün»* şəklində çevirərək, farsca ifadədəki *«əza»* sözünü onunla sinonim olan *«matəm»* leksemi ilə əvəzləmiş, digər iki sözü isə onların türkcə qarşılıqları ilə vermişdir. Qeyd edək ki, bu deyim indi də danışıq dilində *«anan matəminə (yasına) otursun»* şəklində işlənir. Bu cümlələr arasındakı fərqə gəldikdə isə, ilk növbədə A.Bakıxanovun mətndəki *«həzrət»* sözünü səc' xatirinə iki birləşmə ilə verməsini qeyd etmək lazımdır: *həzrəti-sultani-Kərbəla və sərdari-ləşkəri-şühəda.* Bundan əlavə, farsca cümlə mürəkkəb quruluşludur: tabeli mürəkkəb cümlə şəklindədir və orada ifadə olunan fikir vasitəli nitq şəklində verilmişdir. Bu cümlənin türkcəyə tərcüməsi isə orijinaldan iki cəhətdən fərqlənir: birincisi, iki sadə cümlədən ibarətdir; ikincisi isə, burada fikir vasitəli nitq yox, vasitəsiz nitq şəklində ifadə olunmuşdur. A.Bakıxanov bunun üçün farsca mətndəki *«ke»* bağlayıcısını tərcümədə buraxmış və orijinaldakı fikri iki cümlə vasitəsilə ifadə etmişdir. Bu cümlələrin orijinalı ilə tərcüməsi arasındakı daha

bir fərq farsca ikinci cümlənin tərkibindəki *«əz-ma çe mixahi»* (bizdən nə istəyirsən) hissəsinin türkcə mətndə *«neçün bizə manesən»* şəklində verilməsidir. Göründüyü kimi, A.Bakıxanov mətnin ümumi məzmunundan çıxış edərək, farsca cümlənin bu hissəsini türkcədə bir qədər incə məna fərqi ilə vermişdir.

Farsca nümunədəki ikinci cümlə də eynilə birinci cümlə kimi, mürəkkəb cümlə şəklindədir. A.Bakıxanov bu cümlənin tərcüməsində də ondakı *«ke»* bağlayıcısını buraxmış və yenə də fikri iki cümlə ilə vasitəsiz nitq şəklində ifadə etmişdir. Farsca cümlə ilə onun tərcüməsi arasındakı uyğunluq burada, demək olar ki, maksimum dərəcədədir. A.Bakıxanov bu cümləni tərcümə edərkən orijinaldakı bir neçə sözü tərcümədə də olduğu kimi saxlamışdır: *«madər», «mütəərriz»* (ad çəkmək), *«tə'zim», «təkrim»* (hörmət etmək). Göründüyü kimi, o, əvvəlki cümlədə farscadakı *«madər»* sözünü türkcəyə tərcümə edərək *«ana»* şəklində verdiyi halda, burada eynilə saxlamış, onunla birləşmə əmələ gətirmiş *«nam»* (ad) sözünün əvəzində isə ərəb mənşəli *«ism»* sözünü işlətmişdir. A.Bakıxanov farsca cümlədəki xəbəri - *«soxəni bər zəban nemitəvanəm avərd»* (dilimə söz gətirə bilmərəm) birləşməsini isə *«söz izhar edə bilməzəm»* şəklində tərcümə etmişdir ki, burada da tam uyğunluq vardır. Deməli, A.Bakıxanov farscadakı bu cümləni, demək olar ki, o dövr üçün nümunəvi sayıla bilən bir biçimdə, çox uğurlu şəkildə tərcümə etmiş, ən başlıcası isə, burada orijinaldakı fikrin məzmununda heç bir dəyişikliyə yol verməmişdir. Bu baxımdan sonrakı - farsca nümunədəki üçüncü cümlənin tərcüməsi daha nümunəvi sayıla bilər. A.Bakıxanov həcmcə çox kiçik olan bu cümləni də iki cümlə şəklində verməsinə baxmayaraq, onu eynilə orijinaldakı kimi, söz-söz çevirmişdir.

«Cəlaül-üyun»dakı sonrakı iki cümlə vəsitəsiz nitq şəklində qurulmuşdur və tərcümədə də eynilə belədir. A.Bakıxanov bu cümlələləri də nümunəvi şəkildə tərcümə etmişdir. Farsca nümunədə Hürrün dilindən verilən cümlə çağdaş dilimizdə belə səslənir: *«İstəyirəm səni Ziyad*

*oğlunun yanına aparam».* Göründüyü kimi bu cümlə quruluşuna görə mürəkkəb cümlədir: intonasiya əsasında qurulmuş tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlədir. A.Bakıxanovun tərcüməsində isə həmin cümlə sadə cümlə şəklindədir. O, farsca mürəkkəb cümlədəki budaq cümləni tərcümədə məsdər tərkibi şəklində vermiş, baş cümlənin xəbərini - *«istəyirəm»* sözünü isə tərcümədə lap sonda işlətmişdir. A.Bakıxanov bununla həm farsca cümlənin məzmununu olduğu kimi saxlamış, həm də tərcümədəki cümləni orijinal biçimdə qurmuşdur. Farsca nümunədəki sonrakı üç cümlə ilə onun türkcə qarşılığı arasında isə müəyyən fərq özünü göstərir. Farsca cümlələrin çağdaş dilimizə tərcüməsi belədir: *«Həzrət buyurdu ki, mən sənə itaət etməyəcəyəm. Hürr dedi: Mən də əl çəkmirəm. Onların söhbəti uzun çəkdiyi üçün Hürr dedi ki, mən səninlə vuruşmaq əmri almamışam».* A.Bakıxanov bu cümlələrin məzmununu ümumiləşdirərək onların qarşılığını türkcə mətndə: *«Həzrət imtina edüb, bəsti-kəlam aralarında tuli-əncam olub»* şəklində, yəni feli bağlama tərkibi formasında ifadə edərək sonrakı cümlə ilə onu tamamlamışdır. A.Bakıxanov bu cümlələrin tərcüməsində də orijinaldakı *«tul»* (uzanma), *«əncam»* və *«mə'mur»* sözlərini olduğu kimi saxlamışdır.

Farsca və türkcə mətnlərdəki sonuncu cümlələr isə istər məzmun, istərsə də quruluş baxımından üst-üstə düşür. Sadəcə olaraq, burada farsca budaq cümlədəki *«razi nemişəvi»* (razı olmursan) xəbəri onun türkcə qarşılığında buraxılmış və *«amədən»* (gəlmək) sözü *«getməzsən»* sözü ilə əvəzlənmişdir ki, bu da onların məzmunlarına elə bir ciddi təsir göstərməmişdir.

Beləliklə, bu nümunənin farscası ilə türkcəsi arasında da bütövlükdə götürdükdə məzmun baxımından uyğunluq və yaxınlığın olması danılmaz bir faktdır. Başqa sözlə desək, «Riyazül-qüds»dəki bu parça çox kiçik və cüzi dəyişikliklərlə eynilə «Cəlaül-üyun»dan tərcümə olunmuşdur.

Həm «Cəlaül-üyun»da, həm də «Riyazül-qüds»də bu

qəbildən olan nümunələrin sayını artırmaq da olar. Ümumiyyətlə, hər iki əsərdə bir-biri ilə tam üst-üstə düşən, uyğun gələn bütöv hissələr, ayrı-ayrı parçalar bütün mətn boyu müşahidə olunur. Bu cür müqayisə və qarşılaşdırma zamanı A.Bakıxanovun «RiyazüI-qüds»ün mətninə etdiyi kiçik əlavələri ilə yanaşı, «Cəlaül-üyun»da olan ayrı-ayrı hissələrin tərcüməsi zamanı bəzi kiçik ixtisarlara da yol verdiyi, yəni farsca mətndəki ayrı-ayrı cümlələri qısaltması və ya tamamilə buraxması halları da müşahidə olunur. Buna nümunə olaraq aşağıdakı nümunənin farscasına və türkcə qarşılığına nəzər salaq.

**«Cəlaül-üyun»da:** *«Çe besyar xahan və moştağ-e leğa-ye əslaf-e geram-e xod gərdidəm manənd-e eştiyağ-e Yə'ğub be-su-ye Yosef. Və bəray-e dəfn-e mən Həğğ-təala boğ'e-ye şərifi exteyar nəmude əst ke, bezudi be-an məkan xahəm rəsid və quya mibinəm ke, dər in zudi ə'za-ye mən pare-pare xahəd şod dər-səhra-ye Kərbəla və çarei nist əz dər-yaftən-e ruziyi ke, moğədder gərdide bəray-e in əmr. Və ma, Əhl-e Beyt be-ğəza-ye Elahi reza dadeim və bər-bəla-ye u səbr minəmayim, ta əta konəd mara behtərin cəza-ye səbr konəndeqan. Və bezudi an ə'za-ye pare-pare dər xater-e ğods nəzd-e həzrət-e resalat moctəme' xahəd gərdid və Həğğ-təala dide-ye ura rouşən xahəd gərdanid və və'dha-ye xodra be-əməl xahəd avərd... Və hər kera arzu-ye şəhadət başəd və xahəd ke, can dər nosrət-e ma bazəd və be-səadət-e əbədi faez gərdəd ba-ma rəfiğ şəvəd ke, fərda rəvaneim, enşaallah-təala».* (204b)

**«Riyazül-qüds»də:** *«Bən ziyadə müştaqəm əslafi-giramiyəm liqasına həzrəti-Yə'qubdan Yusif tərəfinə. Və Həqq-təala bənim dəfnim içün bir büq'eyi-şərifə ixtiyar etmişdür kim, ənqərib ol məkanə varid oluram. Guya görirəm kəndü peykərimi parə-parə və mətruhi-xunaludə. Pəs, əmri-İlahiyə təslim və əziməti-şəhadət iradəsində təsmim edərəm və təhsili-rizayi-Xuda və Rəsul içün dəşti-möhnətxizi-İraqə gedərəm. Hər*

*kim tərki-həyati-müstəari-bisəbat edüb bana mülhəq olur, yarın ahəngi-səfər müqərrərdür, inşaallah-təala».* (41b)

Nümunələrin müqayisəsi açıq-aşkar göstərir ki, A.Bakıxanov «Cəlaül-üyun»dakı bu parçanı çox dəqiq tərcümə etməyə çalışmışdır. O, farsca mətndəki bir çox söz və ifadələri yenə də eynilə tərcümədə də saxlamışdır: *«müştaq»* (arzu, istək), *«əslafi-girami»* (əziz sələflər), *«liqa»* (üz, sifət), *«buq'eyi-şərifə»* (şərif yer), *«parə-parə»* (tikə-tikə) və s. Mütərcim farsca nümunənin məzmununu da, bütövlükdə götürdükdə, əslinə uyğun şəkildə tərcümə etmişdir.

Bununla belə, bu iki nümunə arasında həcm baxımından müəyyən fərq olduğu da açıq-aşkar şəkildə özünü göstərir: farsca mətn həcminə görə onun türkcəyə tərcüməsindən bir qədər böyükdür. Deməli, A.Bakıxanov bu nümunənin tərcüməsində müəyyən sərbəstliyə də yol vermiş, daha doğrusu, onun müəyyən hissəsini ixtisarla tərcümə etmişdir. Aydınlıq üçün qeyd edək ki, A.Bakıxanov farsca nümunədəki sondan ikinci cümlənin yalnız bir hissəsinin məzmununu türkcə mətndə ümumiləşdirilmiş şəkildə vermiş, onun böyük bir hissəsini isə buraxmışdır. Həmin hissədə Əhli-beytin İlahi yazısına razılıq verməsi, Onun bəlalarına səbir etməsi göstərilir ki, bu fikir türkcə mətndə də dolayısı ilə ifadə olunmuşdur. Həmin hissədə imam Hüseynin (ə.) dilindən verilmiş bir cümləni isə A.Bakıxanov tərcümə etməmişdir. Sayca dördüncü olan həmin cümlənin çağdaş dilimizə tərcüməsi belədir: *«Tezliklə bu tikə-tikə edilmiş əzalar müqəddəs yerdə həzrət Peyğəmbərin yanında bir yerə yığılacaq, Allah-taala Onun gözlərini aydın edəcək və öz vədlərinə əməl edəcəkdir».* Göründüyü kimi, farsca mətndəki sözügedən cümlənin bu hissəsinin qarşılığı türkcə mətndə yoxdur. Çox ehtimal ki, A.Bakıxanov həmin hissəni buraxmışdır. Bununla belə, həmin hissənin A.Bakıxanovun istifadəsində olan «Cəlaül-üyun»un əlyazmasında olmamasını da istisna etmirik.

«Cəlaül-üyun»la «Riyazül-qüds»ün mətnləri üzərindəki müşahidələrə əsasən deyə bilərik ki, A.Bakıxanov klassik

tərcümə sənəti üçün daha səciyyəvi olan sərbəst tərcümə ənənəsinə (bax: **55**, 30-41) üstünlük vermişdir. O, «Cəlaül-üyun»dakı hər hansı bir hissəni və ya parçanı çevirərkən tərcümədə onun ümumi məzmununu saxlamağa çalışmış və bir sıra hallarda farsca mətnin məzmununu ixtisar şəklində tərcümə etməklə yanaşı, özünün kiçik əlavələrini də türkcə mətnə daxil etmişdir. Bu əlavələrin böyük bir qismi nəsr arasındakı nəzm parçalarına aiddir. Ümumiyyətlə, A.Bakıxanov «Cəlaül-üyun»u tərcümə edərkən fikrin bədii şəkildə ifadəsinə can atmış, bu məqsədlə də tez-tez nəzm parçalarına üz tutmuşdur. Aşağıdakı parçanın farscasında və onun türkcəyə tərcüməsində bunu əyani şəkildə görmək olar:

**«Cəlaül-üyun»da:** *«Pəs Səkine, doxtər-e an həzrət məğnəe əz-sər keşid və qoft: Ey pedər-e bozorgvar, tən bemərg dər dadei və mara be-ki miqozari? An emam-e məzlum gerist və fərmud ke, ey nur-e dide, hər ke yavəri nədarəd, yə'ğin ke, mərgra bər-xod ğərar midəhəd. Ey doxtər, yavər-e həme Xodast və rəhmət-e Xoda dər-donya və oğba əz-şoma coda nəxahəd şod. Səbr konid bər ğəzaha-ye Xoda və şekibai vərzid ke, bezudi donya-ye fani monğəzi migərdəd və nəim-e əbədi-ye axerət zəval nədarəd».* (223a)

**«Riyazül-qüds»də:** *«Səkineyi-biqərinə miqnəisin başından alub dedi: Ey pədəri-qəmgüsar, hala kim əziməti-qitalə müsəmməm olubsan və giribani-vücudini pənceyi-məmatə müsəlləm qılubsan, bizi kimin kəfalətində qoyub gedərsən? Səndən sonra bizə kafili-əncami-müham və baisi-təhsili-məram kim olur? Nəzm:*

*Yetim olan kəsə, əlbəttə, qəmgüsar olmaz,*
*Zəlili-aləm olur, izzü e'tibar olmaz.*
*Bəlalər içrə qalur dərbədər, dəmi keçməz*
*Ki, bağrı qanə dönüb dideyi-əşkbar olmaz.*

*Həzrəti-imami-aliməqam məqali-məlaləfzasından mü-*

*təəssir olub, əşki-həsrət nərgisi-şəhlasından töküb buyurdı: Ey səbiyyeyi-bərgüzidə və nari-dideyi-sitəmrəsidə, hər kimün yavəri olmasa, mövti kəndüsinə müqərər qılur. Ey Səkinə, bikəslər mədədkarı Əliyyi-ə'ladur və biçarələr qəmgüsarı Xaliqi-yektadur. Qəzayi-mə'budə riza verin və gəzəndi-həvadisdən məsun olunmaqçün daireyi-təslimə girün, zira kim ümuri-dünyəvi mə'rəzi-fənadır və nəimi-axirət mütəzəmmini-bəqadır».* (62a-b)

Bu iki parçada eyni hadisədən danışılır və onların məzmunu da eynidir: istər farsca mətndə, istərsə də türkcə mətndə Hüseynlə (ə.) qızı Səkinənin söhbəti verilmişdir. İmamın (ə.) şəhid olmaq barədə qərarının qəti olduğunu bilən Səkinənin: *Bəs bizi kimə tapşırırsan?* - sualına atası cavabında deyir: *Allahın yazısı ilə barışmaq lazımdır. Sizin yardımçınız Allahdır və axirət səadəti əbədidir.* Bu nümunədə də A.Bakıxanov farsca mətndə olan bəzi söz və ifadələri tərcümədə saxlamışdır: *«pədər»* (ata), *«yavər»* (köməkçi), *«qəza»* (qismət, tale), *«nəim»* (səadət) və s.

Bununla belə, türkcə mətn farsca mətndən ilk növbədə bədiiliyi, yüksək sənətkarlıq xüsusiyyətləri ilə - bir sözlə, bəlağətli bir dillə qələmə alınması ilə seçilir. Buradakı *«giribani-vücud»* (bədənin yaxası), *«pənceyi-məmat»* (ölüm pəncəsi), *«əşki-həsrət»* (gözdən axan həsrət yaşı), *«nərgisi-şəhla»* (şəhla göz), *«nuri-didə»* (göz işığı) və s. kimi ifadələr, əsasən, yüksək üslubda qələmə alınmış klassik ədəbiyyat nümunələri səciyyəvidir və A.Bakıxanov onları çox uğurla və yerli-yerində işlətmişdir. A.Bakıxanovun daha çox qafiyəli nəsr xatirinə işlətdiyi bu ifadələr hesabına türkcə mətn həcminə görə mətndən böyük alınmışdır. Bu fərqi doğuran ikinci amil A.Bakıxanovun bilavasitə mövzu ilə bağlı tərcüməyə artırdığı iki beytlik şeir parçasıdır.

Beləliklə, bu nümunədə türkcə mətn istər fikrin yüksək üslubda və daha emosional tərzdə ifadəsinə, istərsə də həcminin böyüklüyünə görə onun farsca qarşılığından fərqlənir. Məzmuna

gəldikdə isə, onlar arasında elə bir ciddi fərq müşahidə olunmur. Qeyd edək ki, «Cəlaül-üyun»da bu epizoddan sonrakı cümlədə imam Hüseynin (ə.) oğlu Zeynəlabidini yanına çağıraraq onu özünün xəlifəsi və canişini təyin etməsindən danışılır (223a). Həmin cümlənin tərcüməsi «Riyazül-qüds»də də vardır. «Cəlaül-üyun»da daha sonra imam Hüseynin (ə.) hələ İraqa yola düşməzdən öncə şəhid olacağını bilməsi, buna görə də Kərbəlaya getməzdən qabaq peyğəmbərlərə məxsus kitabları və digər əmanətləri Peyğəmbərin (s.) zövcəsi Ümm Sələməyə tapşırması təsvir olunur. Bundan əlavə burada göstərilir ki, imam Hüseyn (ə.) imam Zeynəlabidinin (ə.) xəstə olduğunu nəzərə alaraq vəsiyyətnaməsini ona deyil, öz qızı Fatiməyə verir (223a). Bu məlumatlar «Riyazül-qüds»də bütövlükdə yoxdur. «Cəlaül-üyun»dakı bu məlumatlardan sonrakı hissə - imam Hüseynin (ə.) şəhadət kəmərini belinə bağlayaraq döyüş üçün meydana atılması və rəcəz oxuması haqqında olan epizod isə eynilə «Riyazül-qüds»də də vardır (bax: **104,** 223a; **14,** 62b).

Deməli, A.Bakıxanov hər hansı bir parçanı birbaşa tərcümə etdikdə belə yeri gəldikcə müəyyən məqamlarda kiçik ixtisarlara da yol vermişdir. Bu hal ötəri səciyyə daşımır, əksinə bütün əsər boyu müşahidə olunur.

«Cəlaül-üyun» və «Riyazül-qüds» əsərlərinin mətnlərinin müqayisəli təhlili göstərir ki, A.Bakıxanov Məclisinin əsərindən bilavasitə tərcümə etdiyi hissələrin çoxunda, qeyd etdiyimiz kimi, sərbəstliyə daha çox meyilli olmuşdur. Bu sərbəstlik təkcə orijinalın mətnindəki ayrı-ayrı hissə və ya epizodların buraxılması və ya qafiyəli nəsr xatirinə tərcümədə müəyyən söz və ifadələrin mətnə artırılması ilə məhdudlaşmır, həm də ümumiyyətlə, tərcümə sənətinə olan münasibətdə də özünü göstərir. Hər iki əsərin mətnlərinin qarşılaşdırılması belə bir qənaətə gəlməyə əsas verir ki, A.Bakıxanov «Cəlaül-üyun»dakı müəyyən hissəni və parçanı ana dilinə çevirərkən orijinalın sintaktik quruluşunun təsiri altına düşməmiş, əksinə

cümlələrini sərbəst şəkildə, orijinaldakından fərqli biçimdə qurmağa çalışmışdır. Aşağıdakı nümunənin orijinalı ilə tərcüməsinin qarşılaşdırılması bunu əyani şəkildə sübut edir.

**«Cəlaül-üyun»da:** *«Həzrət-e İsa dər səhraha çun ba həvariyyun səyahət minəmud, be səhra-ye Kərbəla obur fərmud. Və çun daxel-e an səhra şod və xast ke, əz-an səhra birun rəvəd, şiri bər sər-e rah-e işan aməd. İsa fərmud ke, ey şir, çera sər-e rah-e ma gereftei? Şir be əmr-e Xodavənd-e ğədir be soxən aməd və be zəban-e fəsih qoft: Nemiqozarəm əz-in səhra birun rəvi, ta lə'nət koni ğatel-e Hoseynra. İsa qoft: Hoseyn kist? Şir qoft: Fərzəndzade-ye nəbiyyi-ommi və fərzənd-e Əliyyi-vəliyy. İsa qoft: Koşənde-ye u kist? Şir qoft ke, Yezid əst ke, vəhşiyan və dərəndeqan - həme ura lə'nət mikonənd, xosusən dər əyyam-e Aşura. Pəs İsa dəst be doa bər daşt və Yezidra lə'nət kərd və həvariyyun amin qoftənd və şir dur şod və işan əz an zəmin birun rəftənd».* (182a-b)

**«Riyazül-qüdsdə»:** *«Bir gün həngami-səyahətdə həvariyyun ittifaq ilə həzrəti-Ruhullah İsa bin Məryəm badiyeyi-Kərbəlayə daxil olduqda bir şiri-zeh, şiri-dəlir onlara qət'i-məmərr və səddi-mibər edüb manei-əzimət oldı. Həzrəti-Məsih dedi: Ey heyvan, neçün bizlərə mane olursan və bisəbəb təərrüz qılursan? Ol şir əmri-Rəbbi-qədir ilə nitqə gəlüb dedi: Ya Ruhullah, bu mənzili-cangüsəl şəhidi imam Hüseynə ki, o nuri-çeşmi-Məhəmmədül-Mustəfa və cigərguşeyi-Əliyyül-Murtəzadır, onun qatilinə lə'nət etməyincə bu mənzildən keçmək sizə mümkün olmaz. İsa dedi: Onun qatili kimdir?*

Məsələn, türkcə nümunənin ilk cümləsində işlənmiş *«bir gün», «dəlir»* (igid), *«səddi-mibər»* (yolu kəsmək) kimi söz və ifadələrin qarşılığı farsca mətndə yoxdur, deməli, onlar A.Bakıxanovun əlavələridir. Qeyd edək ki, bu əlavələrdən birincisi - *«bir gün»* zaman zərfliyi təhkiyə üslubu baxımından yerində işlənmişdir. Həmin cümlədəki *«dəlir»* sözünü və *«səddi-mibər»* birləşməsini isə A.Bakıxanov qafiyə xatirinə

mətnə artırmışdır: *şir-dəlir; qət'i-məmərr* (yolu kəsmək) – *səddi-mibər*. Türkcə mətndəki üçüncü cümlədə işlənmiş *«bisəbəb təərrüz qılursan»* cümləsini də A.Bakıxanov qafiyəli nəsr xatirinə özündən artırmışdır. Həmçinin burada Yezid üçün işlədilmiş *«ənid»* (şər adam, yaramaz) sözü, *«mütəvəttini-məlai-ə'la»* (səmada yaşayanlar, mələklər) və *«sakinini-ərzü səma»* (yerdə-göydə yaşayanlar) birləşmələrinin qarşılığı da farsca mətndə yoxdur və qafiyəli nəsrə görə türkcə mətnə əlavə edilmişdir. Bu nümunələr arasında ikinci fərqli cəhət isə A.Bakıxanovun işlətdiyi cümlələrin quruluş baxımından farsca orijinalından seçilməsi, fərqli biçimdə qurulmasıdır. Məsələn, farsca ikinci cümlə tamamlıq budaq cümləsi şəklində qurulduğu halda, A.Bakıxanovun cümləsi feli bağlama tərkibli sadə geniş cümlə şəklindədir. Sonrakı cümlələrin quruluşlarında da orijinalla müqayisədə müəyyən fərqli cəhətlər özünü göstərir.

«Cəlaül-üyun»la «Riyazül-qüds»ün bab və fəsillərinin adlarına gəldikdə isə onların çoxu bir-birinə, əsasən, uyğun gəlsə də, burada da müəyyən incə fərqli xüsusiyyətlər müşahidə olunur.

«Riyazül-qüds»ün «Cəlaül-üyun» əsərindən sərbəst və yaradıcı şəkildə tərcümə edildiyini hər iki əsərin eyni hissələrində olan əksər cümlələrin müqayisəsi və qarşılaşdırılması da əyani şəkildə sübut edir. Nümunə olaraq hər iki əsərdəki aşağıdakı üç cümləyə diqqət yetirək.

***1. Ya Əli, be-hər ke mosibəti berəsəd, mosibət-e məra yad konəd ke, an əzimtərin-e mosibət hast.* (40b)**

*Ya Əli, hər kimə bir müsibət irdükdə bənim müsibətimi yad etsün, zira kim, əfzə'i-məsaib olduğunda ehtimali-şəkk yoxdur.* (6b)

**2. *Koleyni və digəran be-sənədha-ye səhih əz-həzrət-e Sadeğ əleyhossəlam rəvayət kərdənd ke, həzrət-e Fateme bə'd əz-pedər-e bozorgvar-e xod həftad-o-pənc ruz dər-donya mand və hozn-e şədidi bər-an həzrət daxel şode bud.* (78b)**

*Küleyni və qeyrə sənədi səhih ilə həzrəti-Sadiq əleyhissəlamdan nəql etmişlər kim, həzrəti-Fatimə pədəri-namdarından sonra yetmiş beş gün dünyada olub, hüzni-şədid ol cənabə daxil idi.* (lla)

**3. *Ya Hoseyn, tora souqənd midəhəm ke, ba in qoruh moğatele nənəmai ke, koşte xahi şod.* (208b-209a)**

*Ya İbn Rəsulullah, saŋa souqənd verirəm ki, bu güruh ilə müqatilə qılmayasan kim, həlak olursan.* (44b)

Birinci cümlənin farscası ilə türkcəsinin bir-birinə nə dərəcədə uyğun gəldiyini, daha doğrusu, ikincinin birincidən bir qədər sərbəst şəkildə tərcümə olunduğunu ilk növbədə «Cəlaül-üyun»da işlənən ayrı-ayrı leksik vahidlərlə onların «Riyazül-qüds»dəki qarşılıqlarının müqayisəsində görmək mümkündür: ***be-hər ke*** - *hər kimə;* ***mosibəti berəsəd*** - *müsibət irdükdə;* ***yad konəd*** - *yad etsün.* Bu leksik vahidlərdən birincisi ilə üçüncüsü istər leksik-semantik baxımdan, istərsə də qrammatik quruluşlarına görə bir-birlərinə tam uyğun gəlir. Farsca cümlədəki birinci söz - ***hər ke*** qeyri-müəyyən əvəzliyi fars dilində yönlük hal məzmununu bildirən ***be*** önqoşması ilə işlənmişdir, onun türkcə qarşılığı da yönlük haldadır. Eləcə də farsca cümlədəki *«yad konəd»* tərkibi feli fars dilində əmr şəklində işlənmişdir, onun türkcə qarşılığı da eyni biçimdədir. Farsca cümlədəki *«mosibət»* ismi ilə işlənmiş *«berəsəd»* (çatsa, gəlsə) feli isə fars dilində şərt şəklində olduğu halda, onun türkcə qarşılığı *«irdükdə»* (çatdıqda, gəldikdə) feli bağlama şəklindədir. Bununla belə, onlar qrammatik quruluş baxımından fərqlənsələr də, leksik-semantik cəhətdən bir-birlərinə tam uyğun gəlir.

Cümlələrin ikinci tərəflərində isə müəyyən fərqli cəhətlərin olması göz qabağındadır. Belə ki, farsca mürəkkəb cümlənin tərkibindəki sonuncu tərəfin - *«an əzimtərin-e mosibəthast»* (o, ən böyük müsibətdir) cümləsinin türkcə qarşılığı, birincisi, farscadakı kimi cəmi

üç sözdən yox, altı sözdən ibarətdir. İkincisi isə, türkcə cümlədəki: *«ehtimali-şəkk yoxdur»* leksik vahidlərinin qarşılığı farsca cümlədə yoxdur, deməli, mütərcim əlavəsidir. Bundan əlavə, türkcə cümlədəki *«əfzə'i-məsaib»* (ən qəmli müsibətlər) birləşməsinin birinci tərəfi onun farsca qarşılığından incə məna fərqi ilə seçilir; farscada: *ən böyük,* türkcədə isə: *ən qəmli.* Bununla belə, bütövlükdə götürdükdə sözügedən iki əsərdən götürülmüş bu cümlələrin məzmunları üst-üstə düşür və bu baxımdan onlar arasında açıq-aşkar bir uyğunluq, uyarlıq olduğu heç bir şübhə doğurmur. Deməli, «Riyazül-qüds»dəki bu cümlələr «Cəlaül-üyun»dan tərcümə olunmuşdur. Qeyd edək ki, yuxarıdakı cümlələr hər iki əsərdə Məhəmməd peyğəmbər (s.) haqqında olan birinci babdandır və o həzrətin dilindən verilmişdir.

Adı çəkilən əsərlərdəki ikinci cümlələr həzrət Fatimədən (ə.) bəhs edən ikinci babdan götürülmüşdür. Yuxarıdakı birinci nümunə ilə müqayisədə bu cümlələr arasındakı uyğunluq və yaxınlıq dərəcəsi daha qabarıq şəkildə özünü göstərir. Belə ki, bu cümlələrin istər qrammatik quruluşu, istərsə də onlarda istifadə olunmuş leksik vahidlər bir-biri ilə tam üst-üstə düşür. Başqa sözlə desək, türkcə cümlə farsca cümlənin sırf tərcüməsidir, artıq buna başqa ad vermək mümkün deyil. Bu cümlələrdə istifadə olunan leksik vahidlərin çoxunun eyni olması göz qabağındadır: ***sənədha-ye səhih*** - *sənədi-səhih;* ***rəvayət kərdeənd*** - *nəql etmişlər;* ***dər-donya mand*** - *dünyada olub;* ***hozn-e şədidi*** - *hüzni-şədid;* ***bər-an həzrət daxel şode bud*** - *ol cənabə daxil idi.* A.Bakıxanov bu cümlənin tərcüməsində yalnız iki kiçik dəyişiklik etmişdir: farsca cümlədə cəmdə olan *«sənədha»* (sənədlər) sözünü təkdə *«sənəd»* kimi vermiş və *«pedər-e bozorgvar»* (ulu ata) birləşməsinin ikinci tərəfini - *«bozorgvar»* (ulu, böyük) sifətini *«namdar»* (adlı-sanlı, şöhrətli) sifəti ilə əvəz etmişdir: ***pedər-e bozorgvar*** - *pədəri-namdar.*

Hər iki əsərdəki beşinci babdan götürülmüş üçüncü cümlələr

də istər məzmunca, istərsə də sintaktik quruluş baxımından biri-birinə uyğun gəlir. A.Bakıxanov bu cümləni də sırf tərcümə etmişdir; o, farsca cümlədəki bütün sözləri eynilə ya saxlamış, ya da onların yerinə türkcə qarşılıqlarını qoymuşdur. Bu cümlə arasındakı yeganə fərq farsca cümlədəki Hüseyn xüsusi isminin (imam Hüseynin) İbn Rəsulullah (lüğəvi mənası: Allahın elçisinin oğlu) xüsusi ismi ilə əvəzlənməsi və birincidəki *«koşte xahi şod»* (ölürsən) felinin əvəzində oxşar mənalı *«həlak olursan»* feli ilə işlənməsidir ki, bu da onlar arasında heç bir dəyişikliyə gətirib çıxarmamışdır və təbii qəbul edilməlidir.

Beləliklə, «Cəlaül-üyun» və «Riyazül-qüds»dəki bu üç nümunənin müqayisəsi onlar arasında tam bir uyğunluq olduğunu, daha doğrusu, türkcə cümlələrin farsca cümlələrdən tərcümə olunduğunu açıq-aşkar sübut edir. Hər iki əsərdə bu qəbildən olan cümlələr çoxdur və onların sayını artırmaq da olar, lakin, təbii ki, elə yuxarıdakı nümunələrin özü də bu barədə konkret bir qənaətə gəlməyə əsas verir və bu baxımdan yetərlidir.

Hər iki əsərin mətnləri üzərindəki müşahidələr göstərir ki, A.Bakıxanov «Cəlaül-üyun»u tərcümə edərkən, bir qayda olaraq, fars dilinin sintaktik quruluşunun təsiri altına düşməmiş və cümlələlərini ana dilinin sintaktik normalarına əməl etməklə, sərbəst şəkildə qurmağa can atmışdır. Bunu yuxarıdakı cümlələrin nümunəsində də açıq-aşkar görmək olar. Bununla belə, A.Bakıxanov nadir hallarda «Cəlaül-üyun»dakı bəzi cümlələrin tərcüməsində onların quruluşunu, sintaktik qəliblərini də olduğu kimi saxlamışdır. Nümunə olaraq aşağıdakı cümlənin farscasına və onun türkcəyə tərcüməsinə nəzər salaq:

*Mixahi, tora be-əmri də'vət konəm ke, baes-e şərəf və axerət-e to başəd* (112a)

*Sevərmisən, səni dəvət edim bir əmrə ki, baisi-şərəfi-dünya və axirət ola.* (15a)

Bu cümlələr söz sırası baxımından, demək olar ki, tam üst-üstə düşür. Hər iki cümlə mürəkkəb quruluşlu tabeli mürəkkəb

cümlədir, onlardakı budaq cümlənin növləri də (tamamlıq və təyin) eynidir. A.Bakıxanov bu cümlənin tərcüməsində söz sırası baxımından bircə dəyişiklik etmişdir: farsca cümlədəki *«də'vət konəm»* (dəvət edəm) xəbərinin yerini türkcədə dəyişdirmişdir. Bu iki cümlə məzmunca da bir-biri ilə tam üst-üstə düşür ki, bunu da farsca cümlədə işlənmiş *«əmr»* (iş) sözünün, *«baes-e şərəf və axerət»* birləşməsinin türkcə cümlədə də saxlanılmasında görmək mümkündür. A.Bakıxanov bu cümləni tərcümə edərkən sonda ona *«dünya»* sözünü də əlavə etmişdir. Maraqlıdır ki, o, farsca cümlədəki ilk sözü - *«mixahi»* (istəyirsən) lesik vahidini *«sevərmisən»* kimi tərcümə etmişdir. Aydındır ki, burada həmin *söz «istəyirmisən»* mənasını daşıyır. Qeyd edək ki, orijinalın sintaktik quruluşunun eynilə tərcümədə də saxlanılması daha çox Nişatinin «Şühədanamə» tərcüməsində müşahidə olunur (bax: **56**, l58-171). Bu hal xüsusilə təyin budaq cümləli tabeli mürəkkəb cümlələrdə özünü göstərir. Məsələn: *«Böyük qardaşı ki, adı İbrahim idi dedi»* (**75**, 191b). Yeri gəlmişkən qeyd edək ki, bu tipli cümlələrə bir sıra müəlliflərin orijinal əsərlərində də rast gəlirik. Məsələn, M.F.Axundzadənin «Aldanmış kəvakib» əsərindəki aşağıdakı cümlə buna nümunə ola bilər: *«Pişxidmətlər əllərində məcmə ilə ki, içində xələti-şahanə qoyulmuşdu, dükana ayaq basdılar»* (**6**, 28). Bu tipli cümlələr, təbii ki, fars dilinin sintaktik quruluşunun təsiri ilə yaranmışdır.

«Riyazül-qüds»də bu cür quruluşlu cümlələr çox azdır və onlardan bəziləri farsca orijinallarından bu baxımdan fərqlənir. Nümunə olaraq aşağıdakı cümlənin farscasına və türkcəsinə diqqət yetirək.

**«Cəlaül-üyun»da:** *Aya şərm nədari ki, sər-e pedər-e mən Hoseyn-fərzənd-e Fateme-vo-Əli və cegərquşe-ye rəsul-e Xoda bər-dərvazeye şəhr avixte əst.* (239a)

**«Riyazül-qüds»də:** *Aya şərm etməzsən, ol baş kim, cənabi-peyğəmbər kəndü qucağında yüz naz ilə bəslə-yübdür, bu növ bimiqdar edərsən?* (75a)

«Cəlaül-üyun»dakı bu cümlə tamamlıq budaq cümləsi tabeli

mürəkkəb cümlədir və onun budaq cümləsindəki *Hoseyn* sözünün əlavəsi işlənmişdir. A.Bakıxanov bu cümlənin məzmununu tərcümədə əsasən saxlasa da, cümləsini orijinaldan fərqli biçimdə - mürəkkəb quruluşlu tabeli mürəkkəb cümlə şəklində qurmuşdur: onda həm tamamlıq budaq cümləsi, həm də təyin budaq cümləsi işlənmişdir. Deməli, «Riyazül-qüds»dəki cümlənin bu tipi - onda işlənmiş təyin budaq cümləsi farsca mətnin sintaktik təsirinin nəticəsi kimi qəbul edilə bilməz. Məlum olduğu kimi, XIX əsr Azərbaycan müəlliflərinin bir çoxu ilk təhsillərini ərəb və fars dillərində almışlar və təbii ki, onların nitqlərində, yazılarında bu dillərin, xüsusilə də fars dilinin cümlə quruluşunun müəyyən təsiri olmuşdur. Bu təsir, təbii ki, A.Bakıxanovun, eləcə də M.Axundzadənin yaradıcılığında da özünü göstərir. Yuxarıdakı cümlələrlə bağlı onu da qeyd edək ki, onların birinci hissəsi tam eynidir: ***aya şərm nədari*** - *aya şərm etməzsən.* Cümlələrin davamı olan ikinci hissə isə incə məna fərqləri ilə bir-birindən seçilir. Farsca cümlədə *imam Hüseynin başı* mübtədasının əlavəsi kimi *«Fatimə və Əlinin övladı, Allahın elçisinin ciyərparası»* sözləri işləndiyi halda, A.Bakıxanovun cümləsində, göründüyü kimi, ilk sözlər yoxdur, peyğəmbərin adı çəkilən hissə isə bir qədər başqa şəkildədir. Bundan əlavə, farsca cümlədə imamın başının şəhər darvazasından asılması, onun türkcəsində isə başla yaramaz davranışdan danışılır. Bütün bunlar isə A.Bakıxanovun tərcümə zamanı yol verdiyi sərbəstliklə bağlıdır.

«Cəlaül-üyun»la «Riyazül-qüds»ün müqayisəli təhlilini hər iki əsərdəki eyni fəsillərin ümumi məzmunları üzərində də apardıq və onlar arasında bu baxımdan da, əsasən, bir uyğunluq olduğu qənaətinə gəldik. Nümunə olaraq «Cəlaül-üyun» əsərinin beşinci babındakı imam Hüseynin (ə.) əmisi oğlu Müslim bin Əqilin Kufəyə getməsindən və orada şəhid olmasından bəhs edən on üçüncü fəslin qısa məzmununu veririk:

İmam Hüseyn (ə.) Kufə camaatından beyət almaq (onun

hakimiyyətini qəbul etmək) üçün əmisi oğlu Müslim bin Əqili ora göndərir. Müslim iki nəfərlə birgə Kufəyə tərəf yola düşür. Onlar səhrada yolu itirirlər və Müslimin yoldaşları susuzluqdan ölürlər. Müslim imama məktub yazaraq bu hadisəni ona çatdırır və məsləhət olarsa, geri qayıtmasını xahiş edir. İmam (ə.) isə cavab məktubunda Müslimə yazır ki, yolunu davam etdirsin. Müslim yolda bir ovçunun ahu ovladığını görərək düşünür ki, inşallah, düşmənimi öldürəcəyəm. Bununla belə, ürəyində bu hadisədən bərk narahat olur. O, Kufəyə gələrək burada Muxtar bin Əbi Übeydə Səqəfinin evinə düşür. Müslimi burada yaxşı qarşılayırlar və tezliklə 18 min nəfər imamın hakimiyyətini qəbul edir. Müslim bu barədə imama (ə.) məktub yazaraq Kufəyə gəlməyin münasib olduğunu bildirir. Şəhərin valisi Neman bin Bəşir bundan xəbər tutaraq məsciddə camaata deyir ki, Allahdan qorxun və belə bir işə qol qoymayın. Bu məsciddə olan Abdullah bin Müslim adlı bir əyan xəlifə Yezidə məktub yazaraq məsələni ona çatdırır. Yezid Bəsrə valisi Übeydullah bin Ziyadı Kufəyə vali təyin edir və ona tapşırır ki, ya Müslimi tutub yanıma göndər, ya da qətlə yetir. Übeydullah Kufəyə yola düşür, şəhər camaatı onu imam Hüseyn (ə.) təsəvvür edərək yanına gəlir və ehtiramla qarşılayır. Sonra məlum olur ki, o, yeni təyin olunan validir. Übeydullah şəhərin varlılarını yanına çağıraraq onlara bildirir ki, Yezidin əleyhinə çıxanlar ağır cəzalandırılacaqlar. O, Müslimin yerini öyrənmək üçün casus göndərir. Bundan xəbər tutan Müslim, Hani bin Ürvənin evində gizlənir. Übeydullah, Hani bin Ürvəni yanına çağıraraq Müslimi ələ verməsini tələb edir. Hani razılaşmır, onu öldürürlər. Müslim Haninin evindən çıxıb başqa bir yerdə gizlənir, lakin tezliklə ələ keçir və öldürülür. O, ölümündən qabaq imama (ə.) bu barədə xəbər verilməsini vəsiyyət edir (199a-204b).

Bu hadisələrin hamısı eynilə «Riyazül-qüds»də də vardır. Sadəcə olaraq, «Riyazül-qüds»də həmin fəsil sıra ilə 13-cü yox, 6-cıdır (37a-41a). Qeyd edək ki, «Cəlaül-üyun»un bu

fəslində belə bir epizod da vardır. Məclisi, Seyyid ibn Tavusun rəvayətinə əsasən yazır ki, imam Hüseyn (ə.) Kufə camaatından onun hakimiyyətinin qəbul edilməsi ilə bağlı kağız («ərizə») aldıqdan sonra Bəsrənin bir neçə nüfuzlu şəxsinə də məktub göndərərək ona tabe olmalarını təklif edir. Həmin şəxslər imamın təklifini böyük ehtiramla qəbul edirlər. Bundan xəbər tutan Übeydullah onları dar ağacından asdırır və səhərisi Kufəyə yola düşür. Təxminən bir səhifə həcmində olan bu rəvayət «Riyazül-qüds»də yoxdur. Onu da qeyd edək ki, Müslim bin Əqil haqqındakı hadisələrin hamısı: ahunun ovlanmasından tutmuş Müslimin vəsiyyətinədək, lakin bir qədər fərqli şəkildə Füzulinin «Hədiqətüs-süəda»sında da vardır və burada ayrıca bir babda verilmişdir (bax: **29,**177-178,182-200).

«Cəlaül-üyun»un sonrakı - on dördüncü fəsli əvvəlki fəslin məntiqi davamıdır. Məkkədə qaldığı təqdirdə Yezid tərəfindən öldürüləcəyini bilən imam Hüseyn (ə.) ailəsi və yaxınları ilə birgə İraqa yola düşür. İmam (ə.) hələ yolda ikən Müslim bin Əqilin şəhid olması xəbərini eşitsə də, qərarından dönmür və yolunu davam etdirir. İmamın (ə.) dəstəsi Kərbəlaya çatmamış 1000 nəfərlik bir qoşunla üzləşir. Qoşun başçısı Hürr bin Yezid, İmama (ə.) bildirir ki, Kufə valisi İbn Ziyadın əmri ilə onu valinin yanına aparmaq üçün bura göndərilibdir. İmam (ə.) onun əmrinə tabe olmur. Hürr imamla (ə.) söhbət etdikdən sonra onun dəstəsinə qoşulur. Bu xəbəri eşidən İbn Ziyad Kərbəla tərəfə 4000 nəfərlik başqa bir qoşun göndərir. Ömər bin Sə'din başçılıq etdiyi bu qoşun məhərrəm ayının 8-də Kərbəlaya çatır və imamın (ə.) 72 nəfərlik (32 süvari və 40 piyada) kiçik dəstəsi ilə üz-üzə dayanır. Ömər bin Sə'd imama (ə.) bildirir ki, Yezidə tabe olmasa, qətlə yetiriləcəkdir. İmam (ə.) Yezidə tabe olmayacağını bildirir və şəhidliyə üstünlük verir. Məhərrəm ayının 10-da - Aşura günü (ərəb mənşəli «aşura» sözü «onuncu» deməkdir) Kərbəla düzündə imamın (ə.) dəstəsi ilə Ömər bin Sə'din qoşunu arasında

qanlı döyüş baş verir. Əsasən təkbaşına döyüş şəklində olan bu hadisədə ilk şəhid Hürr bin Yezid olur. Daha sonra isə dəstənin digər üzvləri qətlə yetirilir və sonda imamın (ə.) özü döyüş meydanına atılaraq şəhadət zirvəsinə yüksəlir.

Qısaca məzmununu verdiyimiz bu hadisələrin hamısı, demək olar ki, eynilə «Riyazül-qüds»də də təsvir edilmişdir və məzmun baxımından onlar tam üst-üstə düşür. Bununla belə, A.Bakıxanov «Cəlaül-üyun»da bu fəsildə cərəyan edən hadisələri iki bölümdə - VII və VIII fəsillərdə vermişdir. VII fəsildə imam Hüseynin (ə.) İraqa yola düşməsindən bəhs edilir (41a-48a), VIII fəsil isə başdan-başa Aşura günündə - məhərrəm ayının 10-da baş verən qanlı faciənin təsvirinə, imam Hüseynin (ə.) dəstəsindəki yaxın adamlarının, qohum-əqrəbasının və özünün şəhid olmasının təsvirinə həsr olunmuşdur (48a-67a).

A.Bakıxanovun «Riyazül-qüds»ün quruluşunda etdiyi bu kiçik, lakin incə dəyişikliyi başa düşmək olar. O, «Riyazül-qüds»də şəhidlik məsələsini daha da qabartmış, baş mövzuya çevirmişdir. Məhz buna görə də müəllif-mütərcim imamın (ə.) şəhadəti hadisəsinə ayrıca bir fəsil ayırmışdır. «Cəlaül-üyun»da olduğu kimi, «Riyazül-qüds»də də bu fəsil həcmcə ən böyükdür. A.Bakıxanov bu fəslin xüsusi əhəmiyyətini nəzərə alaraq, ona qəmli məzmun daşıyan çoxlu şeir parçaları daxil etmişdir. Bu da təbiidir, çünki məqtəl kitabları daha çox məhərrəm ayında, xüsusilə də Aşura günü təşkil olunan təziyə məclislərində oxunurmuş və aydındır ki, belə məclislərdə şeirin emosional təsiri nəsrə nisbətən daha güclü və effektli olmuşdur.

Beləliklə, hər iki əsərdəki ayrı-ayrı fəsillərin məzmunları üzərində aparılan müqayisəli təhlil də «Riyazül-qüds»ün «Cəlaül-üyun»dan sərbəst və yaradıcı şəkildə tərcümə olunması fikrini təsdiqləyir.

## 2.4. «Cəlaül-üyun» və «Riyazül-qüds»: fərqli cəhətlər

«Cəlaül-üyun»la «Riyazül-qüds» arasında, təbii ki, bir sıra fərqli cəhətlər, üst-üstə düşməyən incə məqamlar da yox deyildir. Maraqlıdır ki, bu məsələdə də ilk növbədə hər iki əsərin quruluşlarında olan fərqli xüsusiyyətləri qeyd etmək lazım gəlir. Belə ki, «Cəlaül-üyun»un mətni bütövlükdə yalnız nəsr şəklində olduğu halda, «Riyazül-qüds»də isə bütün əsər boyu nəsr arasında nəzm parçaları da verilmişdir. Bu baxımdan hər iki əsərin nəsr hissələrində də müəyyən fərqli cəhətlər vardır ki, bu da dil-üslub məsələsi ilə bağlıdır: «Cəlaül-üyun», əsasən, nəsrlə yazılmışdır, Məclisi yalnız nadir hallarda səc'ə də əməl etmişdir; «Riyazül-qüds»ün nəsri isə, demək olar ki, başdan-başa qafiyəli nəsrlə (səc'lə) qələmə alınmışdır. Bu fərq isə, təbii ki, öz-özlüyündə onlar arasında digər incə fərqli xüsusiyyətlər də doğurur, çünki səc'in tələbinə görə qafiyə yaratmaq xatirinə A.Bakıxanov istər-istəməz mətnə müəyyən kiçik əlavələr də etməli olmuşdur.

«Cəlaül-üyun»la «Riyazül-qüds» arasındakı daha bir incə fərqli xüsusiyyət də elə bilavasitə yuxarıdakı məsələ ilə bağlıdır. «Cəlaül-üyun» bütövlükdə götürdükdə bədii əsər nümunəsi sayıla bilər. Bununla belə, onda tarixi-sənədli və ya bədii-publisistik əsərlərə xas olan cəhətlər də müəyyən mənada özünü göstərir. Belə ki, Məclisi əsərdə bir sıra hallarda müəyyən məsələdən bəhs edərkən ilk öncə mövzu ilə bağlı qaynaqlardan söz açır və onlara öz münasibətini bildirir. Bunu nəzərə aldıqda «Cəlaül-üyun» sənədli-bədii əsər kimi də dəyərləndirilə bilər. Məhz bu xüsusiyyətinə görə də əsərdə bədiilik ön plana çəkilməmişdir. A.Bakıxanov isə «Riyazül-qüds»də əksinə, başlıca diqqəti fikrin bədii şəkildə ifadəsinə yönəltmişdir. Bu baxımdan «Riyazül-qüds» ilk növbədə yüksək sənətkarlıq xüsiyyətləri ilə seçilən bədii əsər təsirini bağışlayır, daha doğrusu, sırf bədii əsərdir. Başqa sözlə desək, «Cəlaül-üyun» bədii və elmi üslubların

qarışığı, sintezi şəklində yazılmış, "Riyazül-qüds» isə yüksək bədii üslubda qələmə alınmışdır.

Bu iki əsər arasındakı daha bir fərqli xüsusiyyət onların həcmləri ilə bağlıdır. Yuxarıda da qeyd edildiyi kimi, «Cəlaül-üyun» həcm etibarilə «Riyazül-qüds»dən azı üç-dörd dəfə böyükdür. Bu isə artıq A.Bakıxanovun tərcümə prinsipi ilə bağlıdır. Qeyd edildiyi kimi, o, «Cəlaül-üyun»u seçmə prinsipi ilə və ixtisar şəklində tərcümə etmişdir. Qeyd edək ki, oxşar hal digər klassik tərcümə nümunələrində də özünü göstərir. Məsələn, XV əsr Azərbaycan şairi-tərcüməçisi Əhmədi Təbrizinin «Əsrarnamə» tərcüməsi məşhur sufi şairi Fəridəddin Əttarın (1120-1230) üç məsnəvisindən («Əsrarnamə», «Müsibətnamə», «İlahinamə») seçmə mənzum hekayətlərin sərbəst tərcüməsidir (bax: **58**, 39-49). Və ya başqa bir misal: görkəmli Azərbaycan filosofu Şeyx Mahmud Şəbüstərinin (1287-1320) «Gülşəni-raz» məsnəvisi cəmi 1006-1007 beytdən ibarət olduğu halda, onun Şirazi təxəllüslü şair-mütərcim tərəfindən 1426-cı ildə dilimizə edilmiş tərcüməsindəki beytlərin sayı 3000-ə yaxındır (bax: **57**, 46-88).

Bu iki əsər arasındakı mövcud fərqli xüsusiyyətlər sırasında, şübhəsiz ki, «Riyazül-qüds»dəki əksər şeir parçalarının A.Bakıxanovun özünə məxsus olması da ayrıca qeyd olunmalıdır. Görünür, məhz bu amili nəzərə alaraq, indiyədək «Riyazül-qüds»ün tərcümə olması faktına, yumşaq desək, göz yumulmuş və əhəmiyyət verilməmişdir. Bu amil, sözsüz ki, olduqca mühüm və əhəmiyyətli olmaqla yanaşı, müasir tərcümə nəzəriyyəsində yolverilməz sayılır. Bununla belə, klassik tərcümə nümunələri üzərindəki müşahidələrimizə əsasən deyə bilərik ki, orta yüzilliklərin sərbəst tərcümələrində orijinalın mətninə əlavələr etmək, ixtisarlara yol vermək, orijinal şeir parçaları artırmaq kimi hallara tez-tez rast gəlmək olur (bax: **55**, 30-41). Məsələn, Kaşifinin «Rövzətüş-şühəda» əsərindən tərcümə olunmuş

Nişatinin «Şühədanamə»sinin tərcümə nümunəsi olması heç bir şübhə doğurmur. Bununla belə, «Şühədanamə»də Nişatinin farscadan sırf tərcümə etdiyi şeir parçaları ilə yanaşı, öz qələminin məhsulu olan nəzm nümunələri də vardır (bax: **56**, 116-119). Eləcə də «Hədiqətüs-süəda»da olan bir sıra şeir parçalarının Füzulinin özünə məxsus olmasına baxmayaraq, bu əsər tədqiqatçıların çoxunun fikrincə, klassik sərbəst tərcümə nümunəsidir (bax: **47**, **54**).

Deməli, təkcə yuxarıdakı fakta söykənərək «Riyazül-qüds»ü orijinal əsər saymaq düzgün deyil. Əsərdəki şeir parçaları ilə bağlı onu da qeyd edək ki, onların bir çoxu həm də müstəqil şeir təsiri bağışlayır, yəni əsərdən ayrılıqda götürdükdə lirik məzmunlu şeir nümunələridir və yüksək bədii sənətkarlıq xüsusiyyətləri ilə seçilir. Bununla belə, həmin şeir parçaları uğurla və yerli-yerində işlənmişdir və əsərdə təsvir olunan hadisələrin ümumi məzmununa tam uyğun gəlir, nəsrlə ifadə olunan fikrin həm təsir gücünü daha da artırır, həm də onu məntiqi baxımdan tamamlayır, daha da oxunaqlı edir. Kitabdakı şeir parçalarının çoxu türkcədir və əsasən, qitə və qəzəl janrlarındadır. Həmin şeir parçalarının bəziləri isə fars dilindədir və onlar da A.Bakıxanovun özünə məxsusdur. Əsərdə ərəb dilində də şeirlər vardır ki, onlardan bəzilərinin müəllifi göstərilmiş, bir qisminin müəllifi isə qeyd olunmamışdır. A.Bakıxanov əsərin sonunda qeyd edir ki, ərəbcə şeir yazmaq onun üçün çətin olduğu üçün bu işi boynuna götürmür (91a). Yuxarıda qeyd etdiyimiz kimi, ərəb dilində olan üç beytlik bir şeir parçası A.Bakıxanovun özünə məxsusdur.

«Cəlaül-üyun»la «Riyazül-qüds» arasındakı daha bir fərqli cəhət onların «dibaçə»lərində, giriş hissələrindədir. Əgər Məclisi əsərinin bu hissəsində daha çox mövzunun əhəmiyyətindən, imam Hüseyn (ə.) üçün ağlamağın faydasından söz açırsa, Bakıxanov isə «Riyazül-qüds»ün dibaçəsində başlıca diqqəti tərcüməni doğuran səbəblərin açıqlanmasma yönəltmişdir. Qeyd edək ki, eyni xüsusiyyət klassik tərcümə nümunələrinin bir

çoxunda müşahidə olunur (bax: **55**, 6-50). Məsələn, Kaşifi «Rövzətüş-şühəda» əsərində bu mövzuda əsər yazmağın savab və faydalı olmasını əsaslandırdığı halda, Nişati, əsasən, «Şühədanamə»də tərcüməni doğuran səbəblər üzərində dayanır və dövrün hökmdarını - tərcüməsini ithaf etdiyi Şah I Təhmasibi (919/1524-984/1576) tərifləyir.

Bu iki əsər arasında daha bir kiçik fərqi qeyd etmək olar. Məclisidən fərqli olaraq, A.Bakıxanov «Riyazül-qüds»dəki bütün babları ərəb dilində yazılmış xütbə ilə başlayır.

Nəhayət, bu iki əsəri bir-birindən müəyyən dərəcədə fərqləndirən cəhətlər sırasında onların adlarını qeyd etmək olar. «Cəlaül-üyun»la «Riyazül-qüds» arasında bu baxımdan elə bir bağlılıq müşahidə olunmur. Bununla belə, çağdaş tərcümə nəzəriyyəsində hər hansı bir orijinalın adının dəyişdirilməsi əsasən yolverilməz sayıldığı halda, klassik tərcümə nümunələri üçün bu, adi haldır (bax: **55**, 48-50). Yenə də Nişatinin «Şühədanamə»si və ya Füzulinin «Həqiqətüs-süəda»sı buna nümunə ola bilər. Bu iki tərcümə əsərinin orijinalı olan Kaşifinin «Rövzətüş-şühəda» əsərini Füzulinin çağdaşı Gəlibolulu Cami isə «Səadətnamə» adı ilə Osmanlı türkcəsinə çevirmişdir.

Bu, bir danılmaz faktdır ki, A.Bakıxanovun bədii yaradıcılığı, əsasən, klassik ənənələr üzərində qurulmuşdur. Bu sahədə o, dahi Füzulinin XIX əsrdə ən layiqli davamçılarından biri sayılır. Bunu elə sənətkarın «Riyazül-qüds» əsəri də əyani şəkildə sübut edir. Təkcə belə bir faktı qeyd etmək kifayətdir ki, nəsrlə yazılan klassik əsərlərin çoxu, o cümlədən Füzulinin bütün nəsr əsərləri səc'lə yazılmışdır. A.Bakıxanov da «Riyazül-qüds»də bu ənənəyə əməl edərək onu qafiyəli nəsrlə qələmə almışdır. Və ya başqa bir fakt: Füzulinin «Leyli və Məcnun» poemasının yazılma tarixi əbcəd hesabı ilə qeyd olunmuşdur (bax: **10,** 142). A.Bakıxanov da yuxarıda qeyd olunduğu kimi, «Riyazül-qüds»ün yazılma tarixini əbcəd hesabı ilə göstərmişdir. Buradan belə bir nəticə çıxarmaq olar ki,

A.Bakıxanov klassik tərcümə ənənələrinə də yetərincə bələd imiş. Bunu elə onun yaxşıca mənimsədiyi, adını hörmətlə çəkdiyi Füzulinin «Hədiqətüs-süəda»sı aydınca sübut edir.

Qeyd edək ki, orta əsrlərə aid mənbələrin çoxunda, o sıradan bir çox təzkirələrdə Füzulinin sözügedən əsəri məhz tərcümə nümunəsi kimi anılır (bax: **94,** XLIV). Deməli, A.Bakıxanov klassik tərcümə ədəbiyyatı ənənələrinin təsiri ilə Məclisinin «Cəlaül-üyun» əsərini sərbəst və yaradıcı şəkildə, həm də ixtisarla ana dilinə çevirmişdir. Tərcüməyə olan bu sərbəst və yaradıcı münasibətin göstəriciləri sırasında kitaba şeir parçalarının əlavə edilməsi ilə yanaşı, adının dəyişdirilməsi də xüsusi yer tutur.

A.Bakıxanovun «Riyazül-qüds» və M.B.Məclisinin «Cəlaül-üyun» əsərləri arasındakı mövcud ayrıntılarla bağlı bir daha xüsusi olaraq vurğulamaq istəyirik ki, bu və bu kimi fərqli cəhətlər Azərbaycan klassik tərcümə ədəbiyyatının bir çox nümunələrində də özünü göstərir (bax: **55**, 6-50).

Beləliklə, «Riyazül-qüds»ün diqqətlə öyrənilməsi, xüsusilə də A.Bakıxanovun burada olan qeydləri, eləcə də əsərin mətninin «Cəlaül-üyun»la müqayisəli təhlili aşağıdakı nəticələrə gəlməyə əsas verir:

1. «Riyazül-qüds» Məclisinin «Cəlaül-üyun» əsərinin qısa, müxtəsər tərcüməsidir. A.Bakıxanov «Riyazül-qüds»ü Məclisinin sözügedən əsərindən ayrı-ayrı hissələri seçərək sərbəst və yaradıcı şəkildə çevirmiş və tərcümə kitabını «Riyazül-qüds» adlandırmışdır. Mütərcim «Cəlaül-üyun»u ana dilinə çevirərkən başlıca diqqəti orijinalda təsvir olunan hadisələrin məzmununu saxlamaqla yanaşı, fikrin yüksək üslubda və bədii şəkildə ifadəsinə yönəltmişdir. Bu məqsədlə o, tərcüməyə, əsasən, öz qələminin məhsulu olan şeir parçalarını da daxil etmişdir. Məhz buna görə də «Riyazül-qüds» adi tərcümə nümunəsi deyil, orta yüzilliklərdə geniş yayılmış klassik tərcümə sənətinin xüsusi bir növü olan sərbəst-yaradıcı tərcümədir. Bu baxımdan «Riyazül-qüds»

daha çox Füzulinin «Hədiqətüs-süəda»sını xatırladır.

2. «Riyazül-qüds» orta yüzilliklərin klassik sərbəst-yaradıcı tərcümələrinə xas olan bir sıra səciyyəvi cəhətləri özündə əks etdirir. Burada orijinaldakı müəyyən hissələr ixtisarla tərcümə edilməklə yanaşı, bir sıra hallarda kiçik əlavələrə də yol verilmişdir.

3. «Riyazül-qüds» klassik sərbəst-yaradıcı tərcümə nümunəsidir.

Bunu da qeyd etməyi zəruri sayırıq ki, «Riyazül-qüds»lə bağlı bu qərarımızda biz günümüzün - çağdaş tərcümə nəzəriyyəsinin tələblərinə deyil, klassik tərcümə ənənələrinə söykənmiş, onları əsas götürmüşük. «Riyazül-qüds» tərcümə və ya orijinal əsər sayılmasından asılı olmayaraq, A.Bakıxanovun yüksək bədii sənətkarlıqla, böyük istək və məhəbbətlə qələmə aldığı kamil bir bədii sənət nümunəsidir. Məhz buna görə də o, ilk növbədə nəşr edilməli və ətraflı araşdırılmalıdır.`

## III FƏSİL

## «RİYAZÜL-QÜDS»ÜN DİL-ÜSLUB VƏ BƏDİİ XÜSUSİYYƏTLƏRİ

## BİRİNCİ BÖLMƏ

### «Riyazül-qüds» və «Hədiqətüs-süəda»: səsləşmə məqamları

A.Bakıxanovun «Riyazül-qüds» əsərinin dil-üslub və bədii xüsusiyyətlərini araşdırarkən istər-istəməz ilk növbədə onunla M.Füzulinin «Hədiqətüs-süəda»sı arasında bu yöndə üst-üstə düşən cəhətlər, oxşar xüsusiyyətlər - bir sözlə, səsləşmələr üzərində dayanmaq lazım gəlir. İrəlidə qeyd edildiyi kimi, «Riyazül-qüds»dən bəhs edən bütün tədqiqatçılar A.Bakıxanovun bu əsərində Füzulinin «Hədiqətüs-süəda»sının təsiri olduğunu ümumi şəkildə qeyd etmiş, lakin bu təsirin incəlikləri, təfərrüatları üzərində dayanmamış, onları konkret şəkildə açıqlamamışlar.

«Riyazül-qüds»ü «Hədiqətüs-süəda» ilə bağlayan cəhətlər, bu iki əsər arasında səsləşmə məqamları çoxçalarlı və rəngarəngdir. Bu cəhətlər sırasında ilk növbədə hər iki əsərin ideya, məzmun, süjet və kompozisiya baxımından yaxınlığı və oxşarlığı qeyd olunmalıdır. İstər «Riyazül-qüds», istərsə də «Hədiqətüs-süəda» şəhidlik mövzusundadır və

əsasən imam Hüseynin (ə.) Kərbəla müsibətinə həsr olunmuş məqtəl kitabıdır. Bu başlıca əhəmiyyətli amil isə, istər-istəməz, onlar arasında müəyyən oxşar cəhətlərin, üst-üstə düşən məqamların labüdlüyünü, zəruriliyini şərtləndirir.

«Riyazül-qüds»lə «Hədiqətüs-süəda» arasındakı səsləşmə məqamları sırasında A.Bakıxanovun əsərinin bədii quruluş baxımından Füzulinin əsəri ilə tam eyniyyət təşkil etdiyini, bu baxımdan onlar arasında heç bir fərq olmadığını da xüsusi olaraq qeyd etmək olar. Belə ki, «Riyazül-qüds» də «Hədiqətüs-süəda» kimi bədii nəsr nümunəsi olsa da, sələfinin əsəri kimi onda da nəsr arasında şeir parçalarına geniş yer verilmişdir. «Riyazül-qüds»ün də «Hədiqətüs-süəda» kimi nəzmlə başlayıb nəzmlə bitməsini də birincini ikinciyə bağlayan zəncir və həlqələrdən biri kimi qəbul etmək olar. «Riyazül-qüds»ün eynilə «Hədiqətüs-süəda» şəklində qurulması açıq-aşkar şəkildə sübut edir ki, A.Bakıxanov «Riyazül-qüds»ün kompozisiyası, quruluşu məsələsində məhz «Hədiqətüs-süəda»nı örnək olaraq seçmiş, Füzulinin bu sərbəst-yaradıcı tərcümə əsərinə üstünlük vermişdir. Yeri gəlmişkən qeyd edək ki, A.Bakıxanovun digər bir nəsr əsəri - «Kitabi-Əsgəriyyə» də nəsrlə nəzmin növbələşməsi şəklindədir, Deməli, burada da Füzuli yaradıcılığı, xüsusilə də Füzuli nəsri öz təsirini göstərmişdir. Qeyd edək ki, bizdən öncə Hidayət Əfəndiyev bu məsələni xüsusi olaraq vurğulamışdır (bax: **23**, 103-105). Maraqlıdır ki, A.Bakıxanovun bu əsəri də nəsrlə yazılmasına baxmayaraq, nəzmlə bitir və onun əvvəli də kiçik bir cümləni çıxmaq şərtilə əslində elə nəzmlə başlanır (bax: **15**, 121).

«Riyazül-qüds»lə «Hədiqətüs-süəda» arasındakı daha bir səsləşmə məqamı da elə bilavasitə yuxarıdakı məsələ ilə bağlıdır. Füzuli «Hədiqətüs-süəda»nı, məlum olduğu kimi, adi nəsrlə deyil, qafiyəli nəsrlə (səc'lə) qələmə almışdır (bax: **54**, 8-115). «Riyazül-qüds»ün nəsri də adi nəsr deyil, eynilə Füzulinin əsərindəki kimi qafiyəlidir. Yeri gəlmişkən qeyd edək ki, ümumiyyətlə, Yaxın və Orta Şərq xalqları ədəbiyyatında nəsr

əsərləri, lap qədimdən bəri, bir qayda olaraq, qafiyəli nəsrlə yazılırdı. Bu məsələdə islamın müqəddəs kitabı Qur'ani-Kərimin səc'li nəsrlə olması, sözsüz ki, mühüm rol oynamışdır. Deməli, Füzuli də bu məsələdə əski bədii nəsr ənənəsinə sadiq qalmış, A.Bakıxanov isə əsərini, fikrimizcə, bilavasitə sələfinin təsirilə qafiyəli nəsr şəklində qələmə almışdır.

A.Bakıxanovun «Riyazül-qüds» əsərində Füzuli «Hədi-qətüs-süəda»sının təsiri, əsasən iki şəkildə özünü göstərir: dil-üslub məsələlərində və məzmunda. Bir sıra hallarda bu səsləşmənin hər iki növü çulğaşır və vəhdət təşkil edir. Bu səsləşməni isə, aydındır ki, yalnız və yalnız «Riyazül-qüds»də Füzulinin sözügedən əsərinin təsiri kimi dəyərləndirmək mümkündür.

«Riyazül-qüds»də «Hədiqətüs-süəda»nın təsirini bütün əsər boyu izləmək, müşahidə etmək mümkündür. Bu təsir hər iki əsərin dibaçə hissələrinin qarşılaşdırılmasında daha qabarıq şəkildə özünü göstərir. «Hədiqətüs-süəda»nın bu hissəsi kiçik bir nəzm parçası ilə - rübai ilə başlanır. Rübaidə Füzuli üzünü Allaha tutaraq ulu Tanrıdan eşq diləyir, Ona olan bağlılığını daha da artırmağı təmənna edir:

*Ya Rəb, rəhi-eşqində bəni şeyda qıl,*
*Əhkami-ibadatı bana icra qıl,*
*Nəzareyi-sün'ində gözüm bina qıl,*
*Övsafi-həbibində dilim guya qıl.* (**29**, 21)

«Riyazül-qüds» də eynilə bir riibai ilə başlanır və burada da eşqdən danışılır. A.Bakıxanov da Füzuli kimi ulu Tanrıya üz tutaraq Ondan tale yolçusu olmasında (Allaha qovuşmaqda) uğur istəyir. Müəllif həmçinin eşqin köməyilə rahatlıq tapmağı, bu dünya ilə əlaqəsini kəsməyi Allahdan umur:

*Ya Rəb, bəni rəhi-nurda iqbal eylə,*
*Eşq ilə cəhandə fariğülbal eylə.*

*Kəs rabiteyi-əlayiqim aləmdən,*
*Sevdazədeyi-cəmali-iclal eylə.* (1b)

Bu rübailərdə təxminən eyni mətləbdən danışılması göz qabağındadır və fikrimizcə, əlavə şərhə ehtiyac yoxdur.

Füzuli «Hədiqətüs-süəda»nın dibaçə hissəsinin sonunda daha iki yerdə verilən şeir parçasında Allah-taalaya müraciət edərək, Ondan bu kitabını başa vurmaq üçün kömək və yardım diləyir. Kitabın dibaçəsi şairin bu misraları ilə bitir:

*Ya Rəb, müsafiri-rəhi-səhrayi-möhnətəm,*
*Tovfiq edüb rəfiq bana sidq rəhbər et.*
*Sərmənzili-muradə yetür, sərbülənd qıl,*
*Məhrum qoyma, cümlə muradım müyəssər et.* (**29**, 26)

A.Bakıxanov da «Riyazül-qüds»ün dibaçə hissəsinin sonunda eyni niyyət və məramla ulu Tanrıya üz tutaraq girişdiyi bu işdə Yaradandan ona qüvvət və bacarıq verməsini bəxş etməsini diləyir:

*Ya Rəb, bu əmri-baisi-təhsili-kam qıl,*
*Tovfiqini bənim ilə rəfiqi-müdam qıl.*
*Sərkeşi-səməndi-xaməmişkini ram edüb,*
*Teyyi-təriqi-mətləb içün tizkam qıl.* (4b)

Tarixilik baxımından üç əsrlik bir fasilə ilə bir-birindən aralı düşən bu şeir parçalarının məzmunları arasında da açıq-aşkar bir yaxınlıq, uyğunluq özünü göstərir. Füzulinin qitə janrında yazdığı şeir parçasının ikinci misrasında işlənmiş *«tovfiq»* (bacarıq, qüdrət, uğur) və *«rəfiq»* (yoldaş) sözlərinin A.Bakıxanovun şeir parçasında da eynilə işlənməsi buna əyani sübutdur.

«Riyazül-qüds»ün dibaçəsinin ümumi məzmunu da

«Hədiqətüs-süəda»nın eyni hissəsində ifadə olunan fikirlərlə üst-üstə düşür. Aydınlıq üçün qeyd edək ki, Füzuli «Hədiqətüs-süəda»nın dibaçəsində ilk öncə Allah-taalanın insanları, xüsusilə də ən sevimli bəndələri olan peyğəmbərləri sınağa çəkdiyini, bu niyyətlə onlara bəla göndərdiyini yada salır və bu baxımdan sonuncu peyğəmbər həzrət Məhəmmədin (s.) müsibətlərlə daha çox üzləşdiyini, buna görə də ən uca və şərəfli məqama layiq görüldüyünü bildirir. Sonuncu fikir eynilə «Riyazül-qüds»də də vurğulanır. Maraqlıdır ki, burada hətta bəzi ifadələr üst-üstə düşür. Məsələn:

**«Hədiqətüs-süəda»da:** *«Lacərəm, məcmu'i-ənbiyadən rütbəsi əfzəl və bəliyyatı ətəmmü əkməldür»* (**29**, 23).

**«Riyazül-qüds»də:** *«Necə kim həzrəti-rəsulun cümlədən rütbəsi ə'la olduğundan bəliyyatı əkməl və ətəmm... idi»* (3a).

Göründüyü kimi, bu cümlələrdəki son üç söz *(bəliyyat* - bəlalar; *ətəmm* - daha tam, daha bütöv; *əkməl* - daha mükəmməl) tamamilə eynidir. Bundan əlavə, hər iki cümlədə sonuncu peyğəmbərin rütbəsinin bütün peyğəmbərlərdən üstün olduğu vurğulanır.

Füzuli «Hədiqətüs-süəda»da daha sonra bəla və müsibət mövzusunu davam etdirərək ən müsibətli və faciəli hadisə olan Kərbəla vaqiəsi üzərinə gəlir və bu mövzuda ərəb və fars dillərində bir sıra kitablar yazıldığı halda, türkcə belə bir kitabın əldə olmadığını, buna görə də həmvətənlərinin bu böyük nemət və savabdan faydalana bilmədiklərini qeyd edir. Belə bir işin əbədi səadətə qovuşmaq üçün bir vasitə olduğunu dərk edən Füzuli öz dövründə çox məşhur olan Kaşifinin fars dilində yazdığı «Rövzətüş-şühəda» kitabını sərbəst-yaradıcı şəkildə ana dilinə çevirmək qərarına gəldiyini açıqlayır (bax: **29**, 21-26).

Füzulidən üç əsr sonra A.Bakıxanov da «Riyazül-qüds»ün dibaçəsində irəlidə qeyd edildiyi kimi, başlıca diqqəti əsərin yaranma səbəbinin açıqlanmasına yönəltmişdir. Maraqlıdır ki, A.Bakıxanovun dibaçədə bu mövzunun açıqlanması ilə bağlı işlətdiyi cümlələr və ayrı-ayrı ifadələr «Hədiqətüs-

süəda»nın analoji yerlərindəki bəzi cümlə və ifadələrlə yaxından səsləşir. Məsələn:

**«Hədiqətüs-süəda»da:** *«Bu səbəbdən iqtizayi-ümumi-matəmi-al zəbani-hal ilə məni-xaksarə təərrüz etdi və dəsti-təərrüzlə, giribanım dutdi ki, ey pərvərdeyi-xani ne'məti-feyzi-şahi-Kərbəla – Füzuliyi-mübtəla, nola gər bir tərzi-mücəddədə müxtəre' olasan və himmət dutub bir məqtəli-türki inşa qılasan ki, füsəhayi-türkizəban istima'indən təməttö' bulalar və idraki-məzmunində ərəbdən və əcəmdən müstəğni olalar»* (**29**, 25).

**«Riyazül-qüds»də:** *«Sərpənceyi-təvəlla giribangiri-xatiri-ixlasi-məzahir olub, şahidi-məhəbbət hicabi-xəfadən ərzi-cəmal edüb bəni müxatib qıldı kim, ey kuyi-vəfadə aşiqəm deyüb laf edən və təriqi-müvəddətdə sabitqədəm təmənnası ilə gedən. Beyt:*

*Bəsteyi-dami-ələm, pamali-ənduhi-məlal,*
*Bülbüli-gülzari-matəm Qüdsiyi-şuridəhal.*

*Vəqayeyi-Kərbəla və sair əhadisi sihhət ilə zikr edən «Cəlaül-üyun» kitabından özgə yoxdur kim,.. hala sən dəxi… türki istilahına* ***tərcümə qılub (seçdirmə bizimdir – M.N.)*** *bir kitabi-müxtəsəri-müfid tərtib etmək ilən lazımdır ki... füsəhayi-türk istima'indən** *istifadeyi-təməttüat və kəsbi-məani qılalar».* (4a)

Bu iki müxtəlif əsərdən verilən parçalarda eyni məsələdən, eyni mətləbdən bəhs olunur. Hər iki sənətkar Kərbəla vaqiəsi mövzusunda bir kitab *«inşa qılmaq»* (Füzuli) və ya *«tərtib etmək»* (A.Bakıxanov) xahişi ilə ona müraciət edildiyini bildirir. A.Bakıxanov da sələfi Füzuli kimi belə bir kitabın *«füsəhayi-türk»* ("türkün gözəl danışanları") üçün hazırlandığını xüsusi olaraq vurğulayır.

---

* Əlyazmada yanlış olaraq *«istimalindən»* kimi yazılmışdır.

Biri XVI əsrdə, digəri isə ondan üç əsr sonra - XIX yüzillikdə qələmə alınmış bu iki nümunənin məzmunları bir-birinə yaxın olduğu kimi, onlarda dil-üslub xüsusiyyətləri baxımından da üst-üstə düşən məqamlar açıq-aşkar şəkildə özünü göstərir. Deməli, A.Bakıxanov «Riyazül-qüds»ü qələmə alarkən, xüsusilə də onun dibaçə hissəsini yazarkən dahi sələfi Füzulinin «Hədiqətüs-süəda» əsərinin güclü təsiri altında olmuş və bu bənzərsiz sənət nümunəsindən yaradıcılıqla və uğurla bəhrələnmişdir.

«Riyazül-qüds»ün sonluq hissəsi olan «Xatimə» də müəyyən mənada «Hədiqətüs-süəda»nın eyni hissəsini yada salır. Belə ki, Füzuli «Hədiqətüs-süəda»nın sonunda dövrün hökmdarını (Sultan Süleyman Qanunini) və əsərini ithaf etdiyi Məhəmməd Paşanı tərifədikdən sonra kitabı tamamladığı üçün Allaha şükürlər edir və onu bu misralarla bitirir:

*Hücumi-möhnəti-dövran məluli,*
*Giriftari-qəmi-aləm Füzuli.*
*Degil ol ləhceyi-göftarə qadir*
*Kim, ola qabili-səm'i-əkabir.*
*Qılır cəmiyyəti-dil ləfzi-dilkəş,*
*Müşəvvəş söyləməz, illa müşəvvəş.*
*Gəl, ey hali-təkəllümdən xəbərdar,*
*Tərəhhüm qıl, təərrüz qılma, zinhar.* (**29**, 316)

Şair burada dünya qəmi üzündən dərdli-kədərli olduğunu dilə gətirərək yazır ki, onun sözlərinin ləhcəsi (dili) böyüklərə layiq deyil. Dahi sənətkar, burada əsərinin türkcə olduğunu və böyük adamların (yuxarı təbəqə adamlarının) daha çox ərəb dilinə üstünlük verdiklərinə işarə edir. Sonda isə o, insanları ürəyiyumşaqlığa, rəhmli olmağa, bir-birlərinə zülm etməməyə çağırır.

«Riyazül-qüds»ün sonluğunda «Hədiqətüs-süəda»nın bu hissəsi ilə səsləşən məqamlar vardır. Birincisi, «Riyazül-qüds» də

«Hədiqətüs-süəda» kimi şeirlə bitir. Bundan əlavə, «Riyazül-qüds»ün sonundakı A.Bakıxanovun aşağıdakı şeir parçası istər məzmunca, istərsə də formaca Füzulinin yuxarıdakı misralarını yada salır.

*Bəla dilxuni, möhnət naşəkibi,*
*Gülüstani-müsibət əndəlibi,*
*Xəzan pamali Qüdsi didəgiryan*
*Qılub şivən, çəkübdür bəs ki əfğan,*
*Bu matəmdə pərişanhal olubdur,*
*Keçübdür novbəhari, lal olubdur.*
*Qalub aciz bəyani-müddəadə,*
*Məcali-nitqi yox bundan ziyadə*
*Ki, qət' etsün muradi olmayıb qeyr,*
*Sərvi-din «qailən ətməti bilxeyr.»* (91a)

A.Bakıxanov bu misralarda yasa, matəmə batdığını, qəmli-kədərli və gözü yaşlı olduğunu bildirərək yazır ki, bu faciəli hadisəni şərh etmək üçün gücü ancaq buna (türkcə bir tərcümə əsərini qələmə almağa) çatmışdır. Göründüyü kinıi, burada məzmun baxımdan Füzulinin yuxarıdakı misraları ilə müəyyən bir yaxınlıq müşahidə olunur. Bu şeir parçalarının biçimi, qafiyə quruluşu da eynidir: hər ikisi məsnəvi şəklindədir. Hər iki şeir parçasında müəlliflərin adlarını çəkməsi də onları müəyyən mənada bir-birinə yaxınlaşdırır.

«Riyazül-qüds»ün sonluq hissəsində A.Bakıxanov kitabı tamamlamasını qeyd edərkən yazır: *«Çün istilahım ərəbi olmamaqdan ərəb ləfzi ilə əksəri-əbyatı nəzm etmək təb'ə giran idi, bu təklifi ondan götürdim»* (91a).

Göründüyü kimi, A.Bakıxanov da burada ustadı Füzuli kimi ərəb dili məsələsinə toxunaraq yazır ki, kitabdakı beytləri (şeir parçalarını) ərəbcə yazmaq çətin olduğu üçün bu işi öhdəsinə götürməmişdir. Deməli, bu məsələdə də hər iki əsərin uyğun hissələrində müəyyən bir oxşarlıq müşahidə olunur.

Qeyd etdiyimiz kimi, «Riyazül-qüds»ün dil-üslub xüsusiyyətlərində də «Həqiqətüs-süəda»nın güclü təsiri açıq-aşkar və qabarıq şəkildə özünü göstərir. Bu təsirin ən başlıca göstəricisi olaraq «Riyazül-qüds»ün də «Hədiqətüs-süəda» kimi yüksək üslubda - klassik kitab üslubunda (bax: **21**,208-209; **33**, 56-57 ) qələmə alınmasını göstərmək olar. Bundan əlavə, «Riyazül-qüds»ün yüksək poetik xüsusiyyətləri ilə seçilən dilində işlənmiş ayrı-ayrı deyim və ifadələr, hətta bəzi cümlələrin quruluşu da «Hədiqətüs-süəda»nı yada salır, bu iki əsər arasında müəyyən səsləşmələr, oxşar cəhətlər yaradır. Buna nümunə olaraq hər iki əsərdəki aşağıdakı cümlələrə diqqət yetirək:

**«Hədiqətüs-süəda»da:** *«Ya cəddah, hala ki mülaqat müyəssər olubdur və talibi-mətlubin bulubdur, nola dünyaya müraciət qılmasam və bir dəxi ol dami-bəlayə giriftar olmasam».* (**29**, 172)

**«Riyazül-qüds»də:** *«Ey cəddi-əmcədi-aliməqamım, hala kim feyzi-vüsal halimə şamil və şərəfi-mülaqatın bana hasil olmuşdur, nola əgər hüzürində olub dünyayə rücu qılmayam və damgahi-məsaibü əhzanə giriftar olmayam».* (35a)

Öncə qeyd edək ki, bu cümlələr eyni epizoddardır və eyni surətin - hər iki əsərin baş qəhrəmanı olan imam Hüseynin (ə.) dilindəndir. Mədinədən Məkkəyə yola düşməzdən öncə yaxın adamlarının qəbirlərini ziyarət edən imam Hüseyn (ə.) yuxuda babasını - Peyğəmbəri (s.) görür və yuxarıdakı sözləri o həzrətə deyir. İstər «Hədiqətüs-süəda»dakı, istərsə də «Riyazül-qüds»dəki bu cümlədə təxminən eyni fikir ifadə olunur: İmam Hüseyn (ə.) yuxuda babasına bildirir ki, bu dünyada yaşamaq istəmir, o həzrətin yanına - behiştə getmək istəyir. Bu iki cümlə istər quruluşuna, istərsə də tərkiblərindəki leksik vahidlərə görə - bir sözlə, dil-üslub xüsusiyyətlərinə görə də bir-biri ilə yaxından səsləşir. Göründüyü kimi, A.Bakıxanovun cümləsi eynilə Füzulinin cümləsi kimi «hala ki» (indi ki) şərt bağlayıcısının köməyi ilə qurulmuş şərt budaq

cümləli tabeli mürəkkəb cümlədir. Deməli, bu iki cümləni bir-biri ilə bağlayan ən başlıca oxşar cəhətlərdən biri hər ikisinin eyni quruluşda olmasıdır. Bundan əlavə «Riyazül-qüds»dəki cümlədə işlənmiş «hala kim», «mülaqat» (görüş), «nola», «giriftar olmayam» sözlərinin çox cuzi fərqlə «Hədiqətüs-süəda» əsərində olması da diqqət cəlb edir. A.Bakıxanovun burada işlətdiyi «rücu qılmayam» (qayıtmayam), *damgahi-məsaib* (müsibətlər tələsi) leksik vahidləri də «Hədiqətüs-süəda»da olan *«müraciət qılmasam»* (qayıtmasam) və *«dami-bəlayə»* (bəla tələsi) ifadələri ilə yaxından səsləşir, daha doğrusu, eyni məzmun daşıyır. Hər iki cümlədə işlənmiş eyni köməkçi fellər - *«qılmasam»* - *«qılmayam», «olmasam»* - *«olmayam»* isə eyni olduğu kimi, şəkil-forma baxımından da yaxındır: birincilər şərt şəklində, ikincilər isə arzu şəklindədir. Bütün bu oxşar cəhətlər A.Bakıxanovun yuxarıdakı cümləsində «Hədiqətüs-süəda»nın təsirini açıq-aşkar şəkildə sübut edən göstəricilər, dəlillər sırasındadır.

Qeyd edək ki, «Riyazül-qüds»dəki yuxarıdakı cümlənin qarşılığı «Cəlaül-üyun»da da vardır. Bununla belə, «Cəlaül-üyun»dakı oxşar cümlə istər məzmunca, istərsə də formaca «Riyazül-qüds»dəki yuxarıdakı cümlədən bir qədər fərqlənir: *«Məra be-donya hacəti nist, məra ba-xod be-ğəbr-e moəzzəm-e xod bebər və əz-şərr-e əşrar xelasi deh».* (196a)

(*Mənim dünyaya ehtiyacım yoxdur, məni özünlə apar və düşmənlərin şərindən xilas et.*)

Göründüyü kimi, «Cəlaül-üyun»dakı bu cümlə ilə «Riyazül-qüds»dəki yuxarıdakı cümlə arasında məzmun baxımından yaxınlıq şərtidir. Düzdür, «Cəlaül-üyun»da da «Riyazül-qüds»də olduğu kimi, imam Hüseyn (ə.) babasına təxminən eyni xahişlə müraciət edir, bununla belə Məclisinin cümləsindəki fikir A.Bakıxanovun cümləsindəki kimi obrazlı və bədii şəkildə ifadə olunmamışdır. Bundan əlavə, Məclisinin cümləsi tabesiz mürəkkəb cümlə şəklindədir və bu baxımdan A.Bakıxanovun cümləsindən fərqlənir. Bütün bunlar daha bir maraqlı faktı üzə

çıxarır: A.Bakıxanov «Cəlaül-üyun»u tərcümə edərkən «Hədiqətüs-süəda»ya da üz tutmuş, onun da istər məzmunundan, istərsə də formasından – rəngarəng cümlə quruluşundan, eləcə də ayrı-ayrı bənzərsiz söz və ifadələrindən uğurla və bacarıqla istifadə etmişdir. Bu və bu kimi faktlar isə, təbii ki, «Riyazül-qüds»də Füzulinin sözügedən əsərinin təsiri kimi dəyərləndirilə bilər. Bu təsir bəzi hallarda «Hədiqətüs-süəda»da olan ayrı-ayrı qrammatik formaların, sintaktik qəliblərin eynilə «Riyazül-qüds»də də verilməsində daha qabarıq şəkildə özünü göstərir. Nümunə olaraq bu üç məqtəl kitabındakı aşağıdakı bir cümləyə diqqət yetirək:

**«Cəlaül-üyun»da:** *«Pəs zəban-e cegərquşe-ye xodra dər dəhan-e mocezneşan-e xod qozaşt və məkid və ənqoştər-e xodra be-an fərzənd-e delbənd dad ke, dər-dəhan qozaşt».* (222a)

(*Sonra öz ciyərguşəsinin dilini möcüzəli ağzına qoydu, sordu və öz üzüyünü o sevimli övladına verdi ki, ağzına qoysun.)*

**«Hədiqətüs-süəda»da:** *«Həzrəti-imam gərdi-meydan çehreyi-pakından pak edüb, həzrəti-rəsulin nigini-mübarəklərin təskini-hərarət içün lə'li-abdarına mülazim etməgin bir miqdar təskin bulub yenə meydanə müraciət qıldı».* (**29**, 269)

**«Riyazül-qüds»də:** *«Pəs şahzadənin zəbanın kəndü dəhani-möcüzbəyanına alub, dəf'i-hərarəti-ataş içün xatəmin lə'li-ləbi-gövhərnisarına mülazim etməgin müqərrər qıldı».* (61 a)

Qeyd edək ki, bu cümlələr Aşura günü Kərbəlada baş verən qanlı hadisələrdən bəhs edən hissədəki bir epizoddan götürülmüşdür. İmam Hüseynin (ə.) böyük oğlu Əli Əkbər döyüş meydanında bir müddət düşmənlərlə vuruşduqdan sonra susuzluğa tab gətirməyərək atasının yanına gəlir. Oğluna veriləsi su olmadığını bilən ata üzüyünü oğluna verir ki, onu ağzına almaqla müəyyən təskinlik tapsın. Bu cümlələrin hər

üçündə imamın (ə.) öz oğlu Əli Əkbərə üzük verməsindən danışılır, lakin onların məzmunlarında incə məna fərqi də nəzərə çarpır. Belə ki, «Hədiqətüs-süəda» əsərindəki cümlənin ilk hissəsi (imamın (ə.) Əli Əkbərin üzündəki meydan tozunu silməsi) «Cəlaül-üyun»da və «Riyazül-qüds»də yoxdur. Bundan əlavə, «Hədiqətüs-süəda»da imamın (ə.) Əli Əkbərə verdiyi üzüyün Peyğəmbərə (s.), digər iki əsərdə isə üzüyün imamın (ə.) özünə məxsus olması göstərilir. Ümumiyyətlə, yuxarıda verdiyimiz nümunədən fərqli olaraq, «Riyazül-qüds»dəki cümlə məzmunca «Cəlaül-üyun»a daha yaxındır. «Riyazül-qüds»dəki cümlənin ilk hissəsi (*pəs şah-zadənin... alub*) «Cilalü-üyun»dakı cümlənin eyni hissəsi ilə (*pəs zəban-e... qozaşt*) tam üst-üstə düşür. Bu cümlələrin həmin hissəsində bir neçə eyni və ya yaxın mənalı sözün işlənməsi də *(pəs, zəban, dəhan, mo'cezneşan-möcüzbəyan)* bunu açıq-aşkar şəkildə sübut edir. Bununla belə, «Riyazül-qüds»dəki bu cümlədə «Hədiqətüs-süəda»nın təsirini göstərən əlamətlər də az deyil. Bu baxımdan ilk növbədə A.Bakıxanovun cümləsindəki *«dəf'i-hərarəti-ataş içün»* birləşməsinin qarşılığının farsca cümlədə olmadığı halda, Füzulinin cümləsində oxşar birləşmə vardır: *«təskini-hərarət içün».* Bu iki birləşmənin istər məzmunca, istərsə də formaca yaxınlığı göz qabağındadır. Aydınlıq üçün qeyd edək ki, A.Bakıxanovun birləşməsi çağdaş dilimizdə belə səslənir: «*Susuzluq hərarətini dəf etmək üçün*». Füzulinin birləşməsini isə, fikrimizcə, tərcümə etməyə ehtiyac yoxdur: bu birləşmə də eyni mənanı daşıyır. Bundan əlavə «Riyazül-qüds»dəki *«lə'li-ləbi-gövhərnisarına mülazim etməgin»* (gövhərsaçan ağzına qoymağı) birləşməsi «Hədiqətüs-süəda»da olan *«lə'li-abdarına mülazim etməgin»* birləşməsi ilə demək olar ki, üst-üstə düşür. Deməli, buradakı səsləşmə daha çox üslubi səciyyə daşıyır, bədii dil nümunələri ilə bağlıdır. Onu da qeyd edək ki, Füzuli bu birləşmədəki *«lə'li-abdar»* birləşməsini məcazi mənada işlətmişdir:

lüğəvi mənası qiymətli daş olan *«lə'l»* sözü da «ağız» mənasını daşıyır. A.Bakıxanov da, təbii ki, Füzulinin təsiri ilə burada həmin sözü «ağız» mənasında işlətmişdir. Məclisinin cümləsində isə bu sözün qarşılığı həqiqi mənada işlənmiş *«dəhan»* (ağız) sözüdür.

A.Bakıxanovun bu cümlədə işlətdiyi *«mülazim etməgin»* feli öz formasına görə diqqəti cəlb edir. İstər Füzulinin cümləsində, istərsə də A.Bakıxanovun cümləsində bu söz feli bağlama məzmununu daşıyır. «Hədiqətüs-süəda»da -*məgin* şəkilçili digər feli bağlamaların işlənməsi də bunu sübut edir. Məsələn: *«Əhli-məclis bu hekayətdan mütəəssir olub fəryadə gəlməgin Yezid ayıtdı»* (**29**, 301). Bununla belə, dil tariximizə aid tədqiqatlarda bu formada olan feli bağlama qeydə alınmamışdır. «Riyazül-qüds»də işlənmiş *«mülazim etməgin»* feli bağlaması, təbii ki, bilavasitə Füzuli «Hədiqətüs-süəda»sından əxz olunmuşdur.

Beləliklə, yuxarıdakı cümlələrin qarşılaşdırmasından belə bir nəticəyə gəlmək olar: A.Bakıxanov bu cümləni ümumilikdə götürdükdə «Cəlaül-üyun»dan sərbəst şəkildə tərcümə etmişdir, Bununla belə, yuxarıda qeyd etdiyimiz ifadələr burada «Hədiqətüs-süəda»nın da müəyyən təsiri olduğunu açıq-aşkar şəkildə sübut edir. Deməli, A.Bakıxanov bu cümləsində hər iki qaynaqdan bəhrələnmişdir.

Bu qəbildən olan daha bir nümunəyə diqqət yetirək: «Riyazül-qüds»ün beşinci babının səkkizinci fəslində imam Hüseynin (ə.) düşmənlə vuruşarkən fürsətdən istifadə edərək su içmək məqsədilə Fərat çayına girməsi, lakin bu zaman eşitdiyi bir sözə görə (guya düşmən qoşunu qadınlar olan çadırlara daxil olmuşdur) aldanaraq su içmədən geri dönməsi təsvir olunur. Məclisi bu epizodu təsvir edərkən ona belə bir detal da əlavə edir ki, imam Hüseyn (ə.) atı ilə bərabər suya girdikdə əvvəl atına su içməyi buyurur, sonra özü su içmək istəyir. Bu kiçik detal «Riyazül-qüds»də buraxılmışdır. Füzulinin «Hədiqətüs-süəda»sında da ona rast gəlmirik. Bundan əlavə,

«Riyazül-qüds»də epizodun təsvirində istifadə olunan bəzi söz və ifadələr «Cəlaül-üyun»la müqayisədə, «Hədiqətüs-süəda» əsərindəki leksik vahidlərlə daha yaxından səsləşir. Həmin epizoddan bir parça sözügedən əsərlərdə aşağıdakı kimidir:

**«Cəlaül-üyun»da:** *«Çun emam kəfi əz-ab bər gereft ke, beyaşaməd, məl'uni fəryad zəd ke, to ab miaşami* və *ləşkəre-moxalef dər xeymeha-ye hərəm dər-amədeənd. Həzrət abra rixt və ru be-xeymeha rəvane şod, did ke, an xəbər əsli nədaşte. Danest ke, moğədder şode əst ke, ruze-ye an ruzra əz ab-e kovsər be-dəst-e Xeyrol-bəşər eftar nəmayəd».* (223 b)

*(İmam ovcuna su alıb içmək istərkən bir məlun (lənətə gəlmiş) qışqırdı ki, sən su içirsən, ancaq düşmən qoşunu qadınların çadırlarına daxil olub. Həzrət suyu tökdü, çadırlara üz tutdu və gördü ki, o xəbər doğru deyil. Bildi ki, alnına yazılıb ki, o günün orucunu Xeyrül-bəşərin (Peyğəmbərin) əli ilə kövsər suyu ilə iftar edəcəkdir.)*

**«Hədiqətüs-süəda»da:** *«Nəhəngvar abi-Fərata girib, əlinə su alıb içmək tədarükündə ikən bir kimsənə nida yetirdi ki, ey Hüseyn, nə su içmək məcalıdır, ləşkəri-bədxah qarəti-hərəmsəraya mütəvəccih oldılar. Kəmali-qeyrət inani-ixtiyarın əlindən alub, bir qətrə su içmədən səməndi-seylrəftarın canibi-xeyməgahə səddi-sipər edüb yetdikdə gördi ki, ol avaz mən'i-ab içün bir hiylə imiş. Amma müvafiqi-iradeyi-təqdir vaqe olmış, zira ol gün şərbəti-şəhadət içmək müqərrər idi»* (**29**, 276).

**«Riyazül-qüds»də:** *«Sərvəri-sineyi-Xeyrül-bəşər və nuri-dideyi-saqiyi-kövsər... mərkəbi-dəryanəvərdin nəhri-Fərat içrə sürüb şürbi-ab tədarükində ikən bir məl'un səda yetirdi kim, ya Hüseyn, sən su içməkdəsən, ləşkəri-müxalif daxili-xiyami-hərəm olmışlar. Həzrəti-imam suyi əlindən töküb, dəsti-qeyrət zimami-izzətin büküb xeyməgahə gəldükdə gördi ol xəbəri-qeyri-vaqe kəndüsinə mən'i-ab içün bir hiylə imiş. Amma müvafiqi-təqdir olub, ol günun*

*ruzəsin zülali-kövsərdən iftar etməgə vəsilə imiş».* (63b)

Bu nümunələri də müqayisəli şəkildə və diqqətlə nəzərdən keçirdikdə «Riyazül-qüds»dəki parçanın «Hədiqətüs-süəda»da olan eyni hissəyə daha yaxın olması nəzərə çarpır. Bu yaxınlıq ilk növbədə hər iki nümunədəki cümlələrin quruluşlarında özünü göstərir. Füzulinin birinci cümləsi tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlədir və onun baş cümləsində feli bağlama tərkibləri işlənmişdir. A.Bakıxanovun birinci cümləsi də oxşar quruluşludur. Maraqlıdır ki, A.Bakıxanovun bu cümlədə işlətdiyi *«tədarükində ikən»* ifadəsi eynilə Füzulinin cümləsində də vardır. Bundan əlavə, buradakı *«səda yetürdi»* tərkibi feli Füzulinin cümləsindəki *«nida yetürdi»* tərkibi feli ilə yaxından səsləşir. Bu cümlələrdəki xitablar da (*ey Hüseyn, ya Hüseyn*) eynidir. «Cəlaül-üyun»da isə bu cümlə bir qədər başqa quruluşdadır, həm də onda xitab işlənməmişdir. «Riyazül-qüds»ün ikinci cümləsinin *«mən'i-ab içün bir hiylə imiş»* hissəsinin eynilə «Hədiqətüs-süəda» əsərində də işlənməsi bu yaxınlıq və oxşarlığı sübut edən tutarlı dəlillərdən sayıla bilər. «Riyazül-qüds»dəki sonuncu cümlənin *«amma müvafiqi-təqdir olub»* hissəsi də «Hədiqətüs-süəda»nın eyni cümləsinin həmin hissəsi ilə (*«amma müvafiqi-iradeyi-təqdir vaqe olub»*) yaxından səsləşir.

«Riyazül-qüds»dəki bu parça ilə «Cəlaül-üyun»da olan nümunə arasında da müəyyən yaxınlıq və uyğunluq olduğunu göstərən əlamətlər az deyil. Məsələn, «Cəlaül-üyun»da işlənmiş *«məl'un», «ləşkəri-müxalif»* (düşmən qoşunu), *«ruzə»* (oruc), *«kövsər», «iftar»* kimi söz və ifadələrin «Riyazül-qüds»də də olması buna əyani sübutdur. Bununla belə, «Riyazül-qüds»dəki bu parça bütövlükdə götürdükdə «Hədiqətüs-süəda»da olan nümunə ilə daha yaxından səsləşir və onlar arasındakı oxşarlıq, yaxınlıq əlamətləri daha qabarıq şəkildə özünü göstərir.

«Riyazül-qüds»lə «Hədiqətüs-süəda» arasındakı səsləşmə məqamları hər iki əsərdə hadisələrin təsviri zamanı istifadə olunan bəzi obrazlı ifadələrin, ayrı-ayrı məcaz

növlərinin eyniliyində də özünü göstərir. Məsələn, «Hədiqətüs-süəda»dakı Müslim bin Əqilin şəhadətinə həsr olunan beşinci babda belə bir epizod var: Müslim Əqil ona kömək edən Hani bin Ürvənin öldürüldüyünü eşidəndən sonra Kufə valisi Übeydullah Ziyadın qoşunu ilə vuruşmağa gedir və iyirmi minə yaxın kufəli də ona qoşulur. Bu zaman xəbər gəlir ki, Übeydullaha kömək üçün Şamdan qoşun gəlir. Bu xəbəri eşidən kufəlilər Müslimi tənha qoyub dağılışırlar. Əvvəlcə Müslimin müdafiəsinə qalxan kufəlilərin bu hərəkətini Füzuli obrazlı şəkildə belə təsvir edir:

*«Əhli-Kufə ki zatlarında səbati-e'tiqad yok idi, bu hekayətdən mütəvəhhim olub, güruh-güruh həzimətə təvəccöh qıldılar və Pərvin kibi cəm' ikən Bənatünn'əş kibi mütəfərriq oldılar»* (**29**, 190). Füzuli burada kufəlilərin əvvəlcə Müslimin yanına yığılmasını (cəm olmasını) klassik ədəbiyyatda birlik rəmzi kimi işlənən Pərvin (Ülkər) ulduzuna, sonradan dağılmalarını isə dağınıqlıq, pərakəndəlik rəmzi olan Bənatünnəşə - Böyük və Kiçik Ayı bürclərində bir-birindən aralı yerləşən ulduzlara bənzədir.

A.Bakıxanov da kufəlilərin Müslimi tərk etməsini təsvir edərkən eyni təşbehdən (bənzətmədən) istifadə etmişdir:

*«Bu ittiladən güruhi-ənbuh iqdi-Sürəyyaasa müctəme' ikən Bənatənnə'şvəş mütəfərriq oldılar»* (39a). Qeyd edək ki, bu cümlədə işlənən ərəb mənşəli Sürəyya da ulduz adıdır - fars mənşəli Pərvin ulduzunun başqa adıdır. A.Bakıxanov burada Füzulidən fərqli olaraq, *«kibi»* qoşması əvəzinə eyni mənanı daşıyan fars mənşəli *«asa»* və *«vəş»* şəkilçilərindən istifadə etmişdir. Bu cümlələrin məzmunu, xüsusilə də son hissəsi tam eynidir: «Hədiqətüs-süəda»da olan «*cəm ikən»* sözünü A.Bakıxanov eyni mənalı *«müctəme' ikən»* sözü ilə vermiş, birincidəki *«mütəfərriq oldılar»* (dağıldılar) sözünü isə eynilə saxlamışdır. Bütün bunları nəzərə alaraq düşünmək olar ki, A.Bakıxanov bu cümlədə bilavasitə Füzulinin təsirilə sözügedən

təşbehdən istifadə etmişdir.* «Riyazül-qüds»dəki cümlənin «Cəlaül-üyun»dakı qarşılığında ulduzlarla bağlı təşbehin işlədilməməsi də bunu sübut edir:

*«Çun əhl-e ğəbile-ye u şenidənd ke, dər-həyat əst, pərakənde şodənd»* (202a).

(*Onun qəbiləsinin camaatı eşitdi ki, [Hani bin Ürvə] sağdır, dağılışdı.*)

Qeyd edək ki, Müslim Əqili müdafiə edən kufəlilərin dağılması ilə bağlı verilən yuxarıdakı cümlədə onların bu hərəkətinin səbəbi «Hədiqətüs-süəda»da Şamdan Kufəyə kömək üçün qoşunun gəlməsi ilə izah edildiyi halda, «Cəlaül-üyun»da (həm də «Riyazül-qüds»də) isə buna səbəb olaraq Müslimi evində gizlədən Hani bin Ürvənin sağ olması göstərilir (qorxuya düşən Übeydullah kufəlilərə xəbər göndərir ki, Hani ölməyibdir, sağdır).

«Riyazül-qüds»lə «Hədiqətüs-süəda»nın mətnlərinin qarşılıqlı təhlili birincidə ikincinin təsirinin nəsrlə müqayisədə nəzm parçalarında daha qabarıq şəkildə özünü göstərdiyini üzə çıxarır. Bu təsir iki şəkildə özünü göstərir: birincisi, «Riyazül-qüds»dəki bir sıra şeir parçalarının işlənmə məqamları «Hədiqətüs-süəda»dakı uyğun şeir parçaları ilə üst-üstə düşür; ikincisi isə, hər iki əsərdə verilən bəzi şeir nümunələri arasında məzmun baxımından müəyyən yaxınlıq müşahidə olunur. Bu məsələ ilə bağlı birinci növbədə qeyd etmək lazımdır ki, «Hədiqətüs-süəda»nın ümumi həcmi «Riyazül-qüds»dən təxminən üçqat artıq olduğu kimi, ondakı şeir parçaları da istər ümumi sayına, istərsə də beyt sayına görə

---

* Füzulidən çox-çox əvvəl dahi Nizami Gəncəvi də «Xosrov və Şirin» poemasındakı aşağıdakı beytdə eynilə bu iki ulduz - bürc adını məcazi mənada (istiarə kimi) işlətmişdir.

*Dəvidənd an şegerfan su-ye Şirin,*
*Bənatonnə'şra kərdənd Pərvin.* (**108**,134)
(*O gözəllər Şirinə tərəf qaçdılar,*
*Bənatünnə'şi Pərvin etdilər*).

ikincidən xeyli çoxdur. Belə ki, Füzulinin bu əsərindəki şeir nümunələrinin ümumi sayı (türkcə 525, ərəbcə 16), onlardakı beyt sayı isə 1151-dir. «Riyazül-qüds»də isə bu rəqəm, qeyd etdiyimiz kimi, müvafiq olaraq 294-ə və 845-ə bərabərdir.

Deməli, «Riyazül-qüds»dəki şeir parçalarının istər ümumi sayı, istərsə də həcmi (beytlərin sayı) «Hədiqətüs-süəda» ilə müqayisədə azdır. Məsələn, «Riyazül-qüds»ün Məhəmməd peyğəmbərin(s.) vəfatından bəhs edən ilk babındakı şeir nümunələrinin sayı 14 olduğu halda, «Hədiqətüs-süəda»nın eyni babında bu rəqəm 26-ya bərabərdir. Eləcə də «Riyazül-qüds»də Müslim bin Əqil haqqındakı fəsildə olan şeirlərin sayı cəmi 5-dir, «Hədiqətüs-süəda»da isə həmin babda 31 şeir parçası verilmişdir. Bununla belə, bu iki əsərdəki şeir parçaları arasında say baxımından kəskin fərq olsa da, onların işlənmə məqamları bir sıra hallarda üst-üstə düşür. Bu isə aydındır ki, yalnız «Hədiqətüs-süəda»nın təsirinin nəticəsi kimi dəyərləndirilə bilər.

İndi isə hər iki əsərdə işlənmə məqamlarına görə eyni olan bir neçə şeir parçasına nəzər salaq. «Hədiqətüs-süəda»nın səkkizinci babında təsvir olunur ki, Müslim bin Əqil şəhid olmamışdan qabaq əmisi oğlu imam Hüseyni (ə.) yada salaraq göz yaşları tökür. Bu məqamda Füzuli onun dilindən aşağıdakı şeir parçasını verir:

*Buq 'eyi-Bəthayə bir lütf eyləyib var, ey səba,*
*Qıl Hüseyni hali-zarimdən xəbərdar, ey səba.*
*Gör bəni könlümdə yüz bin dərdi-dil, üstümdə tığ,*
*Necə kim gördün, aŋa şərh eylə, zinhar, ey səba.*
*Cəhd qıl, mən' eylə ol məzlumi meyli-Kufədən,*
*Öp ayağın çizginüb başına yalvar, ey səba...* (**29**, 194)

«Riyazül-qüds»də də eynilə bu epizodun təsviri zamanı oxşar məzmunlu bir şeir parçası verilmişdir:

*Dövri-sipehri-kinə çü dutdi təriqeyi-cəfa,*
*Qoydi bəni-bəlakeşi düşmən əlində binəva.*
*Halimi gör, nə növdür, badi-səba, bəyan et,*
*Səbti-Rəsulə mən' qıl, ta edə tərki-müddəa.*
*Qılsa İraqə əzm əgər, bikəsü bimədəd qalur,*
*Bəsteyi-dami-cövr olur bən kimi zarü mübtəla...* (40b)

Bu şeir parçalarının məzmunları arasında da müəyyən bir oxşarlıq müşahidə olunur. Hər iki nümunədə Müslim səbaya (səhər küləyinə) üz tutaraq xahiş edir ki, onun halını imama (ə.) çatdırsın və imamın (ə.) Kufəyə gəlməsinə mane olsun.

Daha bir nümunəyə müraciət edək. «Hədiqətüs-süəda»nın beşinci babında imam Hüseyn (ə.) babasının məzarını ziyarət edərkən Füzuli onun dilindən aşağıdakı misralarla başlayan şeir parçasını verir:

*Əssalam, ey asitanın rəşki-firdovsi-bərin,*
*Xakrubi-dərgəhin müjgani-çeşmi hurü eyn...*
*Ümməti-zalim baŋa izhari-bidad etdilər,*
*Bikəsəm, biçarəyəm, sənsən baŋa ancaq müin.* (**29**, 172)

«Riyazül-qüds»də də eyni məqamda bu misralarla başlayan şeir parçası vardır:

*Əssəlam, ey tacidari-mülki-iman, əssalam,*
*Əssəlam, ey müqtədayi-əhli-imkan, əssəlam...*
*Əssalam, ey zübdeyi-kövnü məkan, gör halımı,*
*Daği-bidad eyləyübdür bağrımı qan, əssəlam...* (34b)

Bu şeir parçalarının hər ikisinin eyni məqamda işlənməsi, eləcə də eyni sözlərlə başlanması və sonuncu beytlərin məzmun baxımından da müəyyən dərəcədə yaxınlığı (hər ikisində imama (ə.) zülm edilməsindən danışılır) yenə də «Riyazül-qüds»da «Hədiqətüs-süəda»nın təsirinin nəticəsi kimi qəbul edilə bilər.

Füzuli ilə Bakıxanovun sözügedən əsərlərinin bu hissəsində olan daha bir şeir parçası istər quruluşca, istərsə də onlarda işlənmiş ifadələr baxımından bir-biri ilə yaxından səsləşir:

**«Hədiqətüs-süəda»da:**

*Əlvida, ey sərvi-gülzari-imamət, əlvida!*
*Əlvida, ey şəm'i-bəzmi-istiqamət, əlvida!*
*Əlvida, ey zəhr təsirilə rəngin səbzfam,*
*Əlvida,* ey *səbzeyi-bağï-qiyamət, əlvida!* (**29**, 173)

**«Riyazül-qüds»də:**

*Əlvida, ey gövhəri-dürci-risalət, əlvida!*
*Əlvida, ey əxtəri-bürci-cəlalət, əlvida!*
*Əlvida, ey qönçeyi-əclali-zatim gülbüni,*
*Əlvida, ey laleyi-gülzari-ismət, əlvida...* (35b)

Bu şeir parçalarının hər ikisi imam Hüseynin (ə.) dilindəndir, lakin onlardan birincisi (Füzulidəki) imam Həsənə (ə.) müraciətlə deyilmiş, ikincisi isə (A.Bakıxanovdakı) həzrət Fatiməyə (ə.) ünvanlanmışdır. Bununla belə, onlarda bir-biri ilə səsləşən məqamlar az deyildir. Belə ki, onların hər ikisi *«əlvida»* sözləri ilə başlanır və üçüncü misra istisna olmaqla, həmin sözlə də bitir. Bundan əlavə, *«əlvida»* sözündən qabaq işlənmiş və qafiyə təşkil edən sözlər,

birincidə: *«imamət», «istiqamət», «qiyamət»;* ikincidə isə: *«risalət», «cəlalət», «ismət»* səslənmə baxımından bir-birinə yaxın sözlərdir və onlar arasında müəyyən bir uyğunluq, səsləşmə yaradır. Deməli, bu şeir parçaları arasında da açıq-aşkar səsləşmə və uyarlıq xüsusiyyətləri özünü göstərir ki, bu da «Riyazül-qüds»də «Hədiqətüs-süəda»nın təsirini sübut edən dəlillərdən biri kimi qəbul edilə bilər.

Hər iki əsərdə olan daha bir eyni epizodda - imam Hüseynin (ə.) Kərbəlada düşmənlə döyüşə getməzdən öncə səhrada olan ailə üzvləri ilə vidalaşması səhnəsində imamın (ə.) dilindən verilən aşağıdakı şeir parçaları arasında da müəyyən səsləşmələr özünü göstərir:

**«Hədiqətüs-süəda»da:**

*Gəldi ol dəm ki, dili-qəmnakımı şad eyləyəm,*
*Mürği-ruhi damgahi-təndən azad eyləyəm.*
*Gəldi ol dəm ki, bu möhnətxanəyi viran edüb,*
*Qüds mülkinə binayi-işrət abad eyləyəm...* (**29**, 277)

**«Riyazül-qüds»də:**

*Yetdi ol dəm kim, şəhadət zövqün idrak eyləyəm,*
*Ruzigar alayişindən damənim pak eyləyəm.*
*Yetdi ol dəm kim, keçüb möhnətsərayi-dəhrdən,*
*Müttəsəl məhzun olan könlüm fərəhnak eyləyəm.*
(63b)

Füzulinin bu şeir parçasındakı birinci və üçüncü misralar *«gəldi ol dəm ki»* sözləri ilə başlanır. Bu baxımdan A.Bakıxanovun şeir parçasının da həmin misraları Füzulinin misraları ilə eyniyyət təşkil edir: onlar da *«yetdi ol dəm kim»* sözləri ilə başlanır. Aydındır ki, bu ifadələr eyni məna daşıyır. Bu iki nümunənin üçüncü misradan başqa, digər

misralarında *«eyləyəm»* sözünün rədif yerində işlənməsi də onlar arasında müəyyən səsləşmə yaradır. Bundan əlavə, yuxarıdakı şeir praçalarının ümumi məzmunları da bir-birinə uyğun gəlir. Hər iki nümunədə imam Hüseyn bu dünyanı *«möhnət evi»* (Füzulidə: *«möhnətxanə»,* Bakıxanovda: *«möhnətsəray»)* adlandıraraq onu tərk etmək vaxtının yetişdiyini bildirir və bu səbəbdən də qəlbindəki fərəh və sevinc hislərini ifadə edir.

Beləliklə, bu və bu kimi digər nümunələr A.Bakıxanovun nəsrdə olduğu kimi, nəzmdə də Füzulinin «Hədiqətüs-süəda» əsərindən ustalıqla və yaradıcılıqla bəhrələndiyini və «Riyazül-qüds»ü qələmə alarkən sələfinin güclü təsiri altında olduğunu açıq-aşkar şəkildə sübut edir.

Nəhayət, «Riyazül-qüds»də «Hədiqətüs-süəda»nın təsiri məsələsi A.Bakıxanovun bu əsərinə ad seçimi məsləsində də özünü göstərir. İlk baxışda bu məsələ bir qədər qəribə görünsə də , amma bu, danılmaz bir həqiqətdir. Məsələ burasındadır ki, bu iki əsərin adlarındakı birinci tərəflər sinonimdir, hər ikisnin mənası "bağ", "cənnət bağı" deməkdir. A.Bakıxanov bu əsərinə olduqca uğurlu bir ad seçmiş və burada həm ustadı Füzulinin əsərinin adındakı birinci tərəfin sinonimini işlətmiş, həm də öz təxəllüsündən (Qüdsi) istifadə etmişdir. Bu baxımdan yuxarıda da qeyd olunduğu kimi, A.Bakıxanovun əsəri ilə Məclisinin "Cəlaül-üyun"u arasında elə bir bağlılıq nəzərə çarpmır.

«Riyazül-qüds»də «Hədiqətüs-süəda»nın təsiri məsələsinin yekunu olaraq bir məsələyə də münasibətimizi bildirmək istəyirik. Araşdırmamızın əvvəlində qeyd etdiyimiz kimi, Azərbaycan ədəbiyyatşünaslığında indiyədək belə fikirlər səslənmişdir ki, A.Bakıxanovun «Riyazül-qüds»ü M.Füzulinin «Hədiqətüs-süəda»sına yazılmış nəzirədir (bax: **23**, 84; **34**, 129). «Riyazül-qüds»də olan və yuxarıda qeyd etdiyimiz mühüm bir fakt - A.Bakıxanovun birmənalı şəkildə bu əsərini «Cəlaül-üyun»un tərcüməsi adlandırması bu fikrin yalnış

olduğunu təsdiqləyir. Bəs onda «Riyazül-qüds»də açıq-aşkar özünü göstərən «Hədiqətüs-süəda» təsirini nə ilə izah etmək olar? Fikrimizcə, bu təsiri təkcə sözügedən əsərlər arasındakı məzmun bağlılığı və yaxınlığı ilə izah etmək düzgün olmazdı. Yuxarıda da xüsusi olaraq vurğuladığımız kimi, «Riyazül-qüds»ü «Hədiqətüs-süəda»ya bağlayan amillər sırasında dil-üslub məsələsi də xüsusi yer tutur. Məlum olduğu kimi, Füzulinin bütün əsərləri yüksək bədii üslubda - klassik-kitab üslubunda (bax: **21,** 208-212; **33**, 57-61) qələmə alınmışdır. Dahi sənətkarın «Hədiqətüs-süəda»sı da bu üslubdadır və sonrakı yüzilliklərdə Azərbaycan ədəbiyyatında klassik üslubda qələmə alınan anadilli bütün bədii nəsr əsərləri üçün əvəzsiz örnək olmuş, onlara öz güclü təsirini göstərmişdir. Təkcə bunu qeyd etmək kifayətdir ki, XVIII əsrə aid Möhsün Nəsirinin «Lisanüt-teyr», A.Bakıxanovun «Kitabi-Əsgəriyyə» əsərlərində də bu təsirin qabarıq izləri özünü göstərir, halbuki bu əsərlər arasında məzmunca heç bir bağlılıq yoxdur. Maraqlıdır ki, Möhsün Nəsiri «Lisanüt-teyr»in mətninə Füzuli şeirlərindən nümunələr daxil etməklə yanaşı, əsərini «Hədiqətüs-süəda»nın aşağıdakı son misraları ilə tamamlamışdır:

*Gəl, ey hali-təkəllümdən xəbərdar,*
*Tərəhhüm qıl, təərrüz qılma, zinhar* (**50**, 243).

Deməli, M.Nəsirinin sözügedən əsərində Füzuli təsiri ilk növbədə dahi sənətkarın bənzərsiz və möcüzəli sənətinin sehri və tilsimi ilə bağlıdır.

Məlum olduğu klmi, A.Bakıxanovun yaşayıb-yaratdığı XIX yüzillikdə isə Azərbaycan ədəbiyyatında Füzuli təsiri daha güclü olmuş və bu dövrdə yaşamış bir çox şairlər dahi sənətkarın doğma ana dilindəki qəzəllərinə nəzirələr və təxmislər yazmışlar. Bu təsir ədəbi məclis üzvü olan şairlərin yaradıcılığında daha qabarıq şəkildə özünü göstərmişdir. A.Bakıaxanov da həm Qubadakı “Gülüstan” məclisinin, həm

də Tiflisdə fəaliyyət göstərən "Divani-hikmət" ədəbi məclisinin üzvü olmuşdur. Deməli, A.Bakıxanov yaradıcılığındakı Füzuli təsirini təbii bir hal kimi qəbul etmək lazım gəlir.

Beləliklə, A.Bakıxanovun «Riyazül-qüds» əsəri ilə Füzulinin «Hədiqətüs-süəda»sının mətnlərinin qarşılaşdırılması göstərir ki, birincidə ikincinin güclü təsiri olmuşdur. Bu təsir «Riyazül-qüds»də istər əsərin əsas hissəsi olan nəsrdə, istərsə də kitabdakı nəzm parçalarında açıq-aşkar şəkildə özünü göstərir və təkcə məzmun məsələsi ilə məhdudlaşmır, eyni zamanda dil-üslub xüsusiyyətlərini də özündə birləşdirir.

# İKİNCİ BÖLMƏ

## «Riyazül-qiids»ün dil-üslub və bədii sənətkarlıq xüsusiyyətləri

A.Bakıxanovun «Riyazül-qüds» əsəri indiyədək öyrənilmədiyi kimi, onun dil-üslub xüsusiyyətləri də, təbii ki, araşdırılmamışdır. Bununla belə, Azərbaycan ədəbi dili tarixinə aid tədqiqatlarda, ümumiyyətlə, A.Bakıxanovun dilinə, o cümlədən nəsr dilinə də müəyyən yer ayrılmış, onun başlıca səciyyəvi xüsusiyyətləri qeyd olunmuşdur (bax: **33**, 59-67). A.Bakıxanovun ana dilində yazdığı nəsr əsəri isə, məlum olduğu kimi, ikidir: «Riyazül-qüds» və «Kitabi-Əsgəriyyə». Ədəbi dil tarixinə aid araşdırmalarda bu əsərlərdən ikincisinin dil faktlarından müəyyən dərəcədə istifadə edilsə də, birincisi toxunulmaz qalmışdır. Bu məsələdə, təbii ki, «Riyazül-qüds»ün sırf dini məzmun daşıması ilə yanaşı, yalnız əlyazma şəklində mövcudluğu, yəni nəşr olunmaması da öz təsirini göstərmişdir.

Azərbaycan ədəbi dil tarixini araşdıran görkəmli dilçi alim, Azərbaycan MEA-nın həqiqi üzvü, professor T.Hacıyev yazır: *«XIX əsrin birinci yarısında klassik-kitab üslubunun ən istedadlı nümayəndəsi A.Bakıxanovdur»* (**32**, 56). «Kitabi-Əsgəriyyə»nin dilini *«klassik-kitab nəsrinin tipik nümayəndələrindən»* biri kimi səciyyələndirən alim qeyd edir ki, əsərdə sözügedən üslubun bütün əlamətləri saxlanılmışdır. Həmin əlamətlər sırasında isə

alim bunları qeyd edir: ərəb-fars sözlərinin bolluğu, cümlələrin uzunluğu, silsiləli izafət tərkiblərinin işləkliyi və nəsrin qafiyəli olması (**32**, 64). Yeri gəlmişkən qeyd edək ki, professor Ə.Dəmirçizadə də yuxarıdakı əlamətləri bu və ya digər dərəcədə Füzulinin nəsr dilinə aid etmişdir (bax: **21,** 208-209). Biz də irəlidə «Riyazül-qüds»də Füzulinin «Hədiqətüs-süəda» əsərinin təsirindən bəhs edərkən bu məsələyə - birincidə dil-üslub baxımından ikinci ilə müəyyən səsləşmə və yaxınlığın olması məsələsini konkret nümunələrlə göstərmişdik. Professor T.Hacıyev də «Kitabi-Əsgəriyyə»nin dilindən bəhs edərkən onun dili ilə Füzulinin ana dilindəki nəsr əsərlərinin (Divanının dibaçəsi, «Şikayətnamə» və məktublarının nəsr hissələrinin) dili arasında tam eynilik olduğunu qeyd edir (**32**, 65). Bütün bunları nəzərə alaraq, «Kitabi-Əsgəriyyə»nin dili haqqındakı fikirləri bütövlükdə götürdükdə «Riyazül-qüds»ə də aid etmək olar. «Riyazül-qüds» də «Kitabi-Əsgəriyyə» kimi şərti olaraq **«klassik-kitab üslubu»** adlandırılan (**33**, 56-57) yüksək bədii üslubda qələmə alınmışdır və onun bütün səciyyəvi xüsusiyyətlərini özündə daşıyır. Düzdür, burada bir incə məqam A.Bakıxanovun bu iki əsərini dil-üslub xüsusiyyətləri baxımından eyni müstəviyə qoymağa, onlara tam eyni gözlə baxmağa müəyyən mənada «mane olur». Məsələ burasındadır ki, onlardan birincisi, orijinal əsər, ikincisi isə, bütün əlamətlərinə görə klassik sərbəst-tərcümə nümunəsidir. Klassik tərcümə əsərlərində isə, bir sıra hallarda bu və ya digər dərəcədə orijinalın dilinin təsiri müşahidə olunur (bax: **56**, 159-169). Yuxarıda da qeyd etdiyimiz kimi, «Riyazül-qüds»də isə bu təsir, demək olar ki, yox dərəcəsindədir. Deməli, «Kitabi-Əsgəriyyə» və «Riyazül-qüds» arasında dil-üslub xüsusiyyətləri baxımından ciddi bir fərqdən danışmağa belə dəyməz. Bu fərq hətta olsa belə, əhəmiyyətli ola bilməz, çünki onların hər ikisi eyni sənətkarın qələmindən çıxmışdır və qafiyəli nəsrlə, yüksək bədii üslubda qələmə alınmışdır.

Professor T.Hacıyev «Kitabi-Əsgəriyyə»dən bir par-

çanı nümunə kimi verərək onun dilindəki sözlərin dörddə üçünün əcnəbi leksikonu olduğunu diqqətə çatdırır (**32**, 65). Eləcə də professor Ə.Dəmirçizadə «Hədiqətüs-süəda»nın giriş hissəsində 300 sözdən ibarət bir mətndə işlənmiş azərbaycanca (türkcə) sözlərin cəmi 23 olduğunu yazır (**21**, 208). Maraqlıdır ki, «Riyazül-qüds»də də bu məsələdə vəziyyət, demək olar ki, eynidir. Bunu aşağıdakı kiçik parçada əyani olaraq görmək mümkündür: *«Zümreyi-ərbabi-kəmal və əhli-irfanə izhari-hal və firqeyi-ulüləlbabi-nüktədanə ərzi-məal oldur kim, vüfuri-əhli-cəlalət və kəsadi-bazari-kəmalatə və qilləti-fürsət və füqdani-alatə və ədəmi-istitaət iğtişaşi-halimə və təfriqeyi-həvas və kəsrəti-iştiqalimə bakub və əksəri-istilahətdən ittila' bulmayub, bu fünun əhlindən olmaduqimə və mövlid və mövtinim bu növ namünasib məqam olub, özgə biladi-əhli sədada səfər qılmaduqimə nəzəri-insaf burakub, əlfazi-məaində rəkik və nöqsan məlhuz olsa və ədəmi-tətabiq səvabiti-rəvayətdə və nöqsi-təvafüq rəvabiti-ibarətdə zühurə gəlsə, məlamət qılmayub, islah etsünlər»* (91a). Cəmi bir cümlədən ibarət olan bu nümunədə yüksək klassik üslubda yazılmış əsərlər üçün səciyyəvi olan bütün əlamətlər öz əksini tapmışdır. Bu baxımdan birinci olaraq, nümunədəki ərəb-fars sözlərinin əksəriyyət təşkil etdiyini göstərmək olar. Belə ki, cümlədə işlənmiş 76 sözdən (*«və»* bağlayıcısını hesaba almırıq) cəmi 13-ü türk mənşəli sözdür: *oldur kim, bakub, bulmayub, bu* (2 dəfə işlənib), *olmaduqimə, özgə, qılmaduqimə, burakub, olsa, gəlsə, qılmayub, etsünlər.* Bu sözlərdən də ikisi *«qılmaq»* köməkçi feli (müxtəlif formada), ikisi *«olmaq»* köməkçi feli (müxtəlif formada), biri isə *«etmək»* köməkçi felidir. Bu cümlənin ikinci bir səciyyəvi xüsusiyyəti onun çağdaş ədəbi dilimizlə müqayisədə olduqca uzun olmasıdır. Üçüncüsü, burada çoxlu izafət tərkibləri vardır; dördüncüsü isə, nəsrdə qafiyəlilik əlamətləri özünü göstərir. Deməli, Füzulinin «Hədiqətüs-süəda»sının, A.Bakıxanovun «Kitabi-Əsgəriyyə»sinin dili üçün əlamətdar olan bütün xüsusiyyətlər «Riyazül-qüds» üçün də səciyyəvidir. Bu cümlə

ərəb-fars sözləri və ifadələri ilə yüklənməsinə baxmayaraq, qrammatik quruluşuna görə dilimizin öz qayda-qanunlarına tabedir. Cümlədə öz dilimizə məxsus hal şəkilçilərinin işlənməsi, *«ol»* işarə əvəzliyinin, feillərin xəbər yerində çıxış etməsi buna əyani sübutdur.

Qeyd etmək lazımdır ki, yuxarıdakı nümunə əsərin sonluq («Xatimə») hissəsindədir və A.Bakıxanovun özünə məxsusdur, tərcümə deyil. Məlum olduğu kimi, klassik kilab nümunələrində isə dil qəlizliyi daha çox onların əvvəllərində və sonlarında olan hissələrdə daha qabarıq şəkildə özünü göstərir. «Riyazül-qüds»də bilavasitə əsərin məzmunu ilə bağlı hissələrdə də ərəb-fars sözləri üstünlük təşkil edir. Məsələn: *«Səpidədəm ki əmaridari-qafileyi-əyyam hövdəci-zərrini-aftabı naqeyi-sürxmuyi-şəfəq üzrə bağlayub məhari-zərtari-şüayla biyabani-sipehrə çəkməkdə idi, həsbül-hökm həzrəti-əqdəsi-vala saribanlar məhmilləri cəmmali-kuh kuhani-gərdunmisal üzrə bağlayub rəvanə olduqda Məhəmməd Hənəfiyyə gəlüb ərz etdi»* (42a). İmam Hüseynin (ə.) Mədinədən Məkkəyə getməsi ilə bağlı verilən bu cümlədə də yalnız feillər (*«bağlayub», «çəkməkdə idi», «rəvanə olduqda», «gəlüb», «ərz etdi»*) və *«üzrə», «ilə»* qoşmaları türk mənşəli sözlərdir, digər sözlər isə ərəb-fars mənşəlidir və onlardan bəziləri nadir işlənən leksik vahidlərdir (*«əmaridar», «hövdəc», «məhmil», «cəmmal»*). Yeri gəlmişkən qeyd edək ki, silsiləli izafətlərlə, təmtəraqlı və dəbdəbəli ifadələrlə yüklənmiş «Riyazül-qüds»ün dili «Hədiqətüs-süəda» ilə müqayisədə daha qəliz və ağırdır, müasir oxucu üçün çətin başa düşüləndir.

«Riyazül-qüds»də nisbətən sadə və anlaşıqlı dillə qələmə alınmış müəyyən parçalar, ayır-ayrı yerlər də vardır. Əsərdə mükalimə şəklində qurulan və nisbətən qısa cümlələrdən ibarət olan hissələr, xüsusilə də faciəvi hadisələrin təsvirini əks etdirən səhnələr dilinin canlılığı və lakonikliyi ilə seçilir. Aşağıdakı kiçik parçalar buna nümunə ola bilər:

*«Bir gün Kəlimi-Turi-Sina, həzrəti-Musa kəndü vəsisi*

*Yuşa ibn Nun ilə biyabani-ələmpayani-Kərbəlayə varid olub, əsnayi-üburdə bəndi-nəleyni qırılub, payi-mübarəkin xaşakü xar məcruh və figar etdükdə münacat etdi: - İlahi, türfə halətdir kim, bu vadiyi-qəmi-mübadidə mütəəllim olduğum kimi cümlə aləmdə əziyyət bulmadım?! Vəhy irdi: - Ya Musa, bu mənzildə bənim bərgüzidəm Hüseyn qanı nahəq tökülücəqdür. İstədim, sənin qanın dəxi bu torpağə məmzuc olsun. Dedi: - Xudavənda, Hüseyn kimdir? Xitab irdi kim, nuri-dideyi-Məhəmmədül-Mustəfa və fərzəndi-dilbəndi-Əliyyül-Murtəza və çirağı-nurbəxşi-dudmani-Fatimeyi-Zəhra. Dedi: - İlahi, onun qatili kim olacaqdur?Bu zülmi-sərih kimdən zühur bulacaqdur?».* (32b)

*«Nagah ol məl'unin nəzəri bana sataşanda, bən fərar etdükdə, sinani-nizə ilə kətfimə urub yüzi aşağa yıxıldım. Ol məl'un qulağlarımı parə edüb, guşvarələrimi və başımdan miqnəəmi götürdi. Bən nəhayəti-vəhşətdən bihuş olub genə huşa gəldükdə gördim əmmeyi-mehribanım başım üstə əgləşüb derdi: - Ayağa dur, xeymələrə varub görəyim, bəradəri-bimarun və sayiri-Əhli-beyti-ətharun başına nə bəlalər gəlmiş».* (66a-b)

*«Pəs mütəvəccihi-imam Zeynəlabidin olub sordı kim, bu kimdir? Dedilər: - Əli ibn əl-Hüseyndir. Dedi: - Bən eşitdüm Əli ibn əl-Hüseyni Allah öldürdi. Həzrət buyurdı: - Əli adlu qardaşım var idi, xəlq onı cövr və sitəm ilə şəhid etdilər. İbn Ziyad dedi: - Bəli, Həqq-təala onı həlak edübdür. Həzrət buyurdı: - Cumlənin ruhi onun əmri ilə qəbz olunur. Ol kafəri-bədbəxt və sitəmgəri-dilsəxt dedi: - Sən bənim cavabıma cür'ət edərsən? Aparunız bunı həlak edüniz. Cənabi-Zeynəb bu sözi eşidəndə rişteyi-səbr dəsti-tabından gedüb, yüz iztirab ilən ayağa durub ol cənabə yapışdı, dedi: - Vallah, bu şahzadədən əl götürməzəm. Əgər bunun qətlini iradə edərsən, bəni dəxi həlak et».* (70b)

Birinci nümunənin əvvəli izafət tərkibləri hesabına bir qədər qəliz olsa da, onun mükalimə şəklində verilən hissəsi sadə

və yığcam cümlələr şəklində qurulmuşdur və nisbətən anlaşıqlıdır. Buradakı son iki cümlə isə şeir təsirini bağışlayır, ahəngdarlığı və axıcılığı ilə diqqəti cəlb edir.

İkinci nümunənin dili birinci ilə müqayisədə daha sadə və anlaşıqlıdır. Burada xalq danışıq dilindən gələn ifadələr də işlənmişdir: *yüzi aşağa yıxıldım, başım üstə əgləşüb, başına nə bəlalər gəlmiş*. Nümunədə birinci tərəfləri ərəb və fars mənşəli sözlərdən təşkil olunmuş frazeoloji birləşmələrin işlənməsi də diqqəti cəlb edir: *nəzəri sataşanda, huşa gəldükdə.* Cümlədəki sonuncu ifadə də *(başına nə bəlalər gəlmiş)* bu qəbildəndir. Üçüncü nümunədəki cümlələr də sadə və yığcamlığı ilə seçilir. Dialoq şəklində qurulmuş bu parçada bir-iki izafət tərkibini çıxmaq şərtilə, əksər sözlər anlaşıqlıdır. Burada türk mənşəli sözlərlə ərəb-fars mənşəli sözlərin nisbəti təxminən yarıbayarıdır. Bu parçadakı son cümlə isə xalq danışıq dilini xatırladır. Nümunədə *«əl götürməzəm»* frazeoloji birləşməsinin işlənməsi də diqqəti çəkir. Bu birləşmədəki fel hissəsində qeyri-qəti gələcək zaman şəkilçisində «r - z» əvəzlənməsi XIX əsr müəlliflərindən Mirzə Həsən Qarabağlı və Xurşidbanu Natəvanın dilində də işlənmişdir (**32**, 35-38). Professor T.Hacıyev bu faktı Füzuli dövrü dil ənənələrinin təsiri kimi qiymətləndirir (**32**, 38-39). Nümunədəki *«xəlq»* toplu ismindən sonra xəbərin cəmdə işlənməsini də qeyd etmək lazımdır. Bu xüsusiyyət Nişatinin «Şühədanamə»sində və Füzulinin «Hədiqətüs-süəda»sında da özünü göstərir (bax: **56**, 167-168). Qeyd edək ki, «Şühədanamə»də *«bəzi», «məlaikə», «xəlayiq», «el»* sözlərindən sonra gələn xəbərlərin cəmdə işlənməsi, fikrimizcə, bilavasitə hərfi tərcümədən irəli gəlir. Öz kökü ilə ərəb dilinə gedib çıxan bu xüsusiyyət, yəni toplu isimdən sonra xəbərin cəmdə işlənməsində Azərbaycan ziyalılarının, o cümlədən Nişati və A.Bakıxanovun ərəb və fars dillərində təhsil almaları da, təbii ki, müəyyən rol oynamışdır. Maraqlıdır ki, A.Bakıxanov «Kitabi-Əsgəriyyə»də *«xalq»* sözündən sonra gələn xəbəri təkdə işlətmişdir: *«Bir fikir elə ki, sən bu yerə gəlmək*

*üçün əlində bəhanə olsun və xalq bəd güman etməsin»*[*] (**15**, 125). Bununla belə, XIX yüzilliyə aid digər orijinal əsərlərdə də *«xalq»* sözü ilə işlənən feli xəbərlərin cəmdə olmasına dair faktlar vardır (bax: **32**, 38).

«Riyazül-qüds»də yuxarıda nümunə olaraq verdiyimiz nisbətən sadə və anlaşıqlı dillə qələmə alınan hissələr bütövlükdə, götürdükdə çox deyil. Əsər, ümumiyyətlə, çağdaş oxucu üçün qəliz və çətin bir dildə qələmə alınmışdır. Onu da qeyd edək ki, A.Bakıxanov əsərdə mətn arasında ərəbcə ifadələrdən də bol-bol istifadə etmişdir. Mütərcim bəzən həmin ifadələrin türkcəyə tərcüməsini də verir. Məsələn: *«Əlan inkəsərə zührа, yəni imdi belim sındı».* (60a)

XIX əsr Azərbaycan ədəbi dilini araşdıran professor T.Hacıyev bu dövrə aid bəzi əsərlərdə, xüsusilə də nəzmlə yazılan, mətnlərdə ədəbi dilin ümumi mənzərəsi baxımından bir istisnaların, aparıcı meyildən kənara çıxma hallarının müşahidə olunduğunu qeyd edir. Pərakəndə halda görünən bu istisnaları klassik üslubun «qalıq-qəlpələri» adlandıran alim onlar sırasında ayrı-ayrı bəzi leksik vahidləri və bir sıra morfoloji əlamətləri göstərir (**32**, 34-39). «Riyazül-qüds»ün dili üzərindəki müşahidələr göstərir ki, burada da vəziyyət eynilə belədir: əsərdə məhz klassik üslubun, xüsusilə də «Hədiqətüs-süəda»nın təsirinin nəticəsi olan bir sıra türk mənşəli arxaik sözlər və XIX əsr ədəbi dili, eləcə də çağdaş ədəbi dilimiz üçün arxaik sayılan leksik vahidlər və morfoloji əlamətlər vardır.

«Riyazül-qüds»də XIX əsr Azərbaycan ədəbi dili üçün ümumişlək olmayan aşağıdakı leksik vahidləri - türk mənşəli arxaik sözləri qeydə almışıq: *ayıtmaq* (demək, söyləmək), *bən* (mən), *bin* (min), *birlə* (ilə), *cuqə-cuqə* (dəstə-dəstə), *dişrə* (çöl, bayır), *dün* (dünən), *ilətmək* (çatdırmaq), *ilətdürmək* (çatdırmaq), *irmək* (çatmaq, yetişmək), *əglətmək* (oturtmaq), *qanda* (harada),

---

[*] Qafiyəli nəsrin tələbinə görə, eləcə də orijinaldakı yazılışına əsasən bu söz *«etməsün»* olmalıdır.

*qanı* (hanı), *qarangŭ* (qaranlıq), *qarındaş* (qardaş), *kimsənə* (kimsə), *kəndü* (öz), *munca* (bu qədər), *netə kim* (necə ki), *nəstə* (şey), *sürmək* (sürtmək), *şimdi* (indi), *şol* (o), *şöylə* (elə), *urmaq* (vurmaq), *varmaq* (getmək), *yarın* (sabah), *yasavul* (gözətçi, keşikçi), *yavuq* (yaxın) və s. Göründüyü kimi, bu sözlərdən bəziləri fonetik arxaizmlərdir: *bən, bin, qansı.* Məlum olduğu kimi, həmin leksik vahidlərin əvəzində onların digər fonetik variantları XIX əsr ədəbi dili üçün daha səciyyəvi olmuşdur: *«bən»* şəxs əvəzliyi əvəzində *«mən»,* eləcə də *«bin»* sayı əvəzində *«min», «qansı»* sual əvəzliyinin əvəzində isə bu əvəzliyin *«hansı»* fonetik variantı işlənmişdir. Yuxarıda da qeyd etdiyimiz kimi, «Riyazül-qüds»ün özündə də bu qəbildən olan sözlərin paralel olaraq sinonimləri və ya fonetik variantlarına da rast gəlirik. Məsələn: *bən - mən, kimsənə - kimsə, netə kim - necə kim, şimdi - imdi, şol - ol-o, varmaq - getmək.* Yuxarıda qeyd olunmayan *«genə»* zərfi də bu qəbildəndir: əsərdə o həm *«genə»,* həm də *«yenə»* şəklində işlənmişdir. Maraqlıdır ki, yuxarıda göstərilən arxaizmlərdən *«birlə», «kəndi», «urmaq»* leksemləri A.Bakıxanovun müasiri, lakin folklor-danışıq üslubunun görkəmli davamçısı Qasım bəy Zakirin şeirlərində də işlənmişdir (**32**, 47-48). *«Birlə»* qoşmasına X.Natəvanın qəzəllərində də rast gəlirik (**32**, 38). XIX əsrə qədərki Azərbaycan ədəbi dili üçün işlək olan *«ayıtmaq»* felinə gəldikdə isə, bu söz Möhsün Nəsirinin «Lisanüt-teyr» əsərində (XVIII əsr) tez-tez işlənən leksemlərdəndir (**50**, 68, 75, 191, 217 və s.). «Riyazül-qüds»də yuxarıdakı arxaizmlərin işlənməsi, təbii ki, klassik ədəbiyyatın, xüsusilə də Füzulinin (deməli, həm də «Hədiqətüs-süəda»nın) təsirinin nəticəsi kimi dəyərləndirilə bilər. Aydındır ki, bu sözlər XIX əsr Azərbaycan ədəbi dili üçün səciyyəvi olmamış və klassik-kitab üslubunun, xüsusilə də Füzulinin təsiri ilə A.Bakıxanovun leksikonuna daxil olmuşdur.

«Riyazül-qüds»ün dilində ayrı-ayrı arxaik morfoloji əlamətlər də müşahidə olunur. Əsasən feillərə aid olan əski

morfoloji əlamətlər sırasında aşağıdakıları qeyd etmək olar:

1. Qeyri-qəti gələcək zamanın inkarında zaman şəkilçisindəki *(-ar, -ər) r* samitinin *z* samiti ilə əvəzlənməsi ikinci və üçüncü şəxslərdə olduğu kimi birinci şəxsin təkində də özünü göstərir: *«Bən hərgiz Yezidə bey'ət* ***etməzəm*** *və Vəlid hüzurinə dəxi* ***getməzəm****»* (33b). *«****İstəməzəm****, bənimlə onın arasında küdurət vaqe ola»* (39a). *«Səni şəhid edərəm, heç kimsədən pərva* ***qılmazam****»* (65a). Xurşidbanu Natəvanın dilində bu faktı qeyd edən professor T.Hacıyev onu *«Füzuli dövrünün dil ənənəsini sadəcə saxlamaq»* kimi dəyərləndirir (**32**, 38).

2. Nəqli keçmiş zaman şəkilçisi *-ıb, -ib, -ub, -üb* birinci şəxsdə *-əm* şəxs sonluğu qəbul etmişdir: *«****Bən eşidübəm*** *kim,hala səhhətpəzir olmuşdur»* (39a). *«Ol cənabdən filan mövzedə müfariqət* ***qılubəm****»* (43a). Kişvərinin dilində və «Şühədanamə»də qeydə alınmış bu morfoloji əlamətə (bax: **45**, 145) XIX əsr ədəbi dilinə aid araşdırmalarda rast gəlmirik.

3. Felin əmr şəklinin ikinci şəxs cəminin inkarı bir sıra feillərdə *-m+ın, -m+in* şəklində özünü göstərir: *«Xilafi-mə'hud etməklə xiclətzədeyi-ruzi-qiyam* ***olmın****»* (36b). *«Fitnə və iftiraq canibinə müsarəət* ***qılmın****».* (37b)

*«****Demin*** *ki, tijli-cigərtəşnə munca cəng etməz,*
*Əgərçi tifl idi, ol yadigari-Heydər idi».* (57b)

XIV-XVII əsrlərə aid yazılı abidələrin dilində yuxarıdakı morfoloji formanın işləndiyini qeyd edən professor Mirzə Rəhimovun fikrincə, bu morfoloji əlamət iki sait arasında gələn *y* samitinin ixtisara düşməsinin nəticəsi olaraq meydana çıxmışdır, yəni əslində *«deəməyin»* şəklində olan fel *«demin»* şəklində deformasiyaya uğramışdır (**64**, 26-27). Maraqlıdır ki, dilimizin Naxçıvan şivəsində *«gəlmək»* felinin əmr şəklində ikinci şəxsdə inkarı məhz bu şəkildə işlənir: *«gəlmin»* (**72**, 200).

4. Felin əmr şəklinin birinci şəxsin cəminin *-alım, -əlim*

şəkilçisi əsərdə nisbətən geniş təmsil olunmuşdur: *«Dedilər: -Hökmi-əmir yetübdür kim, sizə ərz* ***edəlim****: bey'ət etsəniz, alub* ***hüzurinə gedəlim*** *və əgər rəbqeyi-inqiyaddən rüqəbeyi-təslim çəkər olsanız, sizünlə müqatilə qılalım»* (47b). Bu şəkilçi istər XIII-XVI yüzilliklərə, istərsə də XVIII-XIX əsrlərə aid mətnlərdə işlənmişdir (bax: **45**, 140; **64**, 47-50).

5. Felin əmr şəkli *-gilən* şəkilçisi ilə də təmsil olunmuşdur. Bu şəkilçi, məlum olduğu kimi, ikinci şəxsin təki ilə işlənir: *«izhari-cəzə' ilə mövcibi-şəmatət və əhli-qürur* ***olmagilən****»* (47b). *«Validimin səri-mütəhhərinə müvəkkil olan bihəyayə* ***degilən*** *Əhli-beyt arasından dişrə getsün»* (73b). Bu şəkilçi də yazılı abidələrin dilində geniş yayılmışdır (bax: **45**, 138).

6. Felin əmr şəklinin *-ayım, -əyim* şəkilçisi əsərdə yalnız bir nümunədə işlənmişdir: *«Gördim əmmeyi-mehribanım başım üstə agləşüb derdi: - Ayağa dur, xeymələrə varub* ***görəyim****, bəradəri-bimarun və sayir Əhli-beyti-ətharun başına nə bəlalər gəlmiş»* (66b). Nümunədən göründüyü kimi, burada *-əyim* şəkilçisi birinci şəxsin təkini deyil, cəmini bildirir. Digər mənbələrdə isə bu şəkilçi yalnız birinci şəxsin təkinin morfoloji göstəricisidir (bax: **45**, 140; **64**, 44). Bunu nəzərə alaraq, güman etmək olar ki, *«görəyim»* felindəki *-əyim* şəkilçisi bu morfemin daha qədim forması olan və I şəxsin həm təki, həm də cəmini bildirən *-ayın, -ayin* şəkilçisinin (**64**, 37-38) funksiyasını daşıyır.

7. Felin vacib şəkli məsdərlə *«gərək»* ədatının birləşməsi yolu ilə düzəlmiş formada işlənmişdir: *«Labüd onunla müqatilə etmək* ***gərək****»* (47a). *«Səbr qılmaq* ***gərəksiz*** *kim, bu gecə səlahi-kari mülahizə edəlim»* (34b). *«Hala Məkkə şəhrinə varub ol məkani-feyzbünyandə təvəqqüf etmək* ***gərəksən****»* (35b). Felin vacib şəklinin bu forması orta yüzilliklərə aid yazılı abidələrimizdə geniş yayılmışdır (bax: **45**, 163-165; **64**, 198-204). Maraqlıdır ki,əsərdə *«gərək»* ədatı feil rolunda müstəqil söz kimi də işlənmişdir: *«Bu sözlər bana*

***gərəkməz»*** (47a). Aydındır ki, burada *«gərəkməz»* leksemi *gərək deyil* mənasındadır.

8. Əsasən *«etmək»* köməkçi felinin nümunəsində *-übən* feli bağlama şəkilçisi işlənmişdir: *«Üç nəfər atlu və on səkkiz nəfər piyadə əlaməti-mövt ilə isabəti-həvn* ***edübən*** *Abdullah ibn Bətt əlində cami-şəhadət içdi»* (57b). *«Mənabiri-əhli-islamı xarab* ***edübən*** *[minbər] üzrə çıxub bu növ əqvali-batilə bəyan edərsüz»* (71a). Orta əsrlərə aid yazılı abidələrdə geniş şəkildə təmsil olunan *-ibən, -übən* feli bağlama şəkilçisi (bax: **45**, 171; **20**, l09) XIX əsr müəlliflərindən Natəvanın və Heyran xanımın dilində də işlənmişdir (**45**, 171). Dilimizin Quba, Zaqatala şivəsində bu qədim şəkilçi öz varlığını qoruyub saxlamışdır.

9. Yenə də, əsasən, *«olmaq», «qılmaq»* köməkçi feillərinin nümunəsində *-madın, -mədin* feli bağlama şəkilçisi işlənmişdir: *«Xəbəri-mövti-Müaviyə xəlq içində şaye'* ***olmadın*** *onları daireyi bey'ətə gətür və əba qılan kimsəni qətlə yetür»* (33b). *«Hərbə* ***yetmədin*** *yer üzrə düşüb mürği-ruhi-məqbahi aşiyani-əzabə pərvaz edərdi».* (80a)

*«Büsati-gülşəni-ali-rəsul güllərini*
*Şükuftə* ***qılmadın*** *əfsürdə qıldı badi-xəzan».* (64b)

Nümunələrdən göründüyü kimi, bu feli bağlama şəkilçisi həm nəsrdə, həm də nəzm parçasında işlənmişdir. Professor H.Mirzəzadə *-madın, -mədin* şəkilçisinin «Kitabi-Dədə Qorqud»da və Nəsiminin dilində işləndiyini qeydə almışdır (**45**, 75). Maraqlıdır ki, Füzulinin dilində bu şəkilçi çağdaş ədəbi dilimizdə olduğu kimi, *-madan, -mədən* formasında işlənmişdir (**45**, 175).

10. Daha çox XV-XVI əsrlər üçün səciyyəvi olan *-durur, -dürür* xəbərlik şəkilçisi işlənmişdir:

*«**Kimdürür** aləmdə ol qəmdidə kim yandırmadı,*

*Daği-hicrilən fələk cövri-dili-naşadını».* (61a)

Maraqlıdır ki, A.Bakıxanov Divanındakı bir qəzəlində də *-durur* şəkilçisini ismə qoşaraq işlətmişdir:

*«Gün üzrə ay tüluimi, ya gün kamanıdır,*
*Ya **qaşdurur** bu cümləsi aşiq gümanıdır».* (**15**, 241)

«Riyazül-qüds»ün dilindəki morfoloji əlamətlərlə bağlı daha iki maraqlı faktı qeydə almışıq. Bunlardan biri *-mı, -mi, -mu, -mü* ədatının yeri ilə bağlıdır. Əsərdə bu ədat *«yox»* sözünə qoşularaq həm xəbərlik şəkilçisindən əvvəl, həm də ondan sonra işlənmişdir. Maraqlıdır ki, bu variantların hər ikisi eyni vərəqdədir. *«Aya bu qüruh içün insaf və bu millət içrə bir müsəlman **yokmıdır** kim, bizə yavərliq etsün? Aya bu cəmaət içində bir mömin **yokmıdır** kim, bizim fəryadımıza yetsün? Qit'ə:*

*Bu dəşti-kinədə **yokdurmı** bir mühibbi-Rəsul*
*Ki, olsun itrəti-ətharə munisü qəmxar.*
*Çəkəydi tiği-düsər, aləmi edəydi xərab,*
*Olaydı kaş bu gün zində Heydəri-Kərrar».* (66a)

Əsərdə başqa bir şeir parçasında yenə də *-mı* ədatı xəbərlik şəkilçisindən qabaq işlənmişdir:

*«**Rəvamıdır** kim, ola Əhli-beyti-Peyğəmbər,*
*Hücumi-cövr ilə pamali-zümreyi-kafər».* (47b)

İkinci bir maraqlı fakt isə feillərdə cəm şəkilçisinin işlənməsi ilə bağlıdır. Məlum olduğu kimi, çağdaş ədəbi dilimizdə feillərdə işlənən *-lar, -lər* cəm şəkilçisi felin mürəkkəb şəkillərini düzəldən *idi, imiş* bağlamalarından sonra gəlir. Məsələn: *gəlmişdilər, gəlirmişlər.* «Riyazül-

qüds»də isə orta əsrlərə aid yazılı abidələrdə olduğu kimi cəm şəkilçisi *idi* bağlamasından əvvəl işlənmişdir. Məsələn: *«Sədayi-şivən bülənd edüb bir növ ilə fəğan **başlamışlardı»*** (36a). Seyid Əzim Şirvaninin dilində də bu morfemlərin inversiyasını qeyd edən professor T.Hacıyev onu *«tarixən yüksək üslub faktı»* kimi dəyərləndirir (**32**, 39).

«Riyazül-qüds»ün müəyyən qədər fərqli dil xüsusiyyətləri sırasında *«etmək»* köməkçi feli ilə müqayisədə onun sinonimi olan *«qılmaq»* köməkçi felinin daha çox işlənməsini də qeyd etmək olar. Məlum olduğu kimi, çağdaş ədəbi dilimizdə *«qılmaq»* köməkçi feli yalnız *"namaz qılmaq", "çarə qılmaq"* tərkibi feillərində öz varlığını qoruyub saxlamışdır. «Riyazül-qüds»də isə bu köməkçi feil ərəb mənşəli bir sıra sözlərlə işlənmişdir. Məsələn: *«aşkar qılmaq», «cəzə' qılmaq»* (qəmlənmək, ağlamaq), *«xəyal qılmaq», «əda qılmaq»* (yerinə yetirmək), *«imtidad qılmaq»* (davam etdirmək), *«irsal qılmaq»* (göndərmək), *«qəmxarlıq qılmaq», «kəşf qılmaq», «giryə qılmaq»* (ağlamaq), *«müraciət qılmaq»* (qayıtmaq), *«müşahidə qılmaq», «nalə qılmaq», «nəzər qılmaq», «nəzir qılmaq», «nişanə qılmaq», «seyr qılmaq», «səbr qılmaq», «səfər qılmaq», «tazə qılmaq», «təfəkkür qılmaq», «təsəvvür qılmaq», «təvəccüh qılmaq»* (getmək), *«vida qılmaq», «ziyadət qılmaq»* (artırmaq), *«zövq qılmaq»* və s. Fikrimizcə, bu faktı da klassik-kitab üslubunun qalığı kimi dəyərləndirmək olar.

«Riyazül-qüds»ün sintaksisində, daha doğrusu, bəzi cümlələrin quruluşlarında da müəyyən istisnalar, kənara çıxma halları müşahidə olunur. Bu, əsasən, zərfliyin, xüsusilə də zaman zərfliyinin xəbərdən sonra - cümlənin sonunda işlənməsində özünü göstərir. Məsələn: *«İsa dedi: «Onun qatili kimdir?» Dedi: Yezidi-pəlid kim, vühuşü tüyuri-səhra və mütəvəttini-məlai-əla* və *sakinini-ərzü səma ona lə'nət edərlər,* ***xüsusən əyyami-Aşurada»*** (33a). Göründüyü kimi, sonuncu cümlədəki *«əyyami-Aşurada»* (aşura günləri) zaman zərfliyi *(«xüsusən»* sözü ilə

birlikdə) xəbərdən sonra, cümlənin sonunda işlənmişdir. Qeyd edək ki, cümlənin bu cür quruluşunu orijinalın dilinin - fars dilinin təsirinin nəticəsi kimi dəyərləndirmək lazım gəlir, çünki bu cümlənin qarşılığı «Cəlaül-üyun»da da vardır və eyni quruluşludur: *«İsa qoft: «Koşənde-ye u kist?» Şir qoft ke, Yezid əst ke, vəhşiyan-o-dərəndeqan-həme ura lə'nət mikonənd,* ***xosusən dər əyyam-e Aşura****».* (182b)

A.Bakıxanov bu nümunəni çevirərkən yenə də irəlidə qeyd etdiyimiz kimi, tərcüməyə özündən bir neçə söz artırsa da, onun məzmununu, demək olar ki, dəqiq verməklə yanaşı, eyni zamanda farsca cümlədəki son sözlərin həm sırasını, həm də özlərini olduğu kimi saxlamışdır. Aşağıdakı iki cümlə də bu cür qeyri-adi quruluşludur (müqayisə üçün əvvəlcə onların farsca orijinallarını da veririk):

*«Cəng-e ma ba işan asantər əst əz-cəng ba ləşkər-e bihədd-o-ehsa ke, bə 'd əz-in xahənd aməd».* (210a)

*«Hala bu güruh ilə cəng etmək övladır, minbə'd varid olacaq ləşkəri-bişümar ilə müqatilə qılmaqdan».* (45a)

*«Çequne xahəd bud hal-e şoma, əhl-eXorasan, dər vəğti ke, mədfun sazənd dər-an zəmin parei əz-tən-e məra və beseparənd be-şoma əmanət-e məra və ponhan gərdəd dər-zəmin-e şoma setare-ye mən».* (287b)

*«Ey əhli-Xorasan, necə olacaqdur halınız ol vəqtdə kim, mədfun ola sizün toprağınızda bənim pareyi-tənim və pünhan ola sizin mənzilinizdə bənim sitareyi-rövşənim».* (83b)

Birinci cümlə quruluşuna görə sadədir və burada xəbərlə tamamlığın işlənməsində inversiyaya yol verilmişdir: əvvəl *«övladır» (üstündür,* əslində burada farscasında olduğu kimi *«asandır»* sözü cümlənin mənasına daha uyğun gəlir) xəbəri işlənmiş, sonra isə *«minbə'd varid olacaq ləşkəri-bişümar ilə müqatilə qılmaqdan»* (bundan sonra gələcək saysız-hesabsız qoşunla vuruşmaqdan) tamamlığı gəlmişdir.

Mürəkkəb quruluşlu ikinci cümlədə isə *«necə olacaqdır»,*

*«mədfun ola»* (dəfh ola), *«pünhan ola»* (gizlənə) xəbərləri cümlədəki *«sizin torpağınızda»* və *«sizin mənzilinizdə»* yer zərfliklərindən əvvəl işlənmişdir. Maraqlıdır ki, bu nümunədəki mübtədalar - *«bənim pareyi-tənim»* (bədənimin parçası), *«bənim sitareyi-rövşənim»* (parlaq ulduzum) zərflikdən sonra - ən sonda işlənmişdir. Bu cümlələrin də bu cür quruluşda olmasını yalnız və yalnız farsca orijinalın təsirinin nəticəsi kimi izah etmək mümkündür. Onu da qeyd edək ki, farsca cümlə ilə onun türkcəyə tərcüməsi arasında müəyyən fərqlər də vardır. Birincisi, A.Bakıxanov bu cümlənin *«beseparənd be-şoma əmanət-e məra»* (mənim əmanətimi sizə tapşıralar) hissəsini buraxmışdır. İkincisi isə, farsca mətndəki *«parei əz-tən-e məra»* (bədənimin parçasını) tamamlığının qarşılığı tərcümədə mübtəda rolunda çıxış edir: *«bədənimin parçası».* Üçüncüsü isə farsca mətndəki *«mədfun sazənd»* (dəfn edələr) xəbəri cəmdədir və təsirli feillə ifadə olunduğu halda, onun tərcüməsindəki qarşılığı - *«mədfun ola»* həm təkdədir, həm də təsirsiz feillə ifadə olunmuşdur. Nəhayət, bu fərqlər sırasında hər iki cümlədəki xitabın (*«əhl-eXorasan», «ey əhli-Xorasan»*) yerini də qeyd etmək olar: farsca cümlədə o, birinci xəbərdən sonra, onun türkcəsində isə lap əvvəldə işlənmişdir.

Qeyd edək ki, Füzulinin «Hədiqətüs-süəda»sında da oxşar quruluşlu cümlələrə rast gəlirik. Məsələn, aşağıdakı cümlələrdə zərfliklər xəbərdən sonra, cümlənin sonunda işlənmişdir:

*«Ey Əyyub, bunlar mükərrəmlərdür* ***dünyadə*** *və möhtərəmlərdür* ***üqbadə****».* (**29**, 149)

*«Ey bəradər, filan qızını bu fərzəndümə verəsən* ***və'dəsi irişdükdə****».* (**29**, 156)

*«Nagah xəbəri-vaqiyeyi-Kərbəla yetüb mə'lum oldı ki, ol kəbütərin balı nameyi-əhvali-Kərbəla imiş* ***rövzeyi-Rəsulüllahə****».* (**29**, 286).

Düşünürük ki, burada da cümlələrin bu cür qurulmasında «Hədiqətüs-süəda»nın farsca orijinalının - «Rövzətüş-şühəda»nın

müəyyən təsiri olmuşdur (bax: **54**, 104-105).

«Riyazül-qüds»ün dili obrazlılığı və bədiiliyi, yüksək sənətkarlıq xüsusiyyətləri ilə seçilir ki, bunu da şərtləndirən başlıca amillər sırasında ilk növbədə əsərin adi nəsrlə deyil, **səc'lə** - qafiyəli nəsrlə qələmə alınmasını qeyd etmək lazımdır. Söz incəlikləri ilə bağlı ədəbi sənətlər (bax: **41**, 19-20; **97**, 9-17) sırasında xüsusi çəkisi olan səc' bir çox klassik bədii mətnlərin mühüm və ayrılmaz tərkib hissəsi sayılır. Bilavasitə nəsrlə bağlı olan bu ədəbi sənət növü nəzmdə qafiyənin daşıdığı vəzifəni yerinə yetirir, sözlərin səs tərkibinə görə qafiyələnməsini təmin edir. Bu funksiyasına görə səc' ədəbiyyatşünaslıq termini kimi «*qafiyələnmə*», «*nəsrin qafiyələnməsi*» mənalarında işlənir **(103,** 802). Səc' birinci növbədə sözün bədii-estetik gözəlliyini, emosional təsir gücünü qüvvətləndirməyə xidmət edən bir vasitə, sənət növüdür. Məhz buna görə də nəsrlə qələmə alınan əski türkcə bədii mətnlərin çoxu, o sıradan Füzulinin bütün nəsr əsərləri, divanlarının dibaçələri səc'lə yazılmışdır. Klassik Azərbaycan nəsr nümunələrindən Möhsün Nəsirinin «Lisanüt-teyr»i, S.Ə.Şirvaninin təzkirəsi də qafiyəli nəsrlədir (bax: **54**, 108; **32**, 76-78). A.Bakıxanov da ilk növbədə klassik ədəbiyyat ənənələrinin görkəmli davamçısı kimi bədii nəsr əsərlərini, o sıradan sərbəst-yaradıcı tərcümə nümunəsi olan «Riyazül-qüds»ü səc'lə qələmə alaraq bununla da ilk növbədə fikrin bədii şəkildə ifadəsinə nail olmağa çalışmışdır.

Səc'in əsas əlaməti nəsrlə yazılan mətndəki cümlələrin tərkibində olan sözlərin və ya birləşmələrin ahəngdarlığı, qafiyələnməsidir. Nəsrdə qafiyələnən sözlər cümlənin müxtəlif yerlərində işlənə bilər. Səc' qafiyələnmə sisteminə görə üç növə bölünür:

**1. Ardıcıl səc'.** Bu növ səc' bir qafiyə üzərində qurulur və bir qayda olaraq, cümlələrin və ya birləşmələrin sonunda işlənir (**97**, 9-17). Məsələn:

*«Əlqissə, dört nəfər **ləini-bədayin** kəməri-**kin** qətli-*

*sərvəri-**din** və pişvayi-**möminin** əzminə bağladılar».* (15a)

*«Hər vəqt kim, Mahəmmədü Əli və Fatiməvü Həsən adın **yad edərdi**, kəndüsin damgahi-qəmdən **azad edərdi**».* (31a)

*«Bu günlər biz Əhli-beytə əyyami-hüznü **möhnət** və düşmənlərə ruzi-fərəhü **məsərrətdür**».* (30a)

*«Divani-qəzadən yazılan bərati-müqəddər **pozulmaz** və əhkami-əzəli təqdirinə imkani-təğəyyür **olmaz**».* (41b)

*«Məgər bilməzsən kim, təriqi-həqdə qətl olmaq bizə **adət** və **rütbeyi-şəhadət mövrisi-kəramətdir**».* (70b-71a)

Əsərdəki əksər bab və fəsillərin adları da bu cür qafiyələnir. Məsələn, imam Rza (ə.) haqqında olan onuncu babın ikinci fəslinin adı belədir: *«Əxbari-**şəhadətin** və məratibi-**rif'ətin** səvabi-**ziyarətin** bəyan edər».* (83b)

***2.* Qoşalanmış səc'**. Bu növ səc'də cümlə tərkibindəki qafiyələnmiş sözlərin sayı ən azı ikiyə bərabər olur. Məsələn: *«Axirüləmr **cuqeyi-sitəmkar və firqeyi-kəffar** əlində şəhadətə yetişdi»* (31a). *«Ol kişvər əhlinin əksəri **həvaxahi-dudmani-risalət və dustdari-xanidani-imamətdürlər»*** (35b). *«Həzrəti-Adəm Həvva tələbində ətrafi-aləmi gəzər ikən güzarı... **mövzei-qətli-cigərguşeyi-sərvəri-ənbiyayə və məhəlli-şəha-dəti-nuri-dideyi-məfxəri-övsiyayə** yetdükdə bir daş qədəmi-mübarəkin məcruh edüb qan cari oldı».* (32a)

Göründüyü kimi, birinci nümunədə birləşmə tərkibindəki hər iki söz bir-biri ilə həmqafiyədir. İkinci nümunədə isə üç sözdən ibarət olan birləşmənin son ikisi bir-biri ilə qafiyələnmişdir:; *«dudmani-risalət»* - *«xanidani-imamət».* Üçüncü nümunədəki beş və altı sözdən ibarət olan izafət silsiləsində isə son üç söz qafiyələnmişdir: *«cigərguşeyi-sərvəri-ənbiya»* - *«dideyi-məfxəri-övsiya».* Qeyd edək ki, ikinci birləşmədən sonra gələn *«yetdükdə»* sözü birinciyə də aiddir. Ədəbiyyatşünaslıqda səc'in bu növü **«səc'i-müqəyyəd»** adlanır.

Qoşalanmış səc' «Hədiqətüs-süəda»da daha geniş

təmsil olunmuşdur (bax: **47**, 153; **54**, 110-111).

**3. Çarpaz qafiyəli səc'.** Səc'in bu növündə səc' yaradan sözlər ardıcıl və qoşa-qoşa yox, növbələşmə yolu ilə, yəni çarpaz şəkildə qafiyələnir. Bu cür qafiyələnmə nəsrdə xüsusi bir ahəngdarlıq və ritm yaradır. Məsələn: *«Bir mövci-mütərakim olub az qaldı kim, kəştiyi-amalın* ***sərniguni-bihari-qəm*** *və zövrəqi-vücudin* ***müstəğrəqi-dəryayi-ədəm*** *qıla»* (32a). ***«Ətrafi-güli-rüxsarı*** *səbzeyi-novxizdən* ***arayişəfza*** *və* ***sahəti-gülzari-üzarı*** *cuşi-xətti-mişkindən* ***qaliyasa*** *olmaqda idi».* (60a)

Birinci nümunədə *«sərniguni-bihari-qəm»* və *«müstəğrəqi-dəryayi-ədəm»* səc'ləri, göründüyü kimi, bir-birindən bir qədər aralı düşərək çarpaz qafiyə yaratmışlar. Qeyd edək ki, bu cümlənin sonundakı *qıla* köməkçi feli hər iki birləşməyə aiddir: «səc'i-müqəyyəd»dir. İkinci cümlədə də seçdirilmiş birləşmələr növbələşmə yolu ilə, çarpaz şəkildə qafiyələnmişdir.

Nümunələrdən göründüyü kimi, A.Bakıxanovun səc' sənətində istifadə etdiyi qafiyələri, əsasən, ərəb-fars mənşəli sözlərdən təşkil olunan silsiləli izafət birləşmələrindən ibarətdir. Bəzi hallarda səc' təşkil edən sözlər yaxın mənalı sözlərdən, sinonimlərdən ibarət olur. Məsələn: ***«Nitqi-sərih*** və ***lisani-fəsih*** *ilə ərz etdilər».* (32b)

Bir sıra hallarda səc' yaradan sözlər qafiyə ilə yanaşı, vəznə görə də bir-birinə uyğun gəlir. Bu baxımdan səc' sənəti üç növə bölünür: *səc'i-mütərrəf, səc'i-müvazinə, səc'i-mürəssə* (bax: **41**, 1135-138; **97**, 286; **103,** 802).

**1. Səc'i-mütərrəf.** Səc'in bu növündə səc' yaradan sözlər qafiyə təşkil edir, ancaq vəznə görə bir-birinə uyğun gəlmir. Məsələn: *iz - dəniz, gül - bülbül* və s. «Riyazül-qüds»də aşağıdakı cümlələrdə səc'i-mütərrəf işlənmişdir:

*«Bu gecə qayətdə* ***tərsanəm*** *və nəhayətdə* ***hərasanəm»*** (15b).

*«Rəvayətdir kim, həzrəti-rəsul... rihlətindan sonra bir ləhzə Fatimə şad* ***olmadı*** *və gisuyi-mişkbarından iqdi-məlal*

***açılmadı***». (11a)

*«Ey sədəfi-gövhəri-**zatım** və gülbüni-qönçeyi-**həyatım**, vəqt oldı kim...»* (35b)

Bu nümunələrdəki *«tərsanəm» - «hərasanəm», «olmadı» - «açılmadı», «zatım» - «həyatım»* sözləri qafiyəyə görə uyğun gəlir, vəzn baxımından isə fərqlənirlər - «səc'i-mütərrəf»dirlər.

**2. Səc'i-mütəvazin.** Səc'in bu növündə iki cümlə və ya birləşmədə səc' yaradan sözlər vəzn baxımından bir-birinə uyğun gəlir, qafiyəyə görə isə fərqlənir. Məsələn:

*«Bu ümməti-dunhimmətdən bir güruhi-bədşükuh arasında ləbi-**təşnə** və cigəri-**suxtə** şəhid olursan».* (34b)

*«Hər ayinə **qəlbi**-səlim və **ərzi**-səmim ilə cənabınıza təqdimi-xidmət və şəraiti-ianət qılmaqlarında ehtimali-şəkk yoxdur».* (35b)

*«**Livayi**-nihzət və **rayəti**-nüsrət qaldurub Məkkə canibinə rəvanə oldı».* (36a)

Bu nümunələrdən birincisində işlənmiş *«ləbi-təşnə» və «cigəri-suxtə»* birləşmələrindəki ikinci tərəflər qafiyələnməsə də, vəzn baxımından bir-birinə uyğun gəlir. İkinci nümunədəki *«qəlbi-səlim»* və *«ərzi-səmim»* birləşmələrində isə, əksinə ikinci tərəflər həm vəzncə, həm də qafiyə baxımından uyğun gəlsə də, onların birinci tərəfləri *(«qəlb»* və *«ərz»)* vəzncə eyni, lakin qafiyəcə fərqli sözlərdir. Üçüncü nümunədə işlənmiş *«livayi-nihzət»* və *«rayəti-nüsrət»* birləşmələrində də birinci tərəflər qafiyə baxımından fərqli, vəzncə isə uyğun sözlərdir.

**3. Səc'i-mürəssə.** Səc'in bu növündə sözlər həm qafiyə baxımından, həm də vəznə görə bir-birinə uyğun gəlir. Səc' təşkil edən sözlər arasındakı bu cür uyğunluq və tarazlıq mətndə güclü bir ahəngdarlıq və ritm yaradır. Məsələn:

*«Ey əziz, nə məqamə **getmək** və nə yerdə təvəqqüf **etmək** səlahdur».* (35b)

*«Bu fitnə nairəsin ondan özgə sakin **qılmaz** və bu fəsad dəf'inə ondan qeyri kimsə qadir **olmaz**».* (38a)

*«Andan sonra Abdullah ibn Əli cuqeyi-bədkirdardən qardaşı intiqamın **alub**, çoxların xaki-məzəllətə **salub**, xəl'əti-şəhadət qaməti-canə geydi».* (58b)

Bu nümunələrdəki *«getmək» - «etmək», «qılmaz» - «olmaz», «alub» - «salub»* sözləri həm qafiyəyə, həm də vəznə görə bir-birlərinə tam uyğun gəlir. Göründüyü kimi, A.Bakıxanovun bu cümlələrdə işlətdiyi qafiyələr türk mənşəli sözlərdir. Qeyd edək ki, əsərdə səc' yaradan sözlər sırasında türk mənşəli sözlər azlıq təşkil edir. Şair-mütərcimin əsər boyu qafiyə yerində işlətdiyi sözlərin çoxu ərəb-fars mənşəli sözlərdən ibarətdir. «Hədiqətüs-süəda» əsərində də vəziyyət eynilə belədir (bax: **47**,152-155; **54**, -115; **101**, 591; **103**, 802; **105**, III, 2839 ). Qeyd edək ki, İran ədəbiyyatşünaslığında səc'in bu növü *«səc'i-mütəvazi»* kimi qeyd olunur (**101**, 591; 228; **103**, 802; **105**, III, 839).

A.Bakıxanovun «Riyazül-qüds»də qoşub-düzəltdiyi səc'lər bəzi hallarda bir neçə qafiyə şəklində olur və silsilə təşkil edərək zəncir əmələ gətirir ki, bunun da nəticəsində cümlələr bənzərsiz ahəngdarlıqla, ritmlə səslənir. Məsələn, aşağıdakı cümlədə olduğu kimi: *«...**hüsni-səbahətü rif'əti-qamət** və **fünuni-şücaət*** ilə ***səramədi-əhli-zəman** və **yeganeyi-dövran** olub, mahi-Bəni Haşim deməklə **məşhur** və ol ərseyi-xunxarda **şafei-yövmünnəşur** idi, **daməni-qərar** və **zimami-ixtiyar dəsti-iqtidarından** gedüb **həzrətdən istida'i-rüsxət** qıldı».* (59a)

İmam Hüseynin (ə.) qardaşı Abbas haqqındakı bu cümlədə seçdirilmiş birləşmələr - izafət zəncirləri bir neçə qafiyə şəklində qurularaq bənzərsiz deyim tərzi, şeiriyyət yaradır və onun bədii-estetik təsir gücünü qüvvətləndirir. Maraqlıdır ki, A.Bakıxanovun bu cümlənin əvvəlində işlətdiyi *«rif'əti-qamət»* izafətinin özünün tərkibindəki sözlər də həmqafiyədir. «Riyazül-qüds»dəki bəzi fəsil adları da bu cür silsiləli səc'lər şəklində qurulmuşdur. Məsələn, əsərin beşinci babının yeddinci fəsili belə adlanır: *«Nuri-dideyi-həzrəti-peyğəmbər və xələfüs-sidqi-dudmani-xeyrül-bəşər sərdari-ləşkəri-şühəda cənabi-sul-*

*tani-Kərbəlanın xitteyi-Hicazdan diyari-İraq və mövridi-bidadi-zümreyi-əhli-nifaq olmağın bəyan edər»* (41a).

«Riyazül-qüds»də bəzən bir-birinin ardınca gələn cümlələrdəki son sözlər də səc' yaradır. Səc'in bu növü *«səc'i-məfruq»* adlanır. Əsərdəki aşağıdakı nümunələrdə səc'i-məfruqdan istifadə olunmuşdur:

*«Biri həzrəti-Adəm əleyhissəlam ki, şəbü ruz behişt fəraqın*dan ***nalan*** *idi. Və biri həzrəti-Yə'qub əleyhissəlam kim, fərzəndi-əzizi arzusində* ***sakini-beytül-əhzan****. Və biri həzrəti-Yusif kim, validi-alimiqdarından ayru həmqərini-naləvü* ***əfğan****. Və biri Fatimə əleyhassəlam - peyğəmbər vəfatından sonra ələddəvam şikəstəbalü* ***giryan****. Və biri həzrəti Əli bin əl-Hüseyn əleyhisəlam kim, vaqiyeyi-Kərbəladən sonra yigirmi yıl və bir rəvayətdə qırq yıl* ***əşkəfşan*** *idi»* (11b). Bu nümunədəki cümlələrin sonunda işlənən *«nalan», «əhzan», «əfğan», «giryan»* və *«əşkəfşan»* sözləri səc'i-məfruq yaratmışdır. Yeri gəlmişkən qeyd edək ki, bu cümlə kiçik dəyişikliklə «Hədiqətüs-süəda» əsərində də vardır:

*«Biri Adəm ki, behişt fərağında* ***nalan*** *idi və biri Yə'qub ki, Yusif hicrindən* ***giryan*** *idi, biri Yusif ki, Yə'qub yadilə* ***pərişan*** *idi və biri Fatimeyi-Zəhra ki, həzrəti-Rəsulun atəşi-fərağından* ***büryan*** *idi və biri imam Əliyyi-Zeynəlabidin ki, qırq yıl vaqieyi-Kərbəladən sonra layənqət* ***sirişkəfşan*** *idi»* (**29**, 114-115).

Göründüyü kimi, bu iki nümunədəki cümlələrin sonunda işlənən qafiyələrdən ikisi tam eynidir: *nalan*, *giryan*. Bundan əlavə Füzulinin işlətdiyi *sirişkəfşan* (göz yaşı tökən) sözü ilə «Riyazül-qüds»dəki *əşkəfşan* sözü sinonimlərdir. Bu sözlərin birinci tərəfləri fars mənşəli - *«sirişk»* və *«əşk»* sözləri «göz yaşı» deməkdir.

Bütövlükdə götürdükdə «Riyazül-qüds»ün nəsr dili ilk növbədə ahəngdarlığı və lirizmi, poetikliyi və axıcılığı ilə yadda qalır. Əsərdəki bir çox cümlələr nəzm təsirini bağışlayır, nəzmdən az fərqlənir, eynilə şeir kimi səslənir. Məsələn:

*«Bizim dustlarımız daxili-cəhənnəm* ***olmayalar*** *və bizim*

*düşmənlərimiz daxili-cinanə rüsxət **bulmayalar»**.* (14a)

*«Pərtövi-hüsni-ruyindən mehri-dirəxşanə zəval **irürdi** və tabi-istilayi-ənvari-cəmali mahi-tabanə nöqsan **verürdi»**.* (57b)

*«Ol qandan bir qətrə yerə gəlməyüb daməni-gərduni **dutdı** və ol gündən arizi-üfüqdə hümreyi-şəfəq **artdı»**.* (64a)

Bu nümunələrin hər biri ilk növbədə ahəngdarlığı, axıcılığı, qafiyəliliyi, lirizmi - bir sözlə, şeiriyyəti ilə seçilir. Bu baxımdan ilk növbədə həmin nümunələrin hər birində şeirdə olduğu kimi, sonda qafiyələrin işlənməsi, həm də bu məqamda türk mənşəli sözlərdən istifadə edilməsi diqqəti çəkir. Bundan əlavə, onların hər biri həm də obrazlılığı, bədii xüsusiyyətləri ilə də yadda qalır. Belə ki, bu nümunələrin üçündə də A.Bakıxanov klassik bədii əsərlər üçün səciyyəvi olan məcazlardan və bədii təsvir vəsitələrindən uğurla və bacarıqla istifadə etmişdir. Məsələn, o, birinci nümunədə *«dust»* - *«düşmən»* və *«cəhənnəm»* - *«cinan»* (behişt, cənnət) antonimlərinin köməyilə cümlədə qüvvətli bədii təzad yaratmışdır. A.Bakıxanov burada eyni köklü *«daxil»* və *«düxul»* sözlərini işlətməklə həm də iştiqaq sənətindən istifadə etmişdir (bax: **41,** 21; **97**, 251-258). Burada həm də *«olmayalar», «bulmayalar»* sözlərinin qafiyə yerində işlənməsi də cümlədə xüsusi bir ahəngdarlıq yaradır.

İmam Həsənin oğlu Qasım haqqında deyilmiş ikinci nümunədə A.Bakıxanov bu cavan Kərbəla şəhidinin gözəlliyinin təsvirində mübaliğədən istifadə etmişdir: onun üzünün parıltısından parlaq günəş qərbə doğru gedərək orada gizlənir (batır), gözəlliyinin parlaqlığı nurlu aya nöqsan gətirir. Qeyd edək ki, oxşar məzmunlu mübaliğələr klassik ədəbiyyatda geniş yayılmışdır. Bu nümunədə də *«mehri-dirəxşan»* (parlaq günəş) və *«mahi-taban»* (parlaq ay) birləşmələrindəki ikinci tərəflərin, eləcə də sondakı *«irürdi», «verürdi»* sözlərinin qafiyələnməsi onda ahəngdarlıq yaradan vasitə kimi diqqəti cəlb edir.

İmam Hüseyn (ə.) haqqında olan üçüncü nümunədə isə güclü mübaliğə işlənmişdir. Düşmənin atdığı oxlardan biri

imamın (ə.) alnına, biri isə köksünə sancılır və imam (ə.) onları çəkdikdə bədəninin yaralanmış yerlərindən fışqıran qandan bir damcı belə yerə düşmür, göyə qalxır. Həmin gündən üfüqdəki şəfəqin qırmızılığı artır. A.Bakıxanov burada *«arizi-üfüqdə»* (üfüqün yanağında) birləşməsi ilə həm də metafora (istiarə) sənətindən istifadə etmişdir. Qeyd edək ki, A.Bakıxanov bu cümlədən sonra aşağıdakı şeir parçasını vermişdir:

*Üfüqdə rəngi-şəfəq sanma damənin fələgün,*
*Hüseyni-təşnəcigər qanı eyləmiş gülgün.*
*Büsati-çərxdə xurşid bəlkə şamü səhər*
*Tökər sirişki-əza, bəlkə arizin pürxun.* (64a)

A.Bakıxanov bu misralarda nəsrlə verilən fikri əsərə əlavə etdiyi nəzm parçası ilə daha sənətkarlıqla ifadə etmişdir. Göydə dolanan günəş gecə-gündüz matəm yaşları axıdır və yanağı qanla doludur. Burada da müəllif güclü istiarə yaratmışdır: günəşin göz yaşları axıtması, günəşin yanağını yırtaraq onu qana boyaması metaforadır. Yeri gəlmişkən qeyd edək ki, əsərdəki bir çox şeir parçalarının məzmunu nəsrlə də verilmişdir. Füzulinin «Hədiqətüs-süəda»sında da vəziyyət eynilə belədir. Sadəcə olaraq, nəzmlə ifadə olunan fikirdə bədiilik, obrazlılıq, sənətkarlıq məsələləri daha qabarıq şəkildə özünü göstərir.

A.Bakıxanov «Riyazül-qüds»də nadir hallarda eyni köklü sözləri bir cümlə daxilində işlətməklə **iştiqaq** sənətindən də istifadə etmişdir. Məsələn: *«Aya bənim taətimdə fərzəndini **qətl** etmək sana düşvardır, ya onun nuri-didəsi düşmənlər əlində **məqtul** olmaq?»* (31b). Bu cümlədəki ərəb mənşəli «**qətl**» və «**məqtul**» sözləri eyni köklüdür.

Əsərdə cinas sözlərdən istifadə hallarına da rast gəlirik. Məsələn: *«Ol hümayi-hümayunbal övci-əclalın fərti-hərarətdən dilü ruyində şahinmisal şəbəkeyi-iztirabə düşüb tiği-siyasət*

*niyami-intiqamdən çəküb hər canibə həmlə qılduqda ləşkəri-murü mələx tabi-müqavimət gətürməyüb **hərbindən hərəb edərlərdi».*** (60b)

Bu cümlədəki ərəb mənşəli *«hərb»* (müharibə, savaş) və *«hərəb»* (qaçış, qaçmaq) sözləri hərf sayı baxımından eyni, lakin yazılış və tələffüzcə fərqli sözlərdir (birinci sözün ilk hərfi ح *he,* ikincininki isə ه *ha* hərfidir). Qeyd edək ki, cinasın bu növü *«mütəqarib cinas»* adlanır (bax: **97**, 269-272).

A.Bakıxanov «Riyazül-qüds»də məna incəlikləri ilə bağlı ədəbi sənət növlərindən də (bax: **41,** 19-20; **97**, 9-17) bacarıqla istifadə etmişdir. Mütərcim bu sənət növlərindən ən çox təşbeh, istiarə və mübaliğəyə üstünlük vermişdir. Bütün əsər boyu istər söz incəlikləri, istərsə də məna gözəllikləri ilə bağlı ədəbi sənətlərin müxtəlif növləri ilə, rəngarəng söz naxışları ilə bəzədilmiş bədii parçalara, ayrı-ayrı cümlə və beytlərə rast gəlirik. Nümunə olaraq aşağıdakı bir cümləyə diqqət yetirək:

*«Həzrəti-imam... nərgisi-şəhlasından seylabi-sirişk güli-rüxsarına töküb buyurdı».* (58a)

İmam Hüseyn (ə.) haqqında olan bu cümlədə A.Bakıxanov *«göz»* sözü əvəzində *«nərgisi-şəhla»* ifadəsini işlətməklə metaforanın (istiarənin) imkanlarından uğurla istifadə etmişdir. Bəlli olduğu kimi, klassik ədəbiyyatda göz nərgiz gülünə bənzədilir. Burada isə *«nərgisi-şəhla»* təşbeh yox, metaforadır, çünki *«göz»* sözü işlənməmişdir. Maraqlıdır ki, bu cümlənin farscasında *«nərgisi-şəhla»* birləşməsinin qarşılığı kimi *«didha»* (gözlər) ismi işlənmişdir:

*«Həzrət... cuy-e əşk-e həsrət əz **didha-ye** mobarəkəş cari şod və qoft».* (220b)

*(Həzrətin... mübarək gözlərindən həsrət yaşı arxları axdı və dedi.)*

Göründüyü kimi, «Riyazül-qüds»dəki cümlədə işlənən *«güli-rüxsarına»* (gül kimi qırmızı yanağına) birləşməsinin qarşılığı da farsca mətndə yoxdur, Deməli, bu təşbehi də A.Bakıxanov tərcüməyə özündən artırmışdır. Bu xüsusiyyət,

yuxarıda qeyd etdiyimiz kimi, bütün əsər boyu müşahidə olunur.

Bu qəbildən olan başqa bir nümunəyə diqqət yetirək:

**«Cəlaül-üyun»da:** *«Emam Hoseyn manənd-e* ***oğab*** *aməd və səfhara şekaft və çun* ***şir-e xəşmnak*** *bər-an kaferan-e bibak həmle kərd».* (220b)

*(İmam Hüseyn qartal kimi gəldi, cərgələri yardı və qəzəbli şir kimi o qorxunc kafirlərə hücum etdi.)*

**«Riyazül-qüds»də:** *«...cənabi-sultani-Kərbəla üqabvar ləşkəri-zağü zəğən səflərin pozub, şiri-xəşmnakə bənzər həmlə edüb...»* (58b)

Bu nümunədə imam Hüseyn (ə.) əvvəlcə qartala *(«üqabvar»* - qartal kimi), sonra isə qəzəbli şirə *(«şiri-xəşmnak»)* bənzədilir. Bu bənzətmələrin hər ikisi farsca cümlədə də vardır. «Riyazül-qüds»dəki cümlədə düşmən qoşunu üçün işlənmiş *«ləşkəri-zağü zəğən»* (qarğa-quzğun qoşunu) metaforası isə «Cəlaül-üyun»da yoxdur, deməli, o, mütərcimin əlavəsidir.

«Riyazül-qüds»dəki aşağıdakı cümlədə işlənmiş metafora da «Cəlaül-üyun»da yoxdur, A.Bakıxanova məxsusdur:

**«Cəlaül-üyun»da:** *«Həzrət-emam cuy-e ab əz didha-ye mobarək foru rixt və ru be-caneb-e aseman gərdanid-o-qoft».* (222a)

*(Həzrət imam mübarək gözlərindən su arxı axıdıb, üzünü göyə qaldırıb dedi.)*

**«Riyazül-qüds»də:** *«Həzrəti-imam bərgi-nəsrinə əşki-xunindən rəngi-lalə verüb, ruyi-niyaz səmti-asimanə qaldurub dedi».* (60a)

Göründüyü kimi, A.Bakıxanovun bu nümunədə işlətdiyi *«bərgi-nəsrin»* (nəsrin yarpağı), *«əşki-xunin»* (qanlı göz yaşları) və *«rəngi-lalə»* birləşmələrinin qarşılığı farsca mətndə yoxdur, onlar mütərcimin əlavələridir. Bu birləşmələrdən birincisi - klassik ədəbiyyatda *«ağ üz»* mənasında işlənən *«bərgi-nəsrin»* birləşməsi metaforadır. Sonrakı iki birləşmə ilə A.Bakıxanov burada həm də güclü bənzətmə yaratmışdır: imamın gözlərindən axan qanlı göz yaşları onun nəsrin çiçəyinə bənzər ağ sifətini lalə

rənginə - qırmızıya boyayır.

A.Bakıxanov «Riyazül-qüds»də məcazın və bədii ifadə vasitələrinin digər növlərindən də məharətlə istifadə etmişdir. Maraqlıdır ki, tərcümədə yüksək bədii xüsusiyyətləri ilə seçilən bəzi cümlələrin qarşılıqları farsca mətndə yoxdur. Məsələn, «Riyazül-qüds»ün beşinci babında imam Hüseynin (ə.) böyük oğlu Əli Əkbərin döyüş meydanında susaması haqqında olan aşağıdakı cümlənin qarşılığı «Cəlaül-üyun»da olmadığı üçün o, A.Bakıxanovun özünə məxsusdur:

*«...fərti-ətəşdən dili-pürxun şöleyi-atəş bərabərində mum tək bitab olub... bir növ ilə nairəfruzi-atəşi-kin olmışlardı kim, Hut və Həməl tabeyi-fələkdə biryan və eynül-Səvr ol şiri-bişeyi-şücaət təşnəkamlığın yad edüb giryan olmışdı».* (60b)

Nümunədə Əli Əkbərin qanlı ürəyinin susuzluqdan mum kimi gücsüz-taqətsiz (yumşaq) olması ilə A.Bakıxanov təşbeh yaratmışdır. Burada həm də metafora və güclü mübaliğə işlənmişdir: istidən və düşmənin kin alovundan göydəki bürclər - Hut (Balıq) və Həməl (Qoç) fələyin tavasında bişir, Səvr (Öküz) bürcünün gözü isə şücaət meşəsi aslanının (Əli Əkbərin) susuzluğunu yada salaraq ağlayır.

«Riyazül-qüds»dəki bir çox şeir parçalarında da A.Bakıxanov məcazlardan və bədii təsvir vasitələrindən məharətlə istifadə etmişdir. Məsələn, aşağıdakı şeir parçasında təşbeh, metafora və təzad işlənmişdir:

*Nə tab eyləsin fövci-zağü zəğən*
*Açan dəmdə şəhbaz bali-hünər.*
*Bəli, şir cəngində mə'lumdur*
*Ki, rubah qılmaz xəyali-hünər.* (60a)

İmam Hüseynin (ə.) oğlu Əli Əkbər haqqında olan bu beytlərdən birincisində düşmən qoşunu qarğa-quzğun dəstəsinə, Əli Əkbər isə şahbaza (qartala) bənzədilir. İkinci beytdə isə Əli Əkbər şirə, düşmənlər isə tülküyə bənzədilir.

İmam Həsənin (ə.) oğlu Qasımın şəhid olması ilə bağlı verilən bu şeir parçasında da müəllif metafora və təzaddan istifadə etmişdir:

*Hər dəm səmumi-hadisədən dövri-ruzigar,*
*Bir novgüli füsurdəvü xar eylər, ey dəriğ!*
*Dəşti-bəladə gürgi-əcəl ləhzə-ləhzə ah,*
*Bir müşkbu qəzalı şikar eylər, ey dəriğ!* (58a)

A.Bakıxanov burada gənc yaşında şəhid olan Qasımı təzə gülə bənzədərək onun zəhərli küləklə solmasına heyifsilənir. Müəllifə görə bəla səhrasında hər an əcəl canavarı bir müşk ətirli ceyranı ovlayır.

İmam Hüseyn (ə.) haqqında olan aşağıdakı şeir parçasında isə A.Bakıxanov metafora və güclü mübaliğə yaratmışdır:

*Heyrət rəvişilə ruzigarə,*
*Eylərdi o dəm fələk nəzarə.*
*Ol namivari-büləndcahə*
*Kim, mehri nəzər buraxsa mahə,*
*Keyvandan alıb kəmali-rif'ət,*
*Bercisə verərdi min səadət.*
*Əzmində görüb fütuhi-fərcam,*
*Almazdı əlinə tiğ Bəhram.*
*Ol rəzmə** *nəzər qılanda əflak,*
*Səhmindən olurdu zəhrəsi çak.* (63a)

Nümunənin ilk beytində fələyin heyrətlə dünyaya nəzər salması metaforadır. Üçüncü beytdə imamın Keyvan (Saturn) ulduzundan ucalıq kamalı alması, mifologiyada səadət ulduzu kimi tanınan Bercisə (Müştəriyə) səadət bəxş etməsi mübaliğədir. Dördüncü beytdə isə müəllif həm metaforadan, həm

* A.Bakıxanovun «Seçilmiş əsərləri»ndə: *rəmzə* (**15**, 439).

də mübaliğədən istifadə etmişdir: mifologiyada müharibə kimi tanınan Bəhram (Mars) ulduzu imamın qələbə əzmini görərək əlinə qılınc almır. Nəhayət, sonuncu nümunədə fələyin bu *«rəzm»ə* (döyüşə) nəzər salması və bağrının yarılması ilə müəllif yenə də metafora və mübaliğə işlətmişdir.

«Riyazül-qüds»dəki aşağıdakı şeir parçası da yüksək sənətkarlıq xüsusiyyətləri ilə diqqəti cəlb edir:

*Ol gülüstani-vəfa novgülinə nöqs degil,*
*Bədəni-naziki yüz zəxm ilə gülgün olmaq.*
*Rəsmdir qönçədə ayini-nəzakət görünür,*
*Peykəri parələnüb rəngdə pürxun olmaq.* (61a)

Yenə də Əli Əkbər haqqında olan bu qitədə şair gənc qəhrəmanını vəfa bağında açılmış təzə gülə bənzədir. Şairə görə, qəhrəmanın nazik bədəninin yüz yara ilə gül rənginə boyanması ona nöqsan deyil. Axı qönçənin yarpaqlarını araladıqda onun içi qan rənginə boyanır, qırmızılığı görünür.

«Riyazül-qüds»dəki aşağıdakı qitədə də A.Bakıxanov güclü şairlik istedadı və məharətini göstərərək yüksək sənətkarlıq nümayiş etdirmişdir:

*...Sirişk tökməz əgər aftab sübhü məsa,*
*Üfüq kənarı şəfəqdən nolub ki, gülgündür?*
*Kimün müsibətidir kim, büsati-gülşəndə*
*Bənöfşə qarə geyüb, qönçə bağrı pürxundur?*
*Bu qəmdə lalə giribanə çaklər salmış,*
*Sürudi-naləvü bülbül dəmadəm əfzundur.* (85b)

İmam Rzanın (ə.) vəfatına həsr edilmiş bu şeir parçasında müəllif həm bədii sualdan məharətlə istifadə etmiş, həm də güclü metafora yaratmışdır. Şair öz-özünə sual verir: Əgər günəş gecə-gündüz qanlı göz yaşları tökmürsə, onda nəyə görə üfüqün kənarı gül rəngindədir - qırmızıdır? Gül bağında

bənövşənin qara geyməsi, qönçə bağrının qanla dolması kimin müsibətinə görədir? Sonuncu beytdə isə bu münasibətlə lalənin yaxasını yırtması, bülbülün qəmli oxuması təsvir olunur.

«Riyazül-qüds»ün bədii sənətkarlıq xüsusiyyətləri sırasında eyni sözün yanaşı işlənməsi ilə yaranan leksik təkrarlar (bax: **1**; **25**, 36-41) da diqqəti cəlb edir. A.Bakıxanov bir sıra hallarda fikrini daha dəqiq və ifadəli şəkildə çatdırmaq üçün yanaşı təkrardan istifadə etmişdir. Əsərdəki leksik təkrarların çoxunu ərəb-fars mənşəli sözlər təşkil edir. Məsələn:

***«Allah-allah,*** *Peyğəmbərin halı nə olurdı, əgər meydani-Kərbəladə olub, imam Hüseynin tənhalığın görəydi...»* (9a)

*«Ol cənabı ağuşə çəküb nuri-dideyi-qəmdidəsindən öpüb* ***giryan-giryan*** *dedi».* (34b)

*«Xəlayiq* ***cuqə-cuqə*** *və* ***güruh-güruh****... gülbangına ləbbeyk deyüb Hani mənzilində cəm' oldılar».* (39b)

*«Üqabi-bərqşitab ol şükufeyi-nihali-əclalı ləşkəri-əşrar içrə aparub, zəxmi-şəmşir ilə peykəri-nazpərvərin güli-sirabə bənzər* ***çak-çak*** *etdilər».* (61a)

*«Halına bəs ki ağladı qan zəxmi-tirü tiğ,*
***Gül-gül*** *boyandı sahəti-meydani-Kərbəla»* (65b) və s.

Qeyd edək ki, A.Bakıxanovun işlətdiyi bu leksik təkrarlardan yalnız birinin - üçüncü nümunədəki *«çak-çak»* (parça-parça) sözünün qarşılığı «Cəlaül-üyun»da da vardır: *«pare-pare»* (222a). Maraqlıdır ki, birinci nümunədəki *«Allah-allah»* leksik təkrarını Füzuli də işlətmişdir: *«Allah-allah nə xoş münasibdür bu vəsiyyət aŋa ki, həzrəti-sultani-Kərbəla imam Zeynəlabidinə vəsiyyət qıldı...»* (**29**, 50). A.Bakıxanov əsərin digər yerlərində də bu leksik təkrara tez-tez üz tutmuşdur. Filologiya elmləri doktoru **Şəfəq Əlibəyli** Füzulinin fars Divanında da bu leksik təkrarın çox işləndiyini, hətta Divanın Allah adının təkrarı ilə başlandığını qeyd edir (**25**, 36-37)

Onu da əlavə edək ki, üçüncü nümunədə işlənən

*«cuqə-cuqə»* (dəstə-dəstə) sözü türk mənşəlidir və bir sıra farsdilli və türkdilli əski mətnlərdə işlənmişdir.

A.Bakıxanov «Riyazül-qüds»də təkrardan qaçmaq və ifadə rəngarəngliyi yaratmaq üçün sinonimlərdən də istifadə etmişdir. Məsələn: *«Onun züriyyəsin* ***əziz dutarsan,*** *ya kəndü övladını? Ərz etdi: Onları ziyadə* ***sevərəm****»* (31b). Bu nümunədə işlənən *«əziz dutarsan»* tərkibi feli də *«sevmək»* mənasındadır və əsərdə çox işlənən leksik vahidlərdən biridir.

«Riyazül-qüds»ün dil-üslub və bədii xüsusiyyətlərinə yekun olaraq onu da qeyd edək ki, əsər bu baxımdan olduqca zəngin material verir və kiçik bir bölmədə onların hamısı haqqında geniş söz açmaq imkan xaricindədir. «Riyazül-qüds» xüsusilə də bədiyyat baxımından mükəmməl bir sənət əsəridir və bu yöndə ayrıca bir araşdırma mövzusu ola bilər.

# NƏTİCƏ

Azərbaycan ədəbiyyatı tarixində Kərbəla vaqiəsi mövzusunda ana dilimizdə qələmə alınan ilk məqtəl kitabı nümunələri XVI yüzillikdə yaranmışdır. Bunlar Nişatinin «Şühədanamə» və Füzulinin «Hədiqətüs-süəda» adlı irihəcmli nəsr əsərləridir. Hər iki əsər klassik tərcümə nümunəsidir: onlardan birincisi, əsasən, hərfi tərcümə nümunəsi, ikincisi isə sərbəst-yaradıcı tərcümədir.

XIX yüzillikdə Kərbəla vaqiəsi mövzusuna müraciət çoxalır ki, bunun da başlıca səbəbi yerli əhali arasında yaranan ümumi bir məyusluq və kədər üzündən bu mövzuya olan maraq və tələbatın artması ilə bağlıdır. Bu dövrün ən məşhur və uğurlu məqtəl nümunələrindən biri tanınmış alim, maarifçi şair və yazıçı, ensiklopedik zəka sahibi Abbasqulu ağa Bakıxanovun ana dilində qələmə aldığı «Riyazül-qüds» adlı nəsr əsəridir. «Riyazül-qüds» haqqında Azərbaycan ədəbiyyatşünaslığında indiyədək verilən qısa məlumatlarda o, A.Bakıxanovun orijinal əsəri kimi təqdim olunmuşdur. Əsərin diqqətlə öyrənilməsi isə tam əminliklə belə bir nəticəyə gəlməyə əsas verir ki, A.Bakıxanovun bu məqtəl kitabı klassik tərcümə nümunəsidir - Füzulinin «Hədiqətüs-süəda»sı kimi sərbəst-yaradıcı tərcümədir. A.Bakıxanovun özünün yazdığı kimi, o, «Riyazül-qüds»ü XVII yüzilliyin nüfuzlu ilahiyyatçı alimi, yazıçısı Məhəmməd Bağır Məclisinin «Cəlaül-üyun» kitabından müəyyən hissələri seçmə yolu ilə müxtəsər şəkildə tərcümə etmişdir. Bunu hər

iki əsərin mətnləri üzərində apardığımız müqayisəli təhlil də birmənalı şəkildə təsdiqləyir.

Orta yüzilliklərdə Azərbaycan ədəbiyyatında geniş yayılan bədii tərcümə sənətinə, xüsusilə də onun sərbəst tərcümə növünə xas olan bütün səciyyəvi cəhətlər, seçkin xüsusiyyətlər «Riyazül-qüds»də tam incəliyi ilə öz əksini tapmışdır. Bu xüsusiyyətlər sırasında mütərcimin «Cəlaül-üyun»u tam şəkildə deyil, öz zövqünə uyğun olaraq, əsərdəki ayrı-ayrı hissələri ixtisarla ana dilinə çevirməsini, tərcümənin mətninə yeri gəldikcə digər yazılı qaynaqlardan aldığı məlumatları artırmasını və ən başlıcası, əsasən, öz qələminin məhsulu olan lirik şeir parçalarını (bunların çoxu şairin doğma ana dilindədir) ora daxil etməsidir. A.Bakıxanovun bu tərcümə əsərinə müstəqil ad verməsi - «Riyazül-qüds» adlandırması da bilavasitə klassik tərcümə ənənələri ilə bağlıdır.

«Riyazül-qüds»də bütün əsər boyu dahi Füzulinin bədii nəsr yaradıcılığının zirvəsi sayılan «Hədiqətüs-süəda» əsərinin də güclü təsiri duyulur. A.Bakıxanov «Riyazül-qüds» üçün başlıca qaynaq olaraq «Cəlaül-üyun»u seçməsinə baxmayaraq, əsərinin forma və bədii quruluşu məsələsində «Hədiqətüs-süəda»ya üstünlük vermişdir. İstedadlı mütərcim A.Bakıxanov «Riyazül-qüds»ü eynilə «Hədiqətüs-süəda» kimi nəsrlə nəzmin növbələşməsi şəklində qurmuşdur. «Riyazül-qüds»ü «Hədiqətüs-süəda» ilə bağlayan daha bir mühüm amil onun da Füzulinin bu əsəri kimi qafiyəli nəsrlə - səc'lə qələmə alınmasıdır.

«Riyazül-qüds»də Füzuli «Hədiqətüs-süəda»sının təsiri əsərin dil-üslub xüsusiyyətlərində də qabarıq şəkildə özünü göstərir. A.Bakıxanovun «Riyazül-qüds»ü də Füzulinin «Hədiqətüs-süəda»sı kimi yüksək üslubda - klassik-kitab üslubunda qələmə alınmışdır və bu üslubun əsas səciyyəvi əlamətlərini özündə əks etdirir. Mütərcimin əsərdə istifadə etdiyi bir sıra obrazlı ifadələr, eləcə də cümlələrinin quruluşu, bəzi morfoloji

əlamətlər məhz klassik-kitab üslubunun təsvrinin nəticəsi kimi dəyərləndirilə bilər.

«Riyazül-qüds»ün istər leksikasında, istərsə də morfoloji-sintaktik xüsusiyyətlərində klassik-kitab üslubunun, xüsusilə də bu üslubun ən parlaq nümunəsi olan Füzuli «Hədiqətüs-süəda»sının bir sıra səciyyəvi əlamətləri öz əksini tapmışdır. Əsərin dilindəki bəzi arxaik leksik vahidlər, eləcə də əski morfoloji əlamətlər və sintaktik qəliblər bunu əyani şəkildə sübut edir.

«Riyazül-qüds»ün dili yüksək obrazlılığı, sənətkarlıq xüsusiyyətləri ilə seçilir. A.Bakıxanov əsərdə klassik bədii nəsr nümunələri üçün səciyyəvi olan səc′ sənətinin bütün incəliklərindən məharətlə istifadə edərək dəyərli bir sənət əsəri ortaya qoymuşdur. Əsərin dili ahəngdarlığı və axıcılığı, bədiiliyi və şeiriyyəti - bir sözlə, klassik poeziya ruhunu özündə yaşatması, əyani şəkildə canlandırması ilə də əlamətdardır.

Məlum olduğu kimi, A.Bakıxanov 1820-ci ildən başlayaraq uzun bir müddət ərzində Tiflisdə yaşayaraq həyatının bu taleyüklü dönəmində bədii tərcümə ilə də məşğul olmuş və məşhur rus təmsilçisi İvan Krılovun «Eşşək və bülbül» təmsilini dilimizə çevirmişdir. Bu fakt isə A.Bakıxanovun bədii tərcümə sənətinə böyük önəm verdiyini və bu sahədəki ilk təcrübəsi olan «Riyazül-qüds»ün ötəri səciyyə daşımadığını sübut edir.

Bütün bunlar Azərbaycan ədəbiyyatında varislik məsələsinin dərin köklər üzərində qurulduğunu, bir sıra klassik ənənələrin XIX yüzillikdə də yaşandığını və uğurla davam etdirildiyini açıq-aşkar şəkildə sübut edir.

# ƏDƏBİYYAT


1. *Adilov M.M.* Azərbaycan dilində sintaktik təkrarlar. Bakı, 1974.

2. *Adilov M.M.* Azərbaycan paleoqrafiyası və tarixi orfoqrafiya məsələləri. Bakı, 2002.

3. *Adilov M.M.* Türk mətninin transfoneliterasiya problemləri. Bakı, 2003.

4. *Axundov A.* Azərbaycan dilinin tarixi fonetikası. Bakı, 1973.

5. *Axundov A.* Azərbaycan dilinin fonetikası. Bakı, 1984.

6. *Axundov M.F.* Aldanmış kəvakib. Bakı, 1977.

7. *Axundov M.F.* Əsərləri, III cild, Bakı, 1988.

8. *Araslı N.* Nizami və türk ədəbiyyatı. Bakı, 1980.

9. *Araslı N.* Nizaminin poetikası. Bakı, 2004.

10. *Azadə R.* Füzulinin «Leyli və Məcnun» poemasının ideya və bədii xüsusiyyətləri haqqında // «Məhəmməd Füzuli» (elmi-tədqiqi məqalələr). Bakı, 1958.

11. Azərbaycan ədəbiyyatı tarixi, II cild. Bakı, 1960.

12. Azərbaycan ədəbiyyatı tarixi. IV cild. Bakı, 2011.

13. *Babaşahoğlu Ə.* Məqtəl janrında katarsis mərhələsi // «Çıraq» jurnalı, 1999, № 3, s. 6-13.

14. *Bakıxanov A.* Riyazül-qüds, əlyazması. Azərbaycan MEA M.Füzuli adına Əlyazmalar İnstitutu, D-140.

15. *Bakıxanov A.* Seçilmiş əsərləri (tərtib və fars dilindən tərcümə: *M.Sultanov).* Bakı, 1984.

16. *Cəfərov N.* Azərbaycanşünaslığa giriş. Bakı, 2002.

17. *Cəmşidov Ş.* Şirvaninin tərcümələri haqqında // «Azərbaycan EA-nın Xəbərləri» (ədəbiyyat, dil və incəsənət ser.), 1970, № 3.

18. *Cümşüdoğlu N.* Füzulinin sənət və mərifət dünyası. Bakı-Tehran, 1997.

19. *Dəmirçizadə Ə.* Ədəbi dilimizin inkişafında Füzuli mərhələsi //«Məhəmməd Füzuli», elmi-tədqiqi məqalələr. Bakı, 1958, s.26-59.

20. *Dəmirçizadə Ə.* «Kitabi-Dədə Qorqud» dastanlarının dili. Bakı, 1959.

21. *Dəmirçizadə Ə.* Azərbaycan ədəbi dilinin tarixi, I hissə. Bakı, 1979.

22. *Dövlətabadi Ə.* Qafqazın farsca yazan şairləri (çap yeri və ili göstərilməyib).

23. *Əfəndiyev H.* Azərbaycan bədii nəsrinin tarixindən. Bakı, 1963.

24. *Əhdi Bağdadi.* Cülşəni-şüəra, əlyazmanın fotosurəti, Azərbaycan MEA M.Füzuli adına Əlyazmalar İnstitutu, FS-75.

25. *Əlibəyli Ş.* Füzulinin fars divanında yanaşı təkrar // «Azərbaycan EA-nın Xəbərləri» (ədəbiyyat, dil və incəsənət ser.), № 3-4, Bakı, 2001,s.36-41.

26. *Əliyev S.* Füzuli (nəzəri-ədəbi düşüncələri). Bakı, 1996.

27. *Əlizadə S.* Orta əsrlərdə Azərbaycan yazı dili. Bakı, 1985.

28. *Füzuli M.* Hədiqətüs-süəda (çapa hazırlayan: Həsən Məcidzadə Savalan), Qum, 1374 (ərəb əlifbasında).

29. *Füzuli M.* Hədiqətüs-süəda (tərtib edənlər: *Ə.Səfərli, M.Nağısoylu, N.Göyüşov).* Bakı, 1993.

30. *Füzuli.* Əsərləri, 6 cilddə, VI c. (tərtib edəni: *H.Məmmədzadə).* Bakı, 1996.

31. *Füzuli M.* Leyli və Məcnun (tərtib edəni: *H.Araslı).* Bakı, 1993.

32. *Hacıyev T.* Azərbaycan ədəbi dili tarixi (II hissə). Bakı,

1987.
33. *Hacıyev T.* XIII-XVI əsrlər ədəbi dili // «Azərbaycan ədəbi dili tarixi». Bakı, 1991, s.48-87.
34. *Heyət C.* Azərbaycan ədəbiyyatına bir baxış. Bakı, 1993.
35. Kitabi-Dədə Qorqud (tərtib edənlər: *F.Zeynalov, S.Əlizadə*).Bakı, 1988.
36. *Köçərli F.* Azərbaycan ədəbiyyatı, I-II cildlər (tərtib edəni: *R.Qənbər qızı).* Bakı, 1978.
37. *Qasımzadə F.* Abbasqulu ağa Bakıxanov Qüdsi. Bakı, 1956.
38. *Qasımzadə F.* XIX əsr Azərbaycan ədəbiyyatı. Bakı, 1975.
39. *Qəhrəmanov C.* Əsrarnamə (əlyazmasının fotofaksimilesi, sözlük və izahatı). Bakı, 1964.
40. *Qəhrəmanov C.* Nəsimi «Divan»ının leksikası. Bakı, 1970.
41. *Quliyeva M.* Klassik Şərq bəlağəti və Azərbaycan ədəbiyyatı. Bakı, 1999.
42. Qur'an (ərəb dilindən tərcümə edənlər: Z.Bünyadov və V.Məmmədəliyev). Bakı, 1992.
43. *Mir Cəlal.* Füzuli sənətkarlığı. Bakı, 1994.
44. *Mir Cəlal, Pənah Xəlilov.* Ədəbiyyatşünaslığın əsasları. Bakı, 1988.
45. *Mirzəzadə H.* Azərbaycan dilinin tarixi qrammatikası. Bakı, 1990.
46. *Mirzəyev A.* Cami, Nəvai və Füzuli yaradıcılığında 40 hədis. Bakı, 1997.
47. *Mirzəyev A.* Füzulinin «Hədiqətüs-süəda» əsəri orta əsrlər tərcümə abidəsi kimi. Bakı, 2001.
48. *Məhərrəmov T.* Əmir Xosrov Dəhləvinin «Məcnun və Leyli» poeması. Bakı, 1970.
49. *Məhərrəmova R., Cahangirov M.* Azərbaycan dilinin tarixi sintaksisinə dair materiallar. Bakı, 1962.

50. *Möhsün Nəsiri.* Lisanüt-teyr (Quşların dili). Çapa hazırlayanlar: *M.Nağısoylu, S.Bayramlı.* Bakı, 2001.

51. *Musayeva A.* «Məsnəvi» və Rövşəni. // - «Əlyazmalar xəzinəsində», Vc. Bakı, 1983.

52. *Musayeva A.* Əlyazma kitabı və XV-XVI əsrlər Azərbaycan ədəbiyyatı: problemlər, araşdırmalar (tekstoloji-filoloji tədqiqat). Bakı, 2002.

53. *Musayeva A.* Dədə Ömər Rövşəni əlyazmaları üzərində araşdırmalar, I c., Bakı, 2003.

54. *Nağısoylu M.* Füzulinin «Hədiqətüs-süəda» əsəri. Bakı, 2002.

55. *Nağısoylu M.* Orta əsrlərdə Azərbaycanda tərcümə sənəti. Bakı, 2000.

56. *Nağısoylu M.* XVI əsr Azərbaycan tərcümə abidəsi «Şühədanamə». Bakı, 2003.

57. *Nağısoylu M.* Şirazinin «Gülşəni-raz» tərcüməsi. Bakı, 2004.

58. *Nağısoylu M.* Əhmədinin «Əsrarnamə» tərcüməsi. Bakı, 2005.

59. *Nağısoylu M.* Abbasqulu ağa Bakıxanovun «Riyazül-qüds» əsəri orijinaldır, yoxsa tərcümə? // «Mütərcim» jurnalı, № l-2, Bakı, 2003, s.95-98.

60. *Nağısoylu M.* A.Bakıxanovun «Riyazül-qüds» əsəri orijinaldırmı? // «Naxçıvan Dövlət Universitetinin elmi əsərləri», № 13, 2004, s.17-21.

61. *Nağısoylu M.* A.Bakıxanovun «Riyazül-qüds» əsəri haqqında bəzi qeydlər. // - «Azərbaycan MEA Xəbərləri» (humanitar elmlər seriyası), № 22, 2004, s.136-143.

62. *Nəbiyev B.* Müsibətnamənin kamilliyi («Hədiqətüs-süəda»). - «B.Nəbiyev. Çətin yollarda», Bakı, 2000.

63. *Nəhmətova K.* Abbasqulu ağa Bakıxanovun «Kitabi-Əsgəriyyə» hekayəsi. Bakı, "Elm və təhsil", 2013.

64. *Rəhimov M.* Azərbaycan dilində fel şəkillərinin formalaşması tarixi. Bakı, 1965.

65. *Rəsulzadə M.Ə.* Azərbaycan şairi Nizami Gəncəvi. Bakı,1991.

66. *Səfərli* Ə. Azərbaycan dini-bədii və satirik nəsrinin banisi. // Məhəmməd Füzuli-500». Bakı, BDU nəşriyyatı, 2000, s.3-64.

67. *Sultanov M.* Müqəddimə // «Abbasquluağa Bakıxanov. Seçilmiş əsərləri». Bakı, 1984.

68. *Sultanov M.* Füzulinin «Hədiqətüs-süəda» əsəri // «Azərbaycan» jurnah, № 27, 1958, s.182-190.

69. *Sultanov M.* Azərbaycan və İran ədəbi əlaqələri tarixindən (Əttar Nişaburi və Əhmədi Təbrizi) // «M.Sultanov. Azərbaycan əlyazmaları məsələri». Bakı, 2000, s.68-89.

70. *Tərbiyət M.* Danişməndani-Azərbaycan. Bakı, 1987.

71. *Şərifli K.* Mətnşünaslığın əsasları. Bakı, 2003.

72. *Şirəliyev M.* Azərbaycan dialektologiyasının əsasları. Bakı, 1968.

73. «Şühədanamə» əlyazması, Azərbaycan MEA, M.Füzuli adına Əlyazmalar İnstitutu, M-259.

74. *Алиев Р.М.* Іредисловие // «Са'ди. Гулистан». М., 1959.

75. *Алиев Г.Ю.* Темы и сюжеты Низами в литературах народов Востока. М., 1985.

76. *Бакиханов А.К.* Гюлистан-и Ирам. Редакция, комментарии, примечания и указатели академика А Н Аз. ССР З.М.Буниятова. Баку, «Элм», 1991.

77. *Ахмедов Э.М.* А.-К.Бакиханов: эпоха, жизнь, деятельность. Баку, «Элм», 1989.

78. *Гасымов А.* Палеографические и орфографические особенности рукописей произведения М.Физули «Хадикатус-суада». АКД, Баку, 1976.

79. *Демирчизаде А.* Сравнительный метод М.Кашгари // «Советская тюркология», 1972, № l.

80. *Иванов С.* Поема Алишера Навое «Язык птиц» // «Мастерства перовода», т.Х, М., 1975.

81. Каталог персидских рукописей, т.II (составители Н.Геюшов, Г.Наджафов). Баку, 2000.
82. *Копанев П.И.* Вопросы истории и теории художественного перевода. Минск, 1972.
83. *Кязимов М.Д.* Последователи Низами. Баку, 1991.
84. *Лихачев Д.С.* Текстология на материале русской литературы X-XVIII вв. М.-Л., 1962.
85. *Наджип Э.Н.* Тюркоязычный памятник XIV в. «Гулистан», Сайфа Сараи и его язык, ч.I-II . Алма-Ата, 1975.
86. *Наджип Э.Н.* Исследования по истории тюркских языков XIV века. М., 1979.
87. *Радлов В.В.* Опыт словаря тюркских наречий, I-IV т. Спб, 1888-1911.
88. *Стори Ч.* Персидская литература, I-III. М., 1972.
89. *Федоров А.В.* Введение в теорию перевода. М., 1953.
90. *Шарифов Дж.* Из истории перевода в Узбекистане. АДД, Ташкент, 1968.
91. *Şaripov J.* Uzbekistonda tarjima torixidan. Toşkent, 1966. Özbək dilində.

Türk dilində

92. *Ergin M.* Dede Korkut kitabı, I c., giriş, metin, faksimile. Ankara, 1958, II c., s.zlük, Ankara, 1963.
93. *Fuzuli.* Hadikatü's-süeda. D-r Şeyma Güngör yayınlaması, Ankara, 1987.
94. *Güngör Ş.* Giriş. - «Fuzuli. «Hadikatü's-süeda» (D-r Şeyma Güngör yayınlaması), Ankara, 1987, s.XV-LXXIII.
95. *Karahan A.* Anadolu türk edebiyatında «Maktel-i Hüseynler». Edebiyat Fakültesi Türkoloji Disiplini. Mezuniyet travayı. İstanbul, 1938,1939.
96. *Karahan A.* İslam-Türk edebiyatında kırk hadis. İstanbul, 1954.

97. *Külekçi N.* Edebi sanatlar. Ankara, Akçağ, 1995.
98. *Levend A.S.* Türk edebiyatı tarihi, I. Ankara, 1984.
99. *Türkiye Diyanet Vakfı* İslam Ansiklopedisi, cilt 4. İstanbul, 1991.
100. XIII asırdan günümüze kadar kitablardan toplanmış tanıklarıyle Tarama sözlüğü, I-IV c. Ankara, 1941-1945.

Fars dilində

101. حسین عمید. فر هنگ عمید، تهران، ۱۳۵۲
102. علی اکبر د هخدا. لغت نامه، تهران، ۱۳۲۷
103. فر هنگ نامه اد بی فارسی ، تهران ، ۱۳۷۲
104. محمد باقر مجلسی . جلا ء العیون ، نسخه خطی C-718 انستیتوی نسخه های خطی فر هنگستان ملی علوم جمهوری آذربایجان ،
105. محمد معین فر هنگ فارسی جلد .. ٦-١ ، تهران ، ۱۳۵۲
106. مصطفی قلی زاده. دعبل خزانی شاعردار بردوش ، قم ، ۱۳٦۰
107. میرزا محمد علی مدرس تبریزی. ریحانة الادب تهران ۱۳۹٦
108. نظامی گنجوی. خسر و و شیرین ، متن علمی وانتقادی (ترتیب دهنده ختاگوروف ) ، باکو، ۱۹۸۰

*Мохсун Нагисойлу*

## СОЧИНЕНИЕ «РИЙАЗ АЛ-КУДС» АББАС-КУЛИ-АГА БАКИХАНОВА

### *Резюме*

Прозаическое произведение «Рийаз ал-кудс» («Райские сады») Аббас-Кули-ага Бакиханова (1794-1846) –видного азербайджанского поэта-писателя и ученого впервые в данной работе становится обьектом специального монографического исследования.

**В первой главе** монография излагаются вопросы, связанные с возникновением книг «мегтел», в арабской, персидской и тюркской литературах, к числу которых осносится и «Рийаз ал-кудс». На основе единственной рукописи сочинения анализируются тема, содержание произведения, причины его возникновения и источники.

**Вторая глава** посвящена справнительному со-поставительному анализу «Рийаз ал-кудс» с его персидском источником «Джала ал-уйун» («Блеск очей») Меджлиси. На основе тщательного анализа впервые установливается, что «Рийаз ал-кудс» явлается сок-ращенным и вольным переводом «Джала ал-уйун» на азербайджанско-тюркский язык, что и подтверждаются заметками самого А.Бакиханова. Здесь же рассмар-

триваются сходные и отличительные особенности между этими двумя сочинениями. «Рийаз ал-кудс» по всем параметрам относится к числу классических переводных сочинений.

**Третья глава** состоит из двух частей. В первой части рассмартриваются общие четры «Рийаз ал-кудс» и переводного произведения «Хадикат ас-суада» («Сад счастливых») Мухаммеда Физули, аналогичного содержания. Устанавливаются, что форма и структура «Рийаз ал-кудс» идентичны с «Хадикат ас-суада». Во второй части главы исследуются языково-стилистические особенности и вопросы поэтики «Рийаз ал-кудс».

***Mohsun Naqisoylu***

## THE PROSE WORK «RİYAZ AL-KUDS» BY ABBAS-KULİ-AGA BAKIKHANOV

The prose work «Riyaz al-kuds» («The gardens of Paradise») by A.Bakikhanov (1794-1846) becomes an object of spesial monographic research for the first time in this work.

The **first chapter** deals with the issuses connected with the origin of the book «meqtel» in arabic, persian and turkic literatures which inelude «Riyaz al-kuds» as well. The theme, the content of the work, the reasons of its appearance and sources are only manuscript of the book.

The **second chapter** is about comparative analysis of «Riyaz al-kuds» with its persian source «Djala al-uyun» («Shine of eyes») by Mejlisi. On the basis of thorough analysis for the first time it has been identifided that «Riyaz al-kuds» is the brief and free translation of «Djala al-uyun» into azerbaijani which was also confirmed by A.Bakikhanov's notes. Similar and different pecularities between these poems are also considered here. From all points of views «Riyazul-quds» is a classical translation work.

The **third chapter** consists of 2 parts. The first part deals with general features of «Riyaz al-kuds» and translation work «Khadigat as-suada» («The garden of happy ones») Muhammed by Fizuli, with has analogical content. It has been determined that the form and structure of «Riyaz al-kuds» is idendcal with the ones

of «Khadigat as-suada». The second part of the chapter investigates lingwistic-stulistic pecularities and issues of poetic of «Riyaz al-kuds».

# ƏLAVƏLƏR

**Əlavə 1**. «Riyazül-qüds»ün əlyazmasının ilk vərəqi (1b)

**Əlavə 3.** «Riyazül-qüds»ün əlyazmasında əsərin adı və tamamlanma tarixinin qeyd olunduğu vərəq (8a)

**Əlavə 4.** «Riyazül-qüds»ün əlyazmasının son vərəqi (91a)